**Azərbaycan Respublikası**
**Bakı İslam Universiteti**

Kitabın adı:
**İSLAM TARİXİ - I**
(Əsri-Səadət Dövrü)

Müəllif:
**Abbas QURBANOV**
İlahiyyat elmləri namizədi

Bədii Redaktor:
**Ramazan QORADAYEV**

Məsləhətçi:
**BİU-nun Zaqatala şöbəsinin müdiri**
**İbrahim İBRAHİMOV**

Dizayn:
**Sərxan İSGƏNDƏROV**

Bu kitab Bakı İslam Universitetinin Zaqatala şöbəsi üzrə Pedaqoji Şuranın 10 fevral 2009 il tarixli IV iclasının 5 saylı qərarı ilə çap edilmişdir.

**Ünvan:**
Zaqatala şəh. H. Əliyev prospekti №88/A
İndeks: AZ 6200

Tel: 050 302 90 08
abbasqurbanov@gmail.com
Dərs kitabları - 13

**Bakı - 2009**

## MÜNDƏRİCAT

**ÜÇÜNCÜ FƏSİL**

**HƏZRƏTİ MƏHƏMMƏDİN (s.ə.s) NÜBÜVVƏTƏ QƏDƏRKİ DÖVRÜ**

## DÖRDÜNCÜ FƏSİL
## HƏZRƏTİ MƏHƏMMƏDİN PEYĞƏMBƏRLİYİ
## MƏKKƏ DÖVRÜ

**BEŞİNCİ FƏSİL**

**HƏZRƏTİ MƏHƏMMƏDİN PEYĞƏMBƏRLİYİ**

**MƏDİNƏ DÖVRÜ**

## ÖN SÖZ

Allah təalaya həmd, insanlara qurtuluş yolunu göstərmiş olan elçiləri əziz peyğəmbərlərinə salat və salam olsun! İnsanlar arasında ən müqəddəs vəzifəni peyğəmbərlərin icra etdiyi şüphəsizdir. Çünki onlar, Allaha qulluq üçün yaradılmış insanlara dünya həyatında tabe olmaları lazım olan qaidə və qanunları öyrədərək, onları Allahın nurlu yoluna çatdırmışlar. Bu sayədə onların həm bu dünyada, həm də əbədi axirət aləmində həqiqi xoşbəxtliyi əldə etmələrinə imkan hazırlamışlar.

Fərdi və ictimai həyatda Allah təalanın iradəsi istiqamətində müqəddəs mübarizə aparan peyğəmbərlərdən hər biri bilindiyi kimi, küfr əhlinin düşmənçiliyi ilə qarşılaşmışdı. İnkarçılar, hər peyğəmbərin qarşısında dayanmışlar, içində olduqları anormal inanclar və əxlaqsızlıq naminə onlara düşmən olmuşdular. Ancaq peyğəmbərlər, özlərinə edilən hər cür pisliklərə baxmayaraq, Allah təalanın onlara təqdim etmiş olduğu bu əhəmiyyətli vəzifəni yerinə yetirmək üçün fövqəlinsani səy sərf etmişdirlər.

Özlərinə iman edən möminlərlə birlikdə inancları uğrunda hər cür çətinliyə dözə biləcəklərini, lazım olanda canları daxil hər şeylərini fəda edəcəklərini göstərdilər. Bütün davranışlarını Allahın rızasına uyğun, həyatı təhlükələrlə üz-üzə olduqları ən çətin zamanlarda belə, Allahın razılığına uyğun olmayan davranışlardan uzaq olmuşlar. İddialarından əsla dönməyəcəklərini göstərərək, bütün çətinliklərə qarşı səbir zirehinə bürünərək mübarizə apardılar. Bunun ardından Allahın köməyinin gəlməsiylə güc və iqtidar sahibi oldular və yer üzünü Onun iradəsi istiqamətində yaxşılaşdırdılar.

Allah təala, bənzəri çətinliklərlə qarşılaşan peyğəmbərlərini təsəlli etmək, ürəklərini gücləndirmək və zəfərdən əmin olmalarını təmin etmək üçün, əvvəlkilərin başından keçənləri sonrakılara açıqlayırdı. Bu sayədə hər peyğəmbər sələflərinin başından keçənləri qiymətləndirir, eyni şeylərlə qarşılaşacağını bilərək tədbirlərini ona görə hazırlayırdı. Allah təala, böyük peyğəmbərlərinin tövhid mübarizələrini son Kitabı Qurani-Kərimə də

əks etdirmiş, Rəsulullah -səllallahu əleyhi vəsəlləm- vasitəsiylə ümmətini məlumatlandırmış və onların başından keçənlərdən ibrət götürmələrinə imkan və fürsət hazırlamışdır. Onların qarşılaşdığı çətinlikləri açıqlayaraq, Məkkə müşriklərinin pisliklərinə məruz qalan möminlərin ürəklərini gücləndirdi. Onları təsəlli etdi və xoşbəxtliyə mütləq surətdə çatacaqlarını müjdələdi. Ayrıca müsəlmanlar, yaşadıqları hər əsrdə, inananların ortaq qədəri olan bənzəri vəziyyətlərlə qarşılaşdıqlarında, onları xatırlayacaq və bu ortaq qədərdə təsəlli və ümid tapacaqdılar.

Bu kitabı hazırlayərkən Qurani-Kərimdə, hədis və islam tarixi qaynaqlarında verilən məlumatları əsas götürməyə çalışdıq. Digər qaynaqlarda mövcud olan məlumatları isə, daha çox tənqid və ya müqayisə üçün, ya da tamamlayıcı məlumat olaraq istifadə etdik.

İnsanlığa, dünya və axirətdə xoşbəxt və doğru yolda olmalarını təmin edəcək əsasları öyrətmək, Uca Rəbbimizə necə qulluq və ibadət ediləcəyini göstərmək üçün, tarix boyunca Allah tərəfindən peyğəmbərlər vasitəçiliyi ilə göndərilən dinlərin ən mükəmməli və sonuncusu olan islam dini, sevimli Peyğəmbərimiz Hz. Məhəmməd (s.ə.s) tərəfindən təbliğ edilmiş və öyrədilmişdir. Bu uca dinin və Allahın son kitabı Qurani-Kərimin hökmləri, Onun yaşayışı, sözləri və tətbiqi ilə açıqlıq qazanmışdır. Beləliklə, Rəsulullah (s.ə.s) əfəndimizin həyatını öyrənmək, bir baxıma dinimizi öyrənmək deməkdir. Çünki, Rəsulullahın (s.ə.s) yaşayışı, sünnəsi, müxtəlif hadisələr qarşısındakı davranışları bilinmədən, nə Qurani-Kərimin başa düşülməsi, nə də digər islami elmlərin öyrənilməsi mümkün ola bilər. Bu səbəblə bir müsəlman üçün Rəsululah (s.ə.s) əfəndimizin həyatını, nümunə yaşayışını və üstün əxlaqını öyrənmək və bütün davranışlarında, Onu rəhbər götürmək, dini bir öhdəçilikdir. Necə ki, Qurani-Kərimdə: **“Allahın Rəsulunda sizin üçün ən gözəl nümunə vardır”** (Əhzab, 33/21), **“Peyğəmbər sizə nəyi gətirmiş və əmr etmişsə, onu alın, nəyi qadağan etmiş isə, ondan çəkinin”** (Həşr, 59/7), **“Kim Peyğəmbərə itaət etsə, gerçəkdə Allaha itaət etmişdir”** (Nisa, 4/80) və **“Sevimli Peyğəmbərim, şübhəsiz ki sən ən üstün əxlaqa sahibsən”** (Qələm, 68/4) buyurulmuşdur.

Rəsulullahın (s.ə.s) həyatı, təlim və təbliğ etdiyi əsaslar və meydana gətirdiyi böyük inqilabla əlaqədar olaraq şərqdə və qərbdə, müxtəlif dillərdə kitabxanalar dolu əsərlər yazılmış, həyatının hər mərhələsi ən incə

təfərruatına qədər araşdırılmış və hələ də araşdırılmaqdadır. Onun həyatının gizli qalmış, bilinməyən heç bir tərəfi yoxdur. Peyğəmbərlər və tarixin yazdığı digər məşhur şəxsiyyətlər içində, həyatının hər mərhələsi, Rəsulullahın (s.ə.s) həyatı qədər açıq-aşkar bilinən, yaşayışı, sözləri və davranışları ən incə detallarına qədər və ən mükəmməl şəkildə yazılmış ikinci bir şəxsiyyət tapılmamaqdadır. Bu gerçək, qərbli (qeyr-i müslim) yazarlar tərəfindən belə etiraf edilmişdir. Necə ki, ingilis alimi John Davenport, *"Hz. Məhəmməd və Qurani-Kərim"* adlı əsərində**:** *"Məşhur peyğəmbərlər, fatehlər arasında tarixi həyatı; Hz. Məhəmmədin tarixi kimi, ən incə təfərrüatına qədər, ən mükəmməl şəkildə qeyd və zəbt olunan bir kimsə göstərilə bilməz"*[1] deməkdədir.

*İlahiyyat elmləri namizədi*
**Abbas QURBANOV**
**Bakı 2009**

1. Jon Davenport, *Hz. Muhammed ve Kuran-ı Kerim*, tərc., Ömer Rıza Doğrul, İstanbul 1345/1926, s. 14.

## I. TARİX HAQQINDA ÜMUMİ MƏLUMAT

### A. Tarixin Tərifi

Dil cəhətdən tarix; bir hadisəni vaxtla bildirməyə deyilir. Tarix ərəbcə bir sözdür: ا رخ - kökündən gəlir. Kitabı bu gün tarixlədi deyə ifadə edilir və **"kitabı filan günü yazdı"** mənasında yazılma gününü bildirmək deməkdir. Bəzi dilçilər bu sözün **"hər şeyin bitmə yerinə tarix"** deyildiyini də bildirməkdədirlər. Bu fikri əsas götürən bir çox tarixçi kitablarını ölüm tarixlərini əsas alaraq əsərlərini yazmışdılar.

Termin olaraq tarix; insanların doğum, ölüm, səyahət etdikləri yerlər, keçmiş hadisələr, insanların haqqında edilən pis və ya yaxşı dəyərləndirmələr və buna bənzər şeylərin yazıldığı vaxtı bilməkdir.

İbn Xaldunun məşhur *"Müqəddimə"*sində bunu belə tərif edər: Bil ki, tarix elmi faydaları xeyli çox, yolu çox qiymətli, məqsədi çox şərəfli bir fənn olub, bizə keçmişdəki millətlərin əxlaqi dəyərlərinin meydana gəlmə və dəyişmələri, peyğəmbərlərin həyatlarını, kralların dövlətləri və siyasətlərini öyrədib, din və dünya işlərində bunlardan istifadə etmək üçün son dərəcə faydası olan bir məlumatdır.[2]

### B. Tarixin Əhəmiyyəti

Bizdən əvvəl yer üzündə yaşayan, bizim varis olduğumuz şeylərə sahib

2. İbn Xaldun, *Müqəddimə,* tərc., Zakir Kadiri Ugan, İstanbul 1991, I, 19.

olan, bu aləmdə bir iz buraxmaq üçün həyatı heçə sayan insanları tanımaq, tanımaya yaxınlaşa bilmək yüzdə əllilik bir nisbətə çatmasa da bütün insan oğlunun müştərək arzusudur.

Məchula aid məsələlər, bütün insanlarda araşdırma arzusunu artırır və bu səbəblə də ona bilmədiyini öyrənmə ehtirası verən bir varlıqdır. Hələ həyatlarını öyrənmək istədiyimiz insanlar tarixdə iz buraxan, mədəniyyətlərin inkişaf, dəyişmə və yayılmasında böyük təsirləri olan insanlardırsa o zaman bu arzu imtina edilməsi mümkün olmayan bir təhsil və araşdırma halına çevrilər.

Dövlətləri idarə edib, oradakı ictimai quruluşun möhkəmliyinə əhəmiyyət verən, nəsillərin varlığını davam etdirib suveren bir millət olaraq hayatlarını qurmaq istəyən hər kəs, tarixi məlumatların əhəmiyyətini, tarix şüurunun bir millətin gələcəyi üçün nə qədər qiymətli olduğunu daha yaxşı başa düşməkdədir. Tarix şəxsən insanın öz həyatıyla əlaqəlidir. Çünki hər yeni gün bir gün sonra tarix olacaq. İnsanın doğulmasından yaşadığı ana gələnə qədər keçirmiş olduğu bütün həyat mərhələləri onu iliklərinə qədər tarix ilə iç-içə olmağa vadar edir. Kimin evladıdır? Babası nənəsi kimdir, harada yaşamış, necə bir həyat sürmüşlər? Kimi bir sıra sualların cavabı tarixin tam özünü təşkil edir.

Millət özlüyündə kəslərdir. Fərdlərin tək-tək meydana gəlməsindəki hər mərhələ millətdə də vardır. Bir millət, tarixdə kökü yoxsa onun bütün xüsusiyyətlərini daşıyan səciyyəli və köklü bir millətin olması necə düşünülə bilər. Bir millət zaman axarı içərisində digər millətlərlə qarışıb yeni bir millət meydana gəlməsinə də səbəb ola bilər. Eynilə xarici millətdən evlənib dünyaya iki irqdən xüsusiyyətlər daşıyaraq doğulan uşaq kimi olar. Belə bir milləti tanıya bilmək yenə tarix məlumatı tələb edir. Keçmişdə tək ana-atadan olan insanların millətlər və qövmlərə ayrılış müddətini tanıması nə qədər təbii bir hadisədir. Tarixi yaxşı tanımaq, zamanla ideal bir ümmətin meydana gəlməsindəki amilləri, dəyişmə və başqalaşma sirlərini keçmişin təcrübələrindən faydalanmağı bacarıb tətbiq etmə və ibrət götürmə asanlığı gətirər.

Öyrənəcəyimiz din tarixi olacaq olsa onun əhəmiyyəti tamamilə

başqa bir hadisədir. Çünki, tarixdən günümüzə qədər insan oğlunun sosial həyatında ən təsirli faktorun din olduğu şübhəsizdir.[3]

**C. Tarixin Əhatə Etdiyi Mövzular**

Tarix keçmişdə cərəyan edən hadisələrin nəqli olduğundan, çox genişdir. Buna görə tarix elmində bütün şöbələriylə kamala çatmış bir tarixçi göstərmək çox çətindir. Tarix, hadisələrin cərəyan etdiyi yer və ölkələr baxımından coğrafiya elmini, insanla əlaqədar olduğu üçün sosiologiyanı, bizdən əvvəlkilərin məlumat və tapıntılarını da nəql etdiyi üçün riyaziyyat, tibb, hüquq, fəlsəfə, əxlaq kimi elmlərin ümumiləşdirmələrini də əhatə edir. Hətta bütün elmlərin incələnməsi eynilə tarixçiliyi tələb etdiyindən elmlər tarixinə də uzanır.

Dini elmlərin araşdırılması isə müstəqil tarix mövzusudur. Zəhəbi bunları söyləyir:

Mənim *"Tarixul-İslam"* adlı ensiklopedik tariximdə bəhsi keçən fənlərə gəlincə; mən bunları çox qısa olaraq ələ alıb onların layiqiylə haqqını vermədim. Elə edəcək olsaydım 600 dəriyə ehtiyac olardı.

Hal-hazırda tarix: Yazının icadıyla bu günə kimi insan oğlunun həyatında mərhələ-mərhələ meydana gələn hər cür hadisələri, inkişafları və elmləri, müəyyən metodlar istifadə edərək araşdıran elmə deyilir. Buna görə tarixçilər keçmiş dövrün tarixini yazıdan əvvəl və yazıdan sonra olmaqla iki yerə ayırırlar. Qədim dövr tarixini araşdırmaq üçün qərblilər, bir sıra əsli olan və olmayan nəzəriyyələri, bu günün inkişaf edən texnikasını da yanına almaqla bəzi şeyləri iddia edərək yeni bir elm ortaya atdılar. Buna yenidən qurma adını verdilər. Bunun üsulu tarix üsuluna uyğun deyildir.

Yeni tarix anlayışına görə insanlıq tarixini dövrlərə ayırıb bunlara çağ adını verirlər. İlk dövr, orta dövr, yeni dövr, yaxın dövr. Müsəlman tarixçilər isə yaradılışdan başlayaraq peyğəmbərimizə qədər olan qismi müqəddəs kitablara, Quran və hədisə və rəddi çətin olan rəvayətlərə söykənərək ümumi cəhətləriylə ələ alarlar. Peyğəmbərimizə gəlincə onu siyər, məğazi, şəmail, mucizat, təbliğ və təlimat kimi ayrı-ayrı mövzulara görə bölümlərdə topla-

3. İmam Zəhəbi, *Tarixul-İslam,* Cantaş yayınları, I, 12–14.

mışlar. Bəziləri də il sıralamasına görə Məkkə və Mədinə dövrü deyə tərtib etmişdir. Ondan sonrasını isə təbəqələrə ayırırlar. Kimi 10 ili, kimi 20 ili təbəqə olaraq götürüb ona görə məlumat verirlər.

Əlbətdə tarixi keçmişə materialist düşüncə ilə baxdığımızda bir çox səhv və təxminlərlə dolu olduğunu görə bilərik. Qərbdəki kəşflər, sənaye inqilabları, fizika və kimyanın inkişaf etməsi qərb insanına bir çox üstünlük təmin etdi. Bunlar bu üstünlüyü haqlı olduqları yerdə istifadə etməklə qalmayıb, heç bilmədikləri şeylərdə də haqları olmadığı halda bu inkişafı istismar etdilər. "Yazının icadını" uydurma olaraq icad etdilər. Sonra buna görə bilinən tarix və bilinməyən tarix (tarix əvvəli) deyə ikiyə ayırdılar. Köhnə sümük və daşların, şəkillərin araşdırılmasında bir sıra metodlardan istifadə etdiklərini iddia etdilər. Bu araşdırmaların çoxuna keçən əsrdə başladılar. Sırf Avropa istismar nizamına dəstək təmin edib, digər millətlərin əlində ovcunda nə varsa özlərinə keçirməyi planladılar.

Bu işlər tarix əvvəli hadisələri deyil, tarix sonrasını da pərişan etdi. Bu nəzəriyyə ilə insan Adəmin uşağı olmaqdan çıxıb meymunun uşağı halına gəldi. Onlar bu xor görücü nəzəriyyəni qərbli azad və keçmişləri parlaq olan bütün müxtəlif millətləri yox etmə propoqandası olaraq istifadə etdilər. Bəzi yerlərdə mixiyazısını oxuduqları iddiasıyla bu gün Şimali İraqda çox azlıqda olub nəyə sitayiş etdikləri belə müəyyən olmayan Aşşurluları tarixin ən böyük imperatorluğu elan edib, bəzi etnik qrupları da dünya mədəniyyətinin qurucusu kimi göstərərək bütün insanlığın onlara borclu olduqlarını bildirdilər. Bəziləri Allaha inanan güclü və soylu millətləri xor görmək üçün bu fikri atom bombası kimi elm adına partladıb, yüz illərlə qurulan mədəniyyəti heçə saydılar.

Bizə görə tarix, Hz. Adəmlə başlamışdır. Çünki ilk səhifələr ona enmiş, ilk kitabı oxuyan insan Hz. Adəm atamız olmuşdur. Bu barədə yahudilər də, xristianlar da bizim kimi inanmağa məcburdur. Çünki, onların din kitabları da bunları belə bildirir. Bir şeyi bilmiş olmaq digər şeyləri də bilməyə köməkçi olar. Çox təəssüf ki, insan tələskəndir və fitrətində bilmədiyini bilirmiş kimi göstərmə xüsusiyyəti vardır. Ona görə Uca yaradan: **"Məlumatın olmadığı şeyin (bilərəm deyə) ardınca getmə! Çünki qulaq, göz və ürək bunların hamısı sorğu-sual olunacaqdır."** (İsra, 17/36) buyurdu. Yenə Allah (c.c) Hucurat surəsinin 12-ci ayəsində belə buyurur: **"Ey iman edənlər! Zənnə qapılmaqdan qaçının! Çünki zənnin bir qismi günahdır."**

Beləcə Allah, təxminə söykənən, heç bir elmiliyi olmayan fikir ortaya atmaqdan çəkinməyi əmr edib, bunu haram edir. Yenə təxminin hamısını rədd etmir, bir qismini qadağan edir.

Bununla materialist qərb insanı, texnologiya silahının əzəmətini qavrayar-qavramaz, bütün dünyanı əmrinə tabe etməyi, onun bütün nemətlərini özlərinin malı olduğuna inanaraq, onu kimin əlində olursa olsun ələ keçirmək üçün bütün vasitələrə müraciəti qanuni saydılar. Hətta, elə bir istifadə ki, böyük Afrika qitəsini əsir bazarlarında sataraq əritdilər. Geri qalan və müqavimət gücü olmayan yazıq Afrika insanını da idarələri altına aldıqları qitənin nemətlərini istismar etməkdə işçi-kölə olaraq istifadə etdilər. Afrikayla birlikdə Avstraliya, Hindistan, cənub-şərqi Asiya, Hind okeanı və Sakit okeandakı dünyanın ən gözəl adalarını da işğal etdilər. Bugün artıq o yerlərdə o bölgələrin yerli xalqı yoxdur. Yalnız nəslin varlığına nümunə göstərmək üçün buraxdıqları bir neçə talesiz damazlıq qrup halında olan insanlar vardır.

Tam yetmiş il Şimali Asiya və Şimal-şərqi Avropanı əsarəti altına alan Sovet İmperatorluğu dağılıb geri çəkilərkən ən az iyirmi milyon Türk insanının qanını içmiş və o ölkələrin 70 il geri qalmasının səbəbkarı olmuşdur.

**Ç. İslam Tarixinin Qaynaqları**

Əlimizdəki mövcud İslam tarixlərinə baxdığımız zaman müəlliflərin yazdıqları əsərləri xüsusilə bu altı başlıq altında ayrı-ayrı, ya da ümumi tarix olaraq bir yerdə toplamamız mümkündür.

1. İslamdan əvvəlki peyğəmbərlər və millətlər tarixi.

2. Peyğəmbərimizə aid siyər və məğazi tarixi.

3. Ölüm, doğum ya da dövr sırasına görə (tabakat) səhabə və alimlərin həyatlarını əsas alan tarixlər.

4. Bölgə ya da dövlətlər sırasına görə siyasi tarixlər.

5. Ayə və hədislərdə xəbər verilən gələcək əsrlər içərisində olması gözlənilən hadisələr tarixi. Buna Fitən, Məlahim və Qiyamət tarixi də deyə bilərik.

6. Şəhərlər tarixi- Şam, Bağdad, Vasıt, İsfahan və.s şəhər tarixi kimi əsərlər.

Beləcə bu altı növdə müxtəlif zamanlarda yazılmış olan tarixi qaynaqlar bizim zəmanəmizə qədər gəlib çatmışdır. İndi bu qaynaqlar haqqında sırası ilə məlumat verək.

**1. İslamdan əvvəlki dövrün qaynaqları:** Bu dövr kainatın və insanların yaradılışı kimi hadisələrlə insan oğlundan əvvələ dayandığı üçün bu cür bir məlumatın heç bir şəkildə vəhy xaricində tam doğru olaraq düşünülməsi mümkün deyildir. Buna görə də mövzunun tək qaynağı vəhydir. Yəni müqəddəs kitablardır. Buna görə bu mövzuda əsər yazanlar Tövrat, bəzən İncil və Qurana söykənməyə məcburdurlar. Birdə peyğəmbərlərin verdikləri xəbərlər son dərəcə əhəmiyyət daşımaqdadır. Ancaq İsrail hekayələrinin içinə qarışdığı, təhrif olunmuş İncil və Tövratın, onların şərhləri mahiyyətindəki uydurma əsərlərin mövzuya birinci dərəcədə qaynaq olması mümkün deyildir. Bu mövzunun yeganə qaynağı Quran və Peyğəmbərimizin xəbər verdiyi şeylərdir. Yaradılışdan Peyğəmbərimizin dövrünə qədər keçən zaman üçün ən sağlam qaynaq budur. Ancaq orada keçən xəbər verilən hadisələr, şübhəsiz çox az bir qismini təşkil edir.

İslam tarixçiləri bu mövzuda ortaq bir qərara gələ bilməmişlər. Bunlar Əbu Hüreyrə, Əbu Səid əl-Xudri, Cabir və Abdullah b. Amr (r.a.) kimi səhabələrin nəql etdikləri hədisdə keçən:

*“Məndən sizə bir ayə belə çatsa onu təbliğ edin! İsrail oğullarından edilən rəvayətləri də izah edə bilərsiniz. Bunda bir qorxu yoxdur. Kim mənim demədiyimi bildiyi halda- mənə istinad edərək- belə buyurdu deyərsə- bir yalan uydursa, özünü cəhənnəmdəki yerinə hazırlasın.”*[4] Hədisi ilə əməl edərək, İsrail oğullarından da nəql edilə biləcəyi görüşüylə yola çıxanlar olduğu kimi, onlardan heç nəql etməyənlərdə vardır.

İbni Kəsir kimi rəvayətdə düzgün xəbəri ön planda tutanlar, bu dövr üçün ayə və hədis istifadə etməyə çox əhəmiyyət verib, yəhudi və xiristian qaynaqlarına güvənməmişlər.

---

4. Buxari, Əbu Abdullah Məhəmməd b. İsmayıl (v. 256/870), *əl-Camius-səhih*, Ənbiya 60, İstanbul 1315 h, (Bab no 50); Əhməd b. Hənbəl, *Müsnəd,* Misir 1313, II, 159–202.

**2. Siyər və məğazi qaynaqları:** Bunlarda israiliyyat və xarici qaynaq istifadə edilə bilməz. Bunların birinci dərəcədə qaynağı Quran, hədis və səhabə müşahidələridir. Ancaq, səhabələr dövründə şəxsən siyər və məğazi kitabları yazılmadığı üçün, bu məlumatlar, bir dövr sonra tabiun zamanında genişlənərək bu günki halına gəlmişdir.

**3. Səhabə, tabiun, təbəi tabiun və ondan sonra gələn alimlərin tabakatları:** Bunların ilki olan səhabələrin həyatları üçün yeganə qaynaq, tabiunun onlara dair bizə çatdırdıqları məlumatlardır. Hədis kitabları bu mövzunun ən əsaslı qaynağıdır. Daha sonra səhabələr üçün xüsusi əsərlər də yazılmış və onlar haqqında geniş məlumatlar verilmişdir. Məsələn; İmam Əhmədin, Humeydinin. Əbu Yalanın, İshaq b. Rahuyənin *"Müsnəd"* adlı əsərləri birbaşa hədis kitabı olmasına baxmayaraq, hədisləri əlifba sırası ilə səhabə adına görə nəql etdikləri üçün, hər səhabənin neçə hədis nəql etdiyi təqribən aydın olmuş olduğu kimi, o səhabənin həyatında keçən hadisələri də birbaşa vermiş olur.

**4. Bölgə və ya dövlətlər sırasına görə olanların qaynaqları:** Özlüyündə ya müşahidəyə ya da müşahidənin nəqillərinə əsaslanır. Şəxsən o dövrləri görən alimlərin qələmə aldıqları mövzular ən yaxşı əsərlərdir.

**5. Fitən və məlahim, qiyamət tarixi:** Bunlar yalnız ayə və hədislərə əsaslanır. Bunlar haqqında şərh, təxmin və bənzəri şeylər caiz deyildir. Çünki qeybi ancaq Allah (c.c) bilir.

**6. Şəhər adlarına görə yazılan tarix:** Bunlar ya şəhərin adıyla ya da o şəhərin fəth edilişi mahiyyətində yazılan kitablardır. Amma o şəhərdə baş verən hadisələrlə birlikdə orada yaşayan alim, əmir və bənzəri kəsləri əhatə etməkdədir. Bu səbəbdən qaynağı müxtəlifdir.[5]

### D. İlk İslam Tarixi Qaynaqları

Tarix yazmaq, islam dünyasında ilk olaraq **Siyər** (Hz. Məhəmməddən (s.ə.s) bəhs edən kitab) və **Məğazi** (qəzvələr, səriyyələr) ilə başlayıb, tabakat kitabları ilə davam etmişdir. Siyər və məğazilərə dair ilk əsər, **Ürvə b. Zübeyr**ə (v. 93/712) aiddir. Daha sonra sayları çoxalan bu müəlliflər arasında **Vəhb b. Münəbbih**i (v. 114/732), **Məhəmməd b. İshaq**ı (v. 768),

5. İmam Zəhəbi, *e.a.ə.*, I, 19-22.

**Məhəmməd b. Müslim əz-Zöhri**ni və **Yəhya b. Səid b. Əban əl-Üməvinin** (191/807) adını çəkmək olar. Böyük siyərçi **İbn İshaqın** əsərindən isə ancaq **İbn Hişam** vasitəsilə xəbərdar ola bilirik.

İslam aləmində tarix elminə bu qədər əhəmiyyət verilməsi Peyğəmbər (s.ə.s) dövründən başlamışdır ki, bunun da bir çox səbəbləri olmuşdur. İlk olaraq onu qeyd edək ki, Qurandakı mövzulara diqqət etdiyimiz zaman birinci yeri ilahi mövzular tutduğu halda, ikinci yeri tarixi mövzular tutmaqdadır. Belə ki, biz bütün keçmiş qövmlər, onların həyat tərzi, yaşayışı, mədəni vəziyyətləri və həlak olma səbəbləri haqqında yazılı olaraq sadəcə Qurani-kərimdən məlumat almaqdayıq. Başqa bir tərəfdən də Peyğəmbər (s.ə.s), qonşu qövmlərin keçmiş tarixini öyrənir və hətta onlarla bunu nəzərə alaraq əlaqə qurardı.

Peyğəmbər (s.ə.s) vəfat etdikdən sonra isə siyər elmi daha çox inkişaf etməyə başlamışdır, çünki, Peyğəmbər əfəndimizin əməlləri, sözləri, hal və hərəkətləri ilə əlaqədar bütün məlumatlar burada tam bir şəkildə yazılırdı. Bütün müsəlmanlar üçün də bu çox maraqlı və vacib idi. Buna görə də müsəlmanlar arasında tarixin öyrənilməsinə və onun araşdırılmasına böyük maraq olmuşdur.

### 1. Təbəri

Təbəri, h. 224–309/ m. 838–923- cü illərdə yaşayan Təbəri, islam aləminin tanınmış tarixçi və təfsirçilərindəndir. Təbəristanın Aməl şəhərində doğulan Təbəri, orta səviyyəli bir ailədə böyümüşdür. İlk təhsilini Aməldə alan tarixçi, sonradan Misir, Suriya və qonşu ərazilərdə elm təhsil etmək üçün səyahətlər də etmişdir. Abbasi xilafətinin hakimiyyətdə olduğu bir zamanda yaşayan tarixçi *“Tarixu-r-Rusul və-l-Muluk”* və ya *“Kitabu Axbari-r-Rusul və-l-Muluk”* adında tarixlə əlaqəli olan əsərini yazmışdır. Təfsir, hədis və fiqh sahələrində də əsər yazan Təbəri islam tarixinin **Herodotu** sayılmaqdadır.

Qısa olaraq *“Təbəri Tarixi”* və ya *“Cəfəri Tarixi”* adları ilə tanınan tarix əsəri iki hissədən ibarətdir. Əsərin birinci hissəsində islam dinindən əvvəlki insanlıq tarixindən bəhs edilməkdədir. Mövzu olaraq isə insanın yaradılışından başlayaraq, islam dininin meydana gəlməsinə qədərki hadisələr haqqında məlumat verilməkdədir. İkinci hissədə isə islamın zühurundan başlayaraq h.

111/m. 729-cu ilə qədərki hadisələr qələmə alınmışdır. Əsərdə əks olunan hadisələr yüz illərlə, müəyyən olunmuş dövr və hadisələrə görə deyil, baş verdiyi illərə görə yazılmışdır. Əsər, yazılmış rəvayətlərin çoxluğu, qarışıqlığı və aralarındakı əlaqənin olmaması ilə seçilməkdədir. Qissə heyranı olan Təbəri bildiyi və eşitdiyi bütün rəvayətləri qələmə almış, elə bu cəhətinə görə də tənqidə məruz qalmışdır. Yəni, eşitdiyi məlumatları dəyərləndirmədən ya da təkrar olub-olmadığına diqqət etmədən kitabına almışdır. Buna görə də bu əsəri *"tarixi rəvayətlər və məlumatlar xəzinəsi"* də adlandırmaqdadırlar.

Kitabın giriş bölümündən sonra qədim dövr tarixi, peyğəmbərlər, hökmdarlar və Sasani dövlətinin tarixi burada əks olunmuşdur. Bundan sonra gələn ikinci bölüm Hz. Peyğəmbər (s.ə.s), Raşidi xəlifələr, Əməvilər və Abbasilər dövrünün hadisələri ilə davam etmişdir. Əsər h. 302/m. 915-ci ilin hadisələri ilə başa çatmışdır. Tarixçi, hadisələrlə əlaqədar fərqli olan rəvayətləri qəbul etsə də, bəzi hallarda *"doğru olan budur"* deməklə öz fikrini də bildirmişdir. Kitabda Orta Asiya və Azərbaycanın fəthi ilə əlaqədar verilən məlumatlar, xəzər tayfaları və Azərbaycan münasibətlərinin müəyyənləşdirilməsində bizim üçün çox dəyərlidir.

Əsərin bir xüsusiyyəti də ondan ibarətdir ki, Təbəridən sonra əsər yazan bütün tarixçilər, onun əsərindən qaynaq kimi istifadə etmişdirlər. Ondan sadəcə tarixçilər deyil, eyni zamanda təfsirçilər, hədisçilər və fiqhçilər də geniş şəkildə istifadə etmişdirlər.

Yuxarıda göstərdiyimiz cəhətlərinə görə əsər tənqid olunsa da, Təbərinin bu əsəri ümumi tarix, siyasi tarix, islam tarixi və xüsusən də islam orduları tərəfindən tutulmuş ərazilərin tarixi baxımından birinci dərəcəli bir qaynaqdır. Kitabın bu xüsusiyyətinə görə də Təbəri həm şərq, həm də qərb dünyasında tanınmışdır.

Təbəri h. 310/m. 923-cü ildə Bağdadda vəfat etmişdir. Ona düşmən olan insanların çox olmasına görə ölümü heç kimsəyə bildirilməmiş və yaşadığı evdə də dəfn edilmişdir. Bəziləri onun qəbrinin başqa yerdə olduğunu desələr də, amma bu çox da həqiqətə uyğun deyildir.

**2. Bəlazuri**

Doğum tarixi və yeri məlum olmayan Bəlazurinin h. 279/m. 892-ci ildə

vəfat etdiyi məlumdur. Tam kunyəsi Əbul-Həsən Əhməd b. Yəhya b. Cabir b. Davud əl-Bəlazuridir. Xüsusən, Fars dilində olan kitabları ərəb dilinə tərcümə etdiyinə görə son dövr araştırmacılar onun fars olduğunu deməkdədirlər. Tarixçinin nəsəbi haqqında ətraflı məlumatların olmaması onun haqqındaki bu fikirlərin daha da güclənməsinə səbəb olmuşdur. Sadəcə babası Cabirin, xəlifə Harun ər-Rəşid zamanında Misirdə katib işlədiyi məlumdur.

Bəlazuri Bağdad, Dəməşq və Humusda olmuş və oradakı dövrün alimlərindən dərs almışdır. Qaynaqlarda Bəlazuri haqqındakı məlumatların çoxu, Abbasi xəlifələri və vəzirləri ilə olan münasibətlərindən bəhs etməkdədir. Belə ki, Bəlazuri xəlifə Mütəvəkkilin hüzurunda olan elmi söhbətlərdə olmuş və on ilə qədər də xəlifənin nədimliyini etmişdir. Tarixçi 892-ci ildə Bağdadda vəfat etmişdir. Dövrün tarixçisi İbn Nədim bildirir ki, Bəlazuri hafizəsini gücləndirmək məqsədi ilə Hindistan qozuna oxşayan bir meyvədən yemiş və bunun təsirindən də vəfat etmişdir. Bunun tam əksinə bəzi tarixçilər, bu hadisənin onun deyil babası Cabirin başına gəldiyini bildirərək, bu səbəblə də ona Bəlazuri ləqəbinin verildiyini deyirlər.

**Əsərləri:** Bəlazurinin *"Ənsabül-Əşraf"* adlı kitabı günümüzə qədər gəlib çatan iki böyük əsərindən biridir. Kitabın mövzusu Hz. Peyğəmbərin həyatından başlayaraq, Xuləfai Raşidin, Əməvilər və Abbasilər dövrünün ilk çağlarına qədər olan hadisələri əhatə etməkdədir. Kitab xüsusən tabakat, ənsab və əxbar üsulunda yazılmış əsərlərdəki məlumatlardan istifadə olunaraq yazılmışdır.

Bəlazurinin digər əsəri *"Fütuhul-Büldan"* adlanmaqdadır. Kitabda Hz. Peyğəmbərdən başlayaraq h. III əsrə qədər olan hadisələr haqqında burada məlumat verilmişdir. Əsərin ən böyük dəyəri bu zaman içində islam ordularının fəth etdikləri ərazilər və şəhərlərə görə ətraflı məlumatların verilməsidir. Bu bölgələr qısaca olaraq aşağıdakılardır: Suriya, Cəzirə, Misir, Fas (Mərakeş), İraq və s. Bəlazuri kitabını qələmə alarkən özündən əvvəlki tarixçilərdən fərqlənmişdir. Eyni zamanda Azərbaycan haqqında da məlumatların olduğu bu əsərdə, xüsusən Abbasilər zamanında burada olan etirazlar və Babək üsyanıyla əlaqədar geniş məlumatlar vardır.

Belə ki, Bəlazuri əsərləri araşdırdığı kimi hadisələri və olan rəvayətləri öyrənməklə yanaşı, onların səbəblərini də araşdırmışdır. Hətta onlar arasında

dəyərləndirmə də edərək *“ən doğrusu budur”* və ya *“əvvəlki xəbər daha doğrudur”* deməklə ondan istifadə edənlərə də yol göstərmişdir. Anonim olan xəbərləri də qələmə almağına baxmayaraq, onların qarşısında *“bir rəvayətə görə”* və ya *“bəzilərinə görə”* ifadələrini də istifadə etməklə araştırmacılara böyükköməklik göstərmişdir. Tarixçi, eyni zamanda hadisəni rəvayət edən şəxsin orada olmasını və ya oraya yaxın yaşadığını da qeyd etməklə, onların verdikləri məlumatların daha doğru olmasına da işarət etmişdir. Hadisələri araşdırdıqdan sonra onların siyasi, ictimai və iqtisadi səbəblərini də göstərməyə çalışmışdır. Onu da qeyd edək ki, Bəlazuri saymış olduğumuz dəyərləndirmələri elədiyi obyektiv olmağa çalışmış və ondan sonrakı tarixçilər də onu belə tanımaqdadırlar.

### 3. İbnuʾl-Əsir

H. VI əsrin tarixçilərindən olan İbn Əsir h. 555/ m.1160-cı ildə Mosul yaxınlarında İbn Ömər Cəzirəsində anadan olmuşdur. Atasının adı Əbul Kərəmdir. Üç qardaş olan Məciduddin, İzzuddin və Ziyauddin yaşadıqları bölgənin ən elmli insanı olduqları və onun adını hər tərəfdə tanıtdıqları üçün bu üç qardaş tarixdə “İbnul-Əsirlər” deyə tanınmışlar. Hər üç qardaş Mosulda təhsil almışdır. Qardaşlardan Məciduddin hədis sahəsində, balaca qardaş Ziyauddin şeir və ədəbiyyat sahəsində, İzzuddin isə tarix sahəsində məşhur olmuşdur ki, bizim haqqında məlumat verəcəyimiz şəxs də budur.

İbn Əsirin verdiyi məlumatların əhəmiyyəti ondan ibarət olmaqdadır ki, o tarixi hadisələrin baş verdiyi və ya olduğu yerləri gəzmiş və xüsusən də Abbasilər dövrünə aid məlumatları toplamışdır. O, eyni zamanda İbn Halliqan kimi dövrünün tanınmış tarixçiləri ilə də görüşərək *“Kitabul-Ənsab”*, *“Usdul-Ğabə fi Marifətis Sahabə”* və *“Tarixul-Kamil”* adlarındakı məşhur əsərlərini yazmışdır. Bu əsərlər içində *“Tarixul-Kamil”* əsəri onun həm şərqdə həm də qərbdə tanınmasına səbəb olmuşdur. Əsər həm dünya, həm də islam tarixi üçün əsas əsərlərdən hesab olunur. Belə ki, kitabda insanın yaradılmasından başlayaraq h. 628/m. 1230-cu ilə qədər olan hadisələri əhatə etməkdədir. Hadisələr mövzularına və tarixi illərinə görə sıralanmışdır. Əsər eyni zamanda türk-islam tarixi baxımından da çox əhəmiyyətlidir. *“Usdul-Ğabə”* adlı əsərində isə təqribən 7500-ə qədər sahabə və onların biyoqrafyasını geniş bir şəkildə əks etdirmişdir.

İbn Əsirin *"Tarixul-Kamil"* əsərinə gəlincə isə, ümumilikdə tarixi hadisələri qələmə alan tarixçi, Təbəridən geniş bir şəkildə istifadə etdiyi ortaya çıxır. Lakin, bəzən götürdüyü məlumatları olduğu kimi, bəzən də onları fərqli şəkildə yazmışdır. Bundan başqa müəllif rəvayətlərin isnadlarını və ravi adlarını vermir. Eyni zamanda qaranlıq olan hadisələri açıqlamaq üçün isə şeirlərdən də istifadə etmişdir. Kitabda Məğrib və Əndəlüs haqqında da ətraflı məlumat verilməklə yanaşı, Təbərinin ölümündən sonra (h. 310/m. 922) h. 628/m. 1230-cu ilə qədər baş vermiş hadisələri və onlarla əlaqədar olan bütün rəvayətləri verməklə də seçilmişdir. Tarixçi 1233-cü ildə vəfat etmişdir.

**E. Müasir Tarix Anlayışındakı Qaynaqlar**

1. Müşahidələr və xatirələr.

2. Xəbərlər, (şifahi xəbərlər, tarixi şeirlər, dastanlar, hekayələr, lətifələr və tarixi zərbi-məsəllər) yazılı xəbərlər və (kitabələr, şəcərələr, hal tərcümələri, avtobiyografiya və xatirələr, səyahətnamələr, mətbuat) şəkilli xəbərlər.

3. Qalıntılar. (cəsəd qalıqları, danışılan dillər, coğrafi adlar, adət və ənənələr, köhnə binalar, yazma sənət məhsulları, əl işləri və bənzərləri)

4. Heykəl və şəkillər.

5. Ümumi tarixi kitabxanalar.

## II. İNSANIN YARADILIŞ HİKMƏTİ

Kainatın yaradıcısı və onun yeganə sahibi və hakimi Uca Allah, ucsuz-bucaqsız aləmlərin kiçik bir hissəsi olan dünyamızda, digər varlıqlarla birlikdə insanı da yaratmışdır. Varlıqlar içində ən mükəmməl bir şəkildə yaratdığı insanı, dünyada xəlifə təyin etmiş və insan nəslini yer üzündə iman üçün vəzifələndirmişdir. Varlıqlar içində yalnız insanlara və insanların duyğu orqanlarıyla idrak edilə bilməyən varlıqlar olan cinlərə düşünmə, anlama, öyrənmə və iradəsini istifadə etmə qabiliyyəti verərək bu iki varlıq növünə ilahi əmrlərə tabe olmağı əmr etmişdir. Yalnız insanlara və cinlərə

verilən bu qabiliyyətlərə sahib olmayan digər bütün canlılar isə, ümumi mənada instinktləriylə (hissləriylə) hərəkət edərlər. Hərəkətləri müəyyən və məhduddur, özləri üçün təyin olunmuş dairənin xaricinə çıxa bilməzlər.

Bəxş etdiyi bu qabiliyyətlərlə insanı digər varlıqlardan ayıran Allah təala, kainatdakı canlı və cansız hər şeyi insan nəslinin faydalanması üçün yaratdığını xəbər vermişdir. Qurani-Kərimdə bir çox yerdə bu həqiqəti belə açıqlamaqdadır: **"O (Allah), göylərdə və yerdə olan hər şeyi özündən bir lütf olaraq sizin xidmətinizə vermişdir. Düşünən bir cəmiyyət üçün, bunlarda nə qədər ibrət və dəlillər vardır."** (Casiyə, 45/13), **"Yer üzündə nə varsa hamısını sizin üçün yaradan Odur."** (Bəqərə, 2/29), **"Yeri (Yer kürəsini) sizə ram edən Odur. Onun qoynunda gəzin, (Allahın) ruzisindən yeyin. Axır dönüş də Onadır!)"** (Mülk, 67/15), **"O, gecəni və gündüzü, Günəşi və Ayı sizə ram etdi (sizin xidmətinizə verdi). Ulduzlar da Onun əmrinə boyun əymişdir. Doğrudan da, bunda ağılla düşünənlər üçün ibrətlər vardır! (Allah) yer üzündə yaratdığı cürbəcür şeyləri (heyvanları, bitkiləri, meyvələri və s.) də sizin ixtiyarınıza verdi. Öyüd-nəsihət qəbul edənlər üçün, sözsüz ki, bunda da (Allahın qüdrətini, əzəmətini bildirən) əlamətlər vardır! Təzə ət (balıq əti) yeməyiniz, taxdığınız bəzək şeylərini (inci, sədəf, mərcan) çıxartmağınız üçün dənizi də sizə ram edən Odur. (Ey insan! Allahın) nemətindən ruzi axtarmağınız üçün sən gəmilərin onu yara-yara üzüb getdiyini görürsən. Bəlkə, (bundan sonra Allahın nemətlərinə) şükür edəsiniz! Və ya: Sən gəmilərin onu yara-yara üzüb getdiyini görürsən. (Bütün bunlar) Onun lütfünü axtarmanız və (kəräminə) şükür etməyiniz üçündür!"** (Nəhl, 16/12–14)

İnsanı bu əhəmiyyətli mövqeyə gətirən və ona yer üzünün xəlifəsi vəzifəsini verən Allah, bunun qarşılığında varlıqlar içində insan nəslinə əhəmiyyətli bir məsuliyyət yükləmiş, insanlara ağıl və şüur baxımından onlara ortaq etdiyi cinləri, dünya həyatında nəticəsini axirətdə çəkiləcəkləri bir imtahana tabe tutmuşdur. Bu imtahan, insanlar və cinlərin yaradılışının hikmətidir ki, bu da, yer üzündə yalnız Allaha qulluq edərək, həyatı Allahın əmr və qadağanları istiqamətində təşkil etməkdir. Verdiyi ağıl və iradə qabiliyyətiylə insanları və cinləri digər canlılardan ayıran Allah təala, bu böyük lütf qarşılığında, onlardan yalnız özünə qulluq etmələrini istəmiş və yalnız özünə ibadətlə mükəlləf tutmuşdur. Uca Allah, insanları və yenə qulluqla mükəlləf tutmuş olduğu cinləri yaratma hikmətini belə açıqlamışdır: **"Mən,**

**cinləri və insanları yalniz Mənə qulluq və ibadət etsinlər deyə yaratdım"** (Zariyat, 51/56), **"Hansınızın əməlcə daha gözəl olduğunu sınamaq (bəlli etmək) üçün ölümü və həyatı yaradan Odur. O, yenilməz qüvvət sahibidir, (çox) bağışlayandır."** (Mülk 67/2), **"Ərşi su üzərində ikən hansınızın daha gözəl əməl (itaət) sahibi olacağını sınayıb bilmək üçün göyləri və yeri altı gündə yaradan Odur. (Ya Peyğəmbərim!) Əgər desən ki: "Siz öləndən sonra, həqiqətən, dirildiləcəksiniz!", kafir olanlar: "Bu, açıq-aşkar sehrdən (yalandan) başqa bir şey deyildir!"** - deyə cavab verərlər. (Hud, 11/7)

### A. Peyğəmbərlik Müəssisəsinə Olan Ehtiyac

Bu dünyada imtahan üçün yaradılmış olan insanlar və cinlərin hər cür davranışları, vəzifəli yazıçı mələklər tərəfindən davamlı bir şəkildə yazılmaqdadır. Mələklərin tutduğu bu qeydlər, axirətdə hesab günündə hər insanın önünə gətiriləcəkdir. Dolayısıyla ədalətli bir imtahan verməsi üçün, insanlara bütün xeyr və şər yolların göstərilməsi, edilməsi ya da tərk edilməsi lazım olan şeyləri təyin edən qanun və qaydaların əvvəldən bildirilmiş olması lazımdır. Yenə dünyada ediləcək yaxşılıq və pisliklərin axirətdəki qarşılığının xəbər verilməsi, insanın şeytana və nəfsinə uyub pislik arxasınca qaçdığı təqdirdə alacağı cəzanın, Allahın əmrlərinə itaət etdiyi təqdirdə isə əldə edəcəyi mükafatın açıqlanması lazımdır. Uca Allah, bu məlumatlandırmağı, insanların içindən özünə elçilər olaraq seçdiyi peyğəmbərləri vasitəsiylə etmişdir.

Allah təala, dünyada insanları məsul tutduğu məsuliyyətlərini əhatə edən qulluq vəzifələrindən ibarət olan islam dinini, peyğəmbərləri vasitəsiylə göndərmişdir. Bu elçilər vasitəsiylə kainatın yeganə sahibinin özü olduğunu, özündən başqa sitayiş ediləcək bir varlığın olmadığını bildirmişdir. İnsan oğlunun üstün qabiliyyətlərlə yaradılmasının hikmətinin, əslində bir imtahandan ibarət olduğunu və imtahan müddəti sona çatdığında yenə özünə dönüləcəyini açıqlamışdır. İmtihanı qazanmanın tək yolunun, göndərdiyi peyğəmbərlərə, azad iradə ilə tabe olmaq, özünü tək ilah qəbul etmək və dinin əmrlərinə uymaq olduğunu xəbər vermişdir. Peyğəmbərlərə iman edib, dinlərinin qaydalarını lazımi şəkildə yaşayanların imtihanı qazanaraq, dünya və axirət həyatlarında bəxtiyar olacaqlarını, bunun əksinə azad iradələriylə peyğəmbərləri dinləməyib, şeytanın arxasına düşərək batil dinlər əldə edən-

lərin isə imtahanı itirərək əbədi olan axirət hayatında cəhənnəm deyilən narahatlıq çuxuruna düşəcəklərini bildirmişdir.

Ona qulluq etməsi üçün yaratdığı insana hərəkət azadlığı verən Allah təala, peyğəmbərləri vasitəsiylə göstərdiyi haqq yoldan uzaqlaşanları xəbərdar etmək üçün, yenə peyğəmbərlər göndərmişdir. İnsanlar arasından seçdiyi fəzilətli qullarını, bu məqsədlə elçi olaraq vəzifələndirmiş, insanlara istiqamət verəcək hər cür mesaj və əmrlərini, bu nümayəndələri vasitəsiylə təbliğ etmişdir. Elçilərinə ilahi elmi öyrətmiş və həyatın gerçək qanunlarını izah etmişdir. Ağıl vasitəsiylə çatılması mümkün olmayan qeyb məlumatlarını da peyğəmbərlər vasitəsiylə bildirmişdir.

Dünya səadətini əldə etmək və daha da əhəmiyyətlisi axirətdə xilas olub cənnətə qovuşmaq, peyğəmbərlərə tabe olmaq və göstərmiş olduqları işıqlı yolda getməklə mümkündür. Ancaq insanlar üçün bu heç bir zaman asan olmamışdır. Allah təalanın elçisi vəzifəsini yerinə yetirən peyğəmbərlər, müxtəlif millət və məmləkətlərə göndərilmişlər. Sayları rəvayətlərə görə, minləri hətta yüz minləri aşmışdır. Onlar eyni hidayət yolunun təqibçiləri və eyni vəzifəni icra etmişdirlər. İnsanları Allahın dininə çağırıb, dəvətlərini qəbul edənləri bir ümmət halında birləşdirərək Allahın qanunlarına görə bir nizam qurmaya çalışmışdırlar.

Hər peyğəmbər, özünə verilən bu vəzifəni, tam olaraq yerinə yetirmək üçün bəşər üstü bir cəhd etmişdir. Ancaq imtahan üçün yaradılmış insanların ancaq bir qismi onlara iman etmiş, digərləri isə, onları yalanlamış və onların düşməni olmuşdur. Peyğəmbərləri və gətirmiş olduqları dinləri rədd edənlər, onlara və ümmətlərinə hər cür pislik və işgəncəni etmişdir. İnkarcı müşriklər, peyğəmbərlərin fəaliyyətlərinə son vermək üçün hər yola müraciət etmişlər. Ancaq nəticədə, hər dəfə qurtuluşa çatanlar, peyğəmbərlər və ümmətləri olmuşdur. Allahın yardımıyla onlar dünyada da xoşbəxt sona çatmışlar. Onların gerçək mükafatı isə, şübhəsiz əbədilik yurdu cənnət olacaq. Peyğəmbərləri inkar edənlərə gəlincə bir qismi bu dünyada müxtəlif fəlakətlərlə həlak edilmişlər. Həlak edilən və ya edilməyən inkarçılar, əsl cəzalarını isə, əbədi qalacaqları cəhənnəmdə çəkəcəkdirlər.

Əvvəlki ümmətlər, peyğəmbərlərinin vəfatından sonra, bir müddət haqq din üzrə müsəlman olaraq yaşadılar. Ancaq zamanla bir sıra səhvlərə düşərək,

haqq və həqiqətdən azdılar. Nəticədə, ilahi həqiqəti tamamilə unudub özləri üçün batil dinlər uydurdular. Bu vəziyyətlərdə Allah təala, yenə peyğəmbərləri vasitəsiylə, insanları təkrar-təkrar hidayətə çağırdı. İlk insan və ilk peyğəmbər Hz. Adəm (ə.s) ilə başlayan bu müddət, son peyğəmbər Hz. Məhəmməd (s.ə.s) göndəriləna qədər davam etdi və onunla tamamlandı. Peyğəmbər əfəndimiz (s.ə.s), müəyyən qövmlərə göndərilən əvvəlki peyğəmbərlərin əksinə, bütün insanlığa hidayət rəhbəri olaraq göndərilmiş və vəzifəsi bütün insanlığı haqqa dəvət etmək idi. Hz. Məhəmmədə (s.ə.s) göndərilən islam dini, son ilahi din olduğu üçün, Qurani-Kərim və onun mirası olan sünnə ilə qiyamət gününə qədər olduğu şəkliylə pozulmadan qalacaqdır. Allah təala, bundan sonra qurtuluşa çatmaq istəyənləri, bu dinə girməklə mükəlləf etmişdir. Qurani-Kərimində artıq başqa bir dini qəbul etməyəcəyini açıqlamaqdadır: **"Kim islamdan başqa bir din ardınca gedərsə, (o din) heç vaxt ondan qəbul olunmaz və o şəxs axirətdə zərər çəkənlərdən olar!"**[6]

### B. Qurani-Kərimdəki Peyğəmbər Hekayələrinin Əhəmiyyəti

Peyğəmbərlər tarixi, səbir, dözüm, cəsarət və qəhrəmanlıqlarla doludur. Onların mübarizəsinin bənzərini, digər tarixi liderlərin mübarizələrində görməyimiz imkansızdır. Peyğəmbərlərin həyatları, haqqı hakim etmək yolunda məruz qaldıqları şiddətlərə qarşı səbr, əziyyətlərə qarşı dözüm, batilə qarşı mübarizə hərəkətiylə bəzənmişdir. Onlardakı qüvvətli inanc və iradəni, sərhədsiz dözüm və səbri, digər liderlər və islahatçılarda tapmaq mümkün deyil.

Təbliğçilər, örnək və nümunələrini peyğəmbərlərin mübarizələrindən götürürlər. Dəvət fəaliyyətlərində və bütün davranışlarında onları nümunə almağa çalışırlar. İnananların yeganə nümunələri uca peyğəmbərlərdir. Bu həqiqət Quranda belə qeyd olunur:

**"Şübhəsiz ki, peyğəmbərlərin hekayələrində, ağıl sahibləri üçün ibrətlər vardır.**" [7]

Peyğəmbərlər tarixi, ibrət, öyüd və nümunə götürmək üçündür. Bu heka-

6. Ali-İmran, 3/85.
7. Yusuf, 12/111.

yələr, əvvəlki peyğəmbərlərin başlarından keçənləri izah etmək şərtiylə, sonradan gələn peyğəmbərlər üçün də böyük bir dəstək və mənəvi qaynaq olmuşdur. Bu həqiqət, bəzi ayələrdə belə bəyan edilir:

**“(Ya Rəsulum!) Biz peyğəmbərlərin xəbərlərindən (başlarına gələnlərdən) ürəyini möhkəmləndirəcək (qəlbinə qüvvət verəcək) nə varsa, (hamısını) sənə nağıl edirik. Bu (surə) sənə haqq, möminlərə isə moizə və öyüd-nəsihət olaraq gəlmişdir!”**[8] Yenə Peyğəmbərimizə xitab olaraq belə buyurulmuşdur: **“Bilirik ki, onların (Quran barəsində) dedikləri söz səni çox kədərləndirir. Həqiqətdə isə onlar səni yalançı hesab etmirlər (ürəklərində sənin həqiqi peyğəmbər olduğunu yaxşı bilirlər). Ancaq o zalımlar (müşriklər), Allahın ayələrini inadla inkar edirlər. Səndən əvvəl də peyğəmbərlər təkzibə məruz qalmışdılar. Lakin onlar təkzib olunduqları və əziyyət verildikləri şeylərə dözdülər. Nəhayət, Bizim köməyimiz onlara yetdi. Allahın sözlərini (peyğəmbərlərə verdiyi vədləri) dəyişə biləcək heç bir kimsə yoxdur! Doğrudan da, peyğəmbərlərə aid xəbərlərin bəzisi sənə gəlib çatdı.”**[9]**, “Biz inanan bir tayfa üçün sənə Musanın və Fironun hekayətindən (bir qismini) olduğu kimi söyləyəcəyik.”.** [10]

Peyğəmbər hekayələri, özlərindən əvvəlki inkarçıların başına gələn hadisələrin izah edilməsi baxımından da, kafirlər üçün bir xəbərdarlıq olmuşdur. Bu hekayələrin izah edildiyi çox yerdə, onlardan ibrət götürülməsi istənilmişdir. Bir neçə qövmün başına gələn fəlakətləri xatırlatdığı bir yerdə Uca Allah, belə buyurmaqdadır:

**“Biz etdikləri pozğunluğa (günahlara) görə bu məmləkət əhlinin başlarına göydən bir əzab endirəcəyik!” Həqiqətən, Biz dərindən düşünən bir qövm üçün (baxıb ibrət aslsınlar deyə) o məmləkətdə açıq-aydın bir nişanə (xarabalıq) qoyduq. Mədyənə də qardaşları Şüveybi (peyğəmbər göndərdik). O dedi: “Ey qövmüm! Allaha ibadət edin! Qiyamət gününə inanın! (Dünyada ibadət etməklə qiyamət gününə ümid bəsləyib savab işlər görün. Onun əzabından qorxun!) Yer üzündə fitnə-fəsad törətməyin!” Amma (mədyənlilər) onu təkzib etdilər. Buna görə də onları (dəhşətli) bir**

8. Hud, 11/120.
9. Ənam, 6/33-34.
10. Qəsəs, 28/3.

**sarsıntı (zəlzələ) bürüdü. Onlar dizüstə çöküb evlərində qaldılar (hamısı həlak oldu). Biz Adı və Səmudu da məhv etdik. (Ey Məkkə əhli! Onların başlarına nələr gətirdiyimiz xaraba qalmış) məskənlərindən sizə bəllidir. Şeytan (çirkin) əməllərini onlara gözəl göstərib gözləri görə-görə onları haqq yoldan çıxartdı. Biz Qarunu da, Fironu da, Hamanı da (məhv etdik). Musa onların yanına açıq-aydın dəlillərlə gəldi. Lakin onlar yer üzündə (Misirdə) təkəbbürlük etdilər və (buna görə də əzabımızdan) qoruna bilmədilər! Biz onların hər birini öz günahı ilə yaxaladıq (hərəyə öz günahına görə cəza verdik). Kiminin başı üstünə (qasırğa ilə) qızmar daş yağdırdıq, kimini dəhşətli (tükürpədici) səs yaxaladı, kimini yerə gömdük, kimini də suya qərq etdik. Allah onlara zülm etmirdi, onlar özləri özlərinə zülm edirdilər.”**[11]

Yuxarıda saydıqlarımızı və örnək olaraq göstərdiyimiz ayələrdən də göründüyü kimi peyğəmbərlərin yaşamış olduqları şərəfli, çətin, ibrətli həyat yolunun araşdırılması və öyrədilməsi hər cəhəti ilə bütün insanlar üçün çox vacibdir. Bunu nəzərə alaraq son peyğəmbər olan Hz. Məhəmməd Mustafanın həyatını və ondan sonrakı islam tarixini qələmə almağa başladıq.

### C. Nəbi və Rəsul nə Deməkdir?

**Nəbi:** Uca Allahın, özünə yeni bir şəriət vermədiyi, fəqət insanlara Allahın ona vəhy etdiyini təbliğ etməklə məsul tutduğu kimsəyə deyilir.

**Rəsul:** Uca Allahın, özünə yeni bir şəriət verdiyi və insanlara Allahın ona vəhy etdiyini təbliğ etməklə məsul tutduğu kimsəyə deyilir.

**Risalət:** Peyğəmbərlik mərtəbəsinin ən böyüyünə və ən ucasına deyilir. çünki (məşhur olan görüşə görə;) “hər Rəsul Nəbidir, lakin hər Nəbi Rəsul deyil.”

Nəbilərin sayına gəlincə; onların sayıları, -bəzi rəvayətlərdə ifadə olunduğu üzrə- 120 000-dən artıq göstərilsə də sayları qəti olaraq bilinməməkdədir. Rəsulların sayına gəlincə; onların sayları azdır.

Qurani-Kərimdə keçən peyğəmbərlərin sayı 25 olub özlərinə ayrı-ayrı

11. Ənkəbut, 29/34-40.

iman edilməsi lazımdır. Bunların hamısı, peyğəmbər olub sıralaması isə bu şəkildədir:

Adəm, Nuh, İbrahim, İsmayıl, İshaq, Yaqub, Davud, Süleyman, Eyyub, Yusuf, Musa, Harun, Zəkəriyyə, Yəhya, İdris, Yunus, Hud, Şüveyb, Saleh, Lut, İlyas, Elyesa, Zülkifl, İsa, Hz. Məhəmməd (s.ə.s) Allahın salat və salamı, onların hamısının üzərinə olsun.

Onların peyğəmbərliklərini, şəxsiyyətlərini və adlarını təsdiq edərək onlara ayrı-ayrı iman edilməsi lazımdır. Çünki onlar, Qurani-Kərimin müxtəlif yerlərində xatırlanmaqdadırlar. Qurani-Kərimdə adı keçməyən və hədisdə ifadə olunan Peyğəmbərlərə gəlincə,[12] Quranda xatırlananların xaricində qalanlara, birgə iman edilməsinin vacib olduğu ifadə olunmaqdadır. Çünki, Uca Allah adları Quranda keçən və ya keçməyən peyğəmbərlər haqqında belə buyurmaqdadır:

**“Elə peyğəmbərlər (göndərdik ki,) onların hekayələrini sənə izah etdik. Yenə elə peyğəmbərlər göndərdik ki, onların hekayələrini sənə xəbər vermədik. Allah, Musayla danışdı”.**[13]

Bu peyğəmbərlərdən, on səkkizi,[14] bir arada xatırlanmışdır. Geriyə qalan yeddisi isə, Uca Allahın kitabının müxtəlif ayələrində zikr edilmişdir.

### Ç. Peyğəmbərlər Arasında Üstünlük

Peyğəmbərlər, üstünlük, yer və mövqe cəhətdən eyni dərəcədə olmayıb, əksinə bəziləri, bəzilərindən daha üstündür. Çünki, Uca Allah onlara müxtəlif dərəcələr vermişdir. Bu mövzu da  Allah, Qurani-kərimində belə buyurmaqdadır:

---

12. Qurani-Kərimdə bu 25 peyğəmbərin xaricində peyğəmbər olub olmadıqları mübahisəli olan 7 nəfərin də adı keçməkdədir. 3-nün adı açıqdan keçməkdədir. Bunlar: Xıdır (Kəhf, 18/65-82), Zülqarneyn (Kəhf, 18/83-95), Loğman (Loğman, 31/12-19) dır. 4-nün adından isə açıqdan deyil də, bilavasitə olaraq bəhs edilməkdədir. Bunlar isə, Hızkil (Bəqərə, 2/243), Samuel (Bəqərə, 2/246), İrmiya ya da Üzeyr (Bəqərə, 2/259), Yuşa b. Nun (Kəhf, 18/60-64) dur.
13. Nisa, 4/167.
14. Ənam, 6/83–87.

**“(Ey Rəsulum!) Bu peyğəmbərlərin bəzisini digərindən üstün etdik…”** [15]

Yenə Uca Allah bu mövzuda belə buyurmaqdadır:

**“(Ey Rəsulum!) Rəbbin göylərdə və yerdə olanları (Özünün bütün yaratdıqlarını) çox gözəl tanıyır. Biz peyğəmbərlərin bəzisini digərlərindən üstün etdik və Davuda Zəburu verdik.”**[16]

Ayeyi-kərimələrdə üstünlüklərindən bəhs edilənlər, Qurani-Kərimin “Ulu1-azm” deyə adlandırdığı rəsullardır. Ulul-azm olanlar, peyğəmbərlərin öndə gələnlərindəndir. Uca Allah, Qurani-Kərimin müxtəlif yerlərində onları, gözəl təriflərlə zikr etmiş və elçisi Hz. Məhəmmədə (s.ə.s) də müşriklərlə olan mübarizəsində, onlar kimi mübarizə aparması və səbr mövzusunda da onlara tabe olmaq xüsusunda belə buyurmaqdadır: **“(Ey Rəsulum!) Peyğəmbərlərdən əzm (və səbat, şəriət) sahibləri olanların səbr etdiyi kimi, sən də (Allah yolunda çətinliklərə, əziyyətlərə) səbr et. (Müşriklərə) tez (əzab) gəlməsini istəmə. Onlar vəd olunduqlarını (əzabı) görəcəkləri gün gündüzün ancaq bir saatı qədər (dünyada) qaldıqlarını sanacaqlar. (Bu Quran Allah dərgahından sizə olan) bir xəbərdarlıqdır. Fasiq bir qövmdən başqası da heç məhv edilərmi?! (Əzab gəldikdə ancaq Allahın itaətindən çıxmış fasiqlər məhv ediləcəklər!)”**[17]

Ayədə özlərindən bəhs edilən peyğəmbərlər, “Ulul-azm” deyə adlandırılmışlar. Ulul-azm peyğəmbərlər güclü, qüvvətli olmaları səbəbi ilə məruz qaldıqları müsibətlər şiddətli və qövmləriylə mübarizələri də çətin və ağrılarla dolu olmuşdur.. Bundan ötəri Ulul-azm peyğəmbərlər, uzun zamanlar çətinliklərə və yalanlamalara qarşı səbr etmiş və bu peyğəmbərlərin həyatları boyunca saysız nəsillər və millətlər gəlib keçmişdir. Çünki, bu peyğəmbərlər, uzun ömür sürmüşlər. Lakin, həyatlarının hamısı əzab və çətinliklərlə keçmişdir. Məsələn, Hz. Nuh (ə.s) kimi... O da, qövmü içərisində min ilə yaxın bir zaman yaşamış, lakin, onunla birlikdə iman edənlərin sayı çox az olmuşdur.

Bu Ulul-azm peyğəmbərlərindən bəziləri hüzn  və çətinliklərlə qarşılaşa-

15. Bəqərə, 2/253.
16. İsra, 17/55.
17. Əhqaf, 46/35.

raq, çətin həyat yolu keçmişlər. Hətda, bəzilərini atəşdə yandırılmasına belə hökm vermişlər. Məsələn; Hz. İbrahim Xəlilurrəhman (ə.s) kimi... Lakin, Allah atəşə Hz. İbrahim üçün sərin və zərərsiz olmasını əmr edərək atəşin alovundan onu qurtarmışdır. Uca Allah bu mövzuda belə buyurmaqdadır:

**"Biz də: Ey atəş! İbrahimə qarşı sərin və zərərsiz ol! (Hətta soyuğun belə ona zərər yetirməsin!) - deyə buyurduq. Onlar (İbrahimə) hiylə qurmaq istədilər, lakin Biz onları (cürbəcür müsibətlərə düçar etməklə, xüsusilə üstlərinə ətlərini yeyib qanlarını içən həşərat göndərməklə) daha çox ziyana uğratdıq."**[18]

**1. Peyğəmbərlər Arasında Üstünlük Caizdirmi?**

**"Peyğəmbər Rəbbi tərəfindən ona nazil edilənə (Qurana) inanmış və möminlər də iman gətirmişlər. (Onların) hamısı Allaha, Onun mələklərinə, kitablarına və (bütün) peyğəmbərlərinə iman gətirərək dedilər: "Biz Onun peyğəmbərləri arasında fərq qoymuruq. (Allahın hökmlərini) eşitdik (anladıq) və itaət etdik. Ey Rəbbimiz, bizi bağışla, (axırda) Sənin dərgahına (hüzuruna) qayıdacağıq!"[19]** deyə buyurulduğu halda, Nəbilər ilə Rəsullar arasında necə üstünlük olar?" deyə sual soruşula bilər.

Buna belə cavab verilər: Ayeyi-kərimədəki peyğəmbərlərin arasını ayırmaqdan məqsəd, insanoğlunun, peyğəmbərlərdən bir qisminə iman etməsi və digər qismini də inkar etməsi deməktir. Necə ki, yəhudilər və xristianlar, peyğəmbərlərdən bir qisminin risalətinə iman etmişlər və digər qisminin risalətini isə inkar etmişlər. Buna görə onlar, peyğəmbərlərin arasını beləcə ayırmış olmaqdadırlar.[20]

Peyğəmbərlərin arasını ayırmaqdan (bir qismini digərlərinə üstün tutmaqdan) məqsəd; Uca Allahın açıq Quran nəssiylə, peyğəmbərlərin bir qismini digər bir qisminə üstün tutmasıyla əlaqədar deyil. Çünki Allah, bu mövzuda belə buyurmaqdadır:

---

18. Ənbiya, 21/69-70.

19. Bəqərə, 2/285.

20. Nisa, 4/50-150.

**"(Ey Rəsulum!) Bu peyğəmbərlərin bəzisini digərindəm üstün etdik. Allah bunlardan bəzisi ilə danışmış, bəzisinin isə dərəcələrini yüksəltmişdir. Məryəm oğlu İsaya açıq möcüzələr verdik və onu müqəddəs ruhla (Cəbraillə) qüvvətləndirdik. Əgər Allah istəsəydi, bu peyğəmbərlərin ardınca gələn insanlar onlara göndərilən aşkar dəlillərdən sonra bir-birilәri ilə vuruşmazdılar. Fəqət (bununla belə yenə də) ixtilafa düşdülər. Onlardan bəziləri (Allaha) iman gətirdilər, bəziləri isə kafir oldular. Əgər Allah istəsə idi, onlar bir-biriləri ilə vuruşmazdılar. Lakin Allah Öz istədiyini edər!"**[21]

21. Bəqərə, 2/253.

## I. İSLAMİYYƏTDƏN ƏVVƏL ƏRƏBİSTAN YARIMADASI

### A. Ərəblərin Vəziyyəti

Peyğəmbərimiz Hz. Məhəmməd (s.ə.s) ərəb yarımadasının Hicaz bölgəsində, Məkkə şəhərində doğulmuşdur. Onun həyatını və insanlıq tarixində etdiyi böyük inqilabı qavraya bilmək üçün, yaşadığı əsrdə ərəbistanın ümumi vəziyyətinin və ərəblərin yaşayışının ana xəttləri ilə də olsa, öyrənilməsində fayda vardır.

İslamiyyətdən əvvəl ərəblər, hələ millət halına gələ bilmədikləri üçün qəbilələr halında yaşayırdılar. Hər qəbilə, digərlərindən ayrı bir dövlət kimi idi. Qəbilə başçısına "Şeyx" deyilirdi. Hicaz və Yəmən bölgələrində bəzi şəhərlər qurulmuşsa da, ümumiyyətlə çöllərdə çadır və köçəri həyatı keçirirdilər. Hicaz bölgəsində üç əhəmiyyətli şəhər, Məkkə, Yəsrib (Mədinə) və Taif var idi. Məkkədə Qureyş qəbiləsi, Taifdə Sakif qəbiləsi, Yəsribdə Evs və Həzrəc adlı ərəb qəbilələri ilə Kaynukaoğulları, Nadiroğulları və Kurayzaoğulları olmaqla üç yəhudi qəbiləsi var idi. Digər qəbilələr ümumiyyətlə köçəri idilər.

Qəbilələr arasında qan iddiası və sərhəd kimi səbəblər üzündən döyüş əskik olmazdı. Yalnız ilin dörd ayında (Məhərrəm, Rəcəb, Zilqədə və Zilhiccə aylarında) döyüşməzdilər. Bu aylara "əşhür-i hurum"[22] (döyüşülməsi, qan

---

22. **"Həqiqətən, Allah yanında ayların sayı göyləri və yeri yaratdığı gündən bəri Allahın Kitabında on ikidir. Onların dördü (rəcəb, zilqədə, zilhiccə və məhərrəm) haram aylardır. Bu, doğru dindir (İbrahim və İsmailin gətirdikləri dinin doğru hesabı və hökmüdür). Ona görə də həmin aylarda özünüzə zülm etməyin. Müşriklərin hamısı sizinlə vuruşduqları kimi, siz də onlarla vuruşun və bilin ki, Allah müttəqilərlədir!"** (Tövbə, 9/36).

tökülməsi haram olan hörmətli aylar) deyilir. Bu əsnada, bütün qəbilələr təhlükəsizlik içində səyahət edə bildikləri üçün, ümumiyyətlə böyük yarmarkalar bu aylarda qurulardı. Məkkənin hakimi, Kəbə və ətrafındakı bütlərin qoruyucusu olduqları üçün Qureyş qəbiləsi, digər bütün qəbilələrdən daha çox hörmət sahibi idi. Bu səbəblə Qureyşlilər, ilin hər mövsümündə dilədikləri yerə səyahət edə bilirdilər.[23]

Hicaz bölgəsindəki yarmarkaların ən əhəmiyyətliləri, Məkkə ətrafında qurulmaqda olan Ukaz, Məcənnə və Zülməcaz yarmarkaları idi. Bu yarmarkalara ölkənin dörd bir tərəfindən axın-axın gələnlər arasında satıcılar, iffətsiz qadınlar, şairlər, natiqlər, kahinlər və müxtəlif dinlərə mənsub şəxslər də olurdu. Taiflə Nəhlə arasında qurulmaqda olan Ukaz yarmarkasında, şeir yarışmaları edilər, bəyənilib dərəcə qazanan şeirlər, Kəbənin divarlarına asılardı. Bu şəkildə Kəbə divarında asılmış olan yeddi məşhur şeirə və ya qəsidəyə "əl-Mualləqatus-səba" (Yeddi Asqı) deyilmişdir.

İslamdan əvvəl, ərəblərin əksəriyyəti bütpərəst idi. Düzəltmiş olduqları bir sıra heykəllərə ilah deyə sitayiş edirdilər. Ən əhəmiyyətli bütlər; Hubel, Lat, Mənat, Uzza, Vədd, Suva, Yeğus, Yeuk və Nəsr adlarını daşıyanlar idi. Məkkədə Kəbə və ətrafına 360-a qədər büt yerləşdirilmişdi. Hər qəbilənin ayrı bir bütü, hər bütün xüsusi bir ziyarət günü vardı. Beləliklə, ilin hər günündə bütlərini ziyarətə gələnlərlə dolub daşan Məkkə, bir ticarət mərkəzi olduğu qədər, bütpərəstliyin də mərkəzi halına gəlmişdi.

Ərəbistanda bütpərəstlərdən başqa, yəhudi, xristian, atəşpərəst və sabii dinlərinə mənsub insanlar da vardı. Bunlardan başqa, çox az sayda, Hz. İbrahimin təbliğindən o dövrə çatan dini əsasları mənimsəmiş tək Tanrı inancında olan "Hənif"lər var idi. Varaka b. Novfəl, Abdullah b. Caxş, Osman b. Huveyris və Kuss b. Səidə bunlardan idi. İslamiyyətdən əvvəl ərəb yarımadasının şimalında (Suriyada) "Nəbti", cənubunda (Yəməndə) "Himyəri",

23. **"(Ya Peyğəmbər! Qüreyşlilərə de ki) Qüreyşin ülfəti (dostluğu və ya Allahın onlar üçün səfəri asanlaşdırması) xatirinə, Onlara qış və yay səfərini müyəssər edilməsi (qışda Yəməndə, yayda Şamda istirahət və ticarət edə bilmələri) xatirinə. Bu evin Rəbbinə (Kəbənin sahibi Allaha) ibadət etsinlər! O Allah ki, onları aclıqdan qurtarıb yemək verdi və onlara qorxudan (fil sahiblərinin təhlükəsindən) sonra əmin-amanlıq bəxş etdi."** (Qureyş, 106/1–4).

İraqda isə “Süryani” yazıları istifadə edilirdi. Hicaz ərəbləri Suriya və İraqa ticarət üçün etdikləri səyahətlərdə ərəbcəni Nəbti və Süryani yazıları ilə yazmağı öyrəndilər. Daha sonrakı əsrlərdə, Nəbti yazısından “Nəsix”, Süryani yazısından da “Kufi” deyilən yazı növləri meydana gəlmişdir. Ancaq, ərəblər arasında oxuyub yazma bilənlərin sayı son dərəcə az idi. Comərdlik, qonaqpərvərlik, sözündə durma, düşmənləri belə olsa özlərinə sığınanları himayə, cəsarət, kimi bəzi yaxşı xüsusiyyətlərlə yanaşı soyğunçuluq, faizçilik, zənginləri üstün, kasıbları xor görmə, içki və qumar düşkünlüyü, qəbiləçilik təəssübkeşliyi ilə qan tökmə kimi son dərəcə çirkin adətləri də var idi. Hələ kölə və qadınlara insan dəyəri verməzdilər. Qadınlar, ölən ərindən, atasından və digər yaxınlarından miras ala bilmədikləri kimi, özləri miras malları arasında, mirasçılara qalardı. Kişilər istədikləri qədər qadınla evlənə bilərdilər. Fahişəlik sanki peşə halına gəlmişdi. Buna görə bəzi insanlar qız uşaqlarını diri-diri torpağa basdıracaq dərəcədə vəhşilik göstərmişdilər.[24]

İslamiyyət gəldiyi əsnada tək ərəblər və ərəbistan deyil, bütün dünya, zülm, pozğunluq və cəhalətin qaranlığı içində idi. Maddi və ruhi çətinliklər içində böhrana düşmüş olan insanlıq, bir mürşid, bir qurtarıcı gözləməkdə idi.

Qurani-Kərim *“Cahiliyyət Dövrü”* deyilən bu qaranlıq dövrü, **“İnsanların öz əlləriylə işlədikləri pisliklər üzündən, fəsad (hər tərəfi örtdü) quruda və dənizdə yayıldı.”** [25] ifadəsiylə ən yığcam bir şəkildə izah etməkdədir.

### B. Məkkə və Kəbə

Yer üzündə Allaha ibadət üçün qurulan ilk bina, bütün namazlarda qibləgah olaraq yönəlməkdə olduğumuz Kəbədir.[26] Allahın əmriylə Hz. İb-

---

24. **“Onlardan birinə qızı olması ilə müjdə verdikdə qəzəblənib üzü qapqara qaralar. Verilən müjdənin pisliyi üzündən tayfasından qaçıb gizlənər. (Allah bilir!) Görəsən, onu (o körpəni) zillət içində saxlayacaq, yoxsa torpağa göməcək? (Diri-diri basdıracaq?) Bir görün onlar necə pis mühakimə yürüdürlər! (Oğlanları özlərinə götürüb qızları Allaha isnad edirlər.)”** Nəhl, 16/58–59.
25. Rum, 30/41.
26. Ali-İmran, 3/96.

rahim və oğlu Hz. İsmayıl tərəfindən[27] miladdan 2000 il əvvəl Məkkədə inşa edilmişdir.[28] Təvafa başlama yerinin işarəsi olmaq üçün, Kəbənin cənub-şərq küncündə (Rükn-i Hacər-i Əsvəd) yerləşən "Hacər-i Əsvəd" deyilən qara daşı Hz. İbrahim, Əbu Kubeys dağından gətirərək hələ də orada olan küncə qoymuşdur. İnşaatın tamamlanmasından sonra Hz. İbrahim ilk təvafı oğlu Hz. İsmayılla birlikdə etmiş, bütün insanları həccə, Kəbəni ziyarətə dəvət etmişdir.[29]

Məkkə şəhəri, Hz. Peyğəmbərin (s.ə.s) böyük babalarından Kusay tərəfindən, Kəbənin inşasından çox sonra qurulmuşdur. Allaha ibadət etmək üçün qurulmuş olan Kəbə, zamanla "Tövhid İnancı"nın unudulmasıyla, bütlərlə doldurulmuş, Məkkə bütpərəstliyin mərkəzi halına gəlmişdir.

**1. Məkkə Şəhərinin Qurulması**

Hz. İsmayıl, daha sonra bu bölgəyə yerləşən *"Curhumilər"* dən bir qızla evləndi. Özü İbrani, Curhumilər Yəmənli Aribə (xalis) ərəblərindən idi. Bu səbəblə İsmailoğullarına *"müstarabə (ərəbləşmiş) ərəbləri"* deyilirdi.

Yəməndə *"Seylül-arim"*[30] deyilən sel fəlakətindən sonra bu bölgəyə gələn Huzaa Qəbiləsi, İsmailoğullarının da köməyi ilə, Curhumiləri Məkkədən qovub çıxardılar. Curhumilər, Kəbəyə hədiyyə edilmiş olan qızıl maral heykəlləri ilə digər qiymətli əşyaları Zəmzəm quyusuna atıb, üzərini torpaqla doldurduqdan sonra, quyunun yerini naməlum hala gətirərək Məkkədən qaçdılar. Buna görə Zəmzəm quyusu uzun müddət bağlı qaldı.

Məkkə bölgəsinin hakimiyyəti və Kəbə gözətçiliyi üç əsrə qədər Huzaalılarda qaldıqdan sonra Kusay b. Kilab (Hakim), miladi 5-ci əsrdə Kəbənin gözətçiliyini ələ keçirdi. Qureyşin başına keçərək, Huzaalıları bu bölgədən çıxardı. Kəbənin ətrafında bu günki Məkkə şəhərini qurdu. Ölümündən sonra qəbilə başçılığı və Kəbə gözətçiliyi oğlu Əbdülmanafa, ondan da oğlu

27. Bəqərə, 2/127.
28. Kəbə, hicrətdən təqribən 2793 il əvvəl inşa edilmişdir. Mahmud Esad Efendi, (v. 1336/1917), *Tarih-i Din-i İslam,* II, 7, İstanbul 1319–1329.
29. Həcc, 22/27–29.
30. Səbə, 34/16.

Haşimə keçdi. Haşim ticarət üçün getdiyi Şam səfərində Qəzzədə ölüncə, rifadə (ziyarətçiləri qarşılama və saxlama) və sikayə (ziyarətçilərə su təmin etmə) vəzifələrini kiçik qardaşı Muttəlib öz üzərinə götürdü.

**2. Məkkə və Kəbə ilə Əlaqədar Xüsusi Vəzifələr**

Məkkə şəhərini quran Kusay, şəhərin idarəsi və Kəbəni ziyarətə gələnlərə xidmətlə əlaqədar bəzi vəzifələr təyin etdi. Bu xidmətlər Hz. İsmayılın nəslindən olan şəxslər tərəfindən yerinə yetirilirdi. Bu xidmət və vəzifələrdən bir qismi bunlardır:

1. *Hicabə:* Kəbənin pərdədarlığı və açarlarını daşıma vəzifəsidir.

2. *Siqayə:* Kəbəni ziyarətə gələnlərin suyunu təmin etmə və Zəmzəm quyusuna baxma vəzifəsidir.

3. *Rifadə:* Kəbəni ziyarət üçün Məkkəyə gələnləri qarşılama, saxlama və möhtaclara köməkçi olma vəzifəsidir.

4. *Nədvə:* Kusay tərəfindən qurulan "Darun-Nədvə" adlı müşavirə məclisi binasında edilən yığıncaqlara başçılıq etmək vəzifəsidir. Döyüş, sülh və məmləkətin digər bütün əhəmiyyətli işlərinin qərarı, burada edilən yığıncaqlarda verilərdi. Qırx yaşından kiçik olanlar, bu məclisə alınmazdı.

5. *Liva:* Müharibə zamanında və döyüşcülərin toplanmasında bayrağı daşıma vəzifəsidir.

6. *Qiyadə:* Müharibədə döyüşçülərə əmr etmə vəzifəsidir.

7.*Səfarə:* Eyni cəmiyyət içindəki fərdlər və ya qəbilələr arasında meydana gələn mübahisələrdə hakim olaraq ara düzəltmək xidmətidir.

8. *Xəzinə-i əmval:* Döyüş üçün hazırlanan silah, mal və alətləri mühafizə etmək vəzifəsidir.

9. *Əzlam:* Oxlar ilə fala baxma işidir.

Kəbənin üzərinə qoyulmuş olan Hubel adlı bütün yanında üç fal oxu var idi. Birində: "əmərani rabbi" (Rəbbim mənə əmr etdi); digərində "nəhani rabbi" (Rəbbim mənə qadağan etdi), yazılı idi. Üçünçüsü isə boş idi.

Edəcəyi iş mövzusunda qərar verə bilməyən adam, əzlam işiylə vəzifəli kimsə vasitəçiliyi ilə bu oxlardan birini seçərdi. Birinci ox çıxarsa, hazırladığı işi edər, ikincisi çıxarsa o işdən imtina edərdi. Üçüncüsü çıxarsa, o işi bir il təxirə salar, ertəsi il falı yeniləyərdi.

10. *Nəzarə:* Bir yerdən başqa bir yerə nəql ediləcək şeyləri idarə və muayinə etdikdən sonra "daşıma sənədi" vermə vəzifəsidir.

Ərəblər arasında hər biri böyük bir şərəf sayılan bu xidmət və vəzifələrin hamısı Kusayın əlində olmasına baxmayaraq, daha sonra Qureyş arasında paylaşdırılmışdır.

### 3. Zəmzəm Suyu

Hz. İbrahim, miladdan təxminən 2000 il əvvəl, İraqda Sümer şəhərlərindən "Ur" bölgəsində doğulmuşdur. Peyğəmbər olduqdan sonra, xalqı tək Allaha imana dəvət etdiyi üçün, Babil Hökmdarı Nəmrud tərəfindən atəşə atıldı. Lakin, Allahın əmri ilə atəş onu yandırmadı.[31] Özünə iman edən İbranilərlə Fələstinə köçdü. Bir ara Misirə getdi, orada da özünə iman edən bir kimsə tapa bilmədiyi üçün, təkrar Fələstinə döndü.

Hz. İbrahim, yoldaşı Həcər ilə hələ körpə olan oğlu Hz. İsmayılı Allahın əmri ilə Fələstindən götürüb Məkkəyə, Kəbənin olduğu yerə apardı. Onlara bir dağarcıq xurma və bir tuluq su buraxaraq yanlarından ayrılıb Fələstinə döndü. O əsnada, hələ Kəbə inşa edilməmiş, Məkkə şəhəri qurulmamışdı. Ətrafda nə insan, nə su, nə də həyat əlamətləri vardı.

Hz. İbrahim, yoldaşı və uşağından ayrılıb onları görə bilməyəcək qədər uzaqlaşdıqdan sonra, Kəbənin olduğu yerə yönələrək:

**"Rəbbimiz, zürriyətimdən bir qismini sənin müqəddəs evinin yanında, əkin bitməyən (quraq), bir vadi içində yerləşdirdim. Rəbbimiz, (beytində) namaz qılmaları üçün, insanlardan bir qisminin könüllərini onlara meyl etdir, şükr etmələri üçün onları meyvələrlə ruziləndir."**[32] deyə dua etdi və uzaqlaşıb getdi.

---

31. Ənbiya, 21/69–70.
32. İbrahim, 14/37.

Yanlarındakı xurma və su qurtardıqdan sonra, Həcər uşağını olduğu yerdə buraxıb, bir nəfər görə bilmək və bir neçə qurtum su tapa bilmək ümidiylə Səfa ilə Mərvə təpələri arasında gedib gəldiyi əsnada bir mələk, dabanıyla Zəmzəm suyunu ortaya çıxarmışdı. Həcər bu sudan doya-doya içdi, uşağını əmizdirdi və Allaha həmd etdi.

### C. Şeybənin Adı Əbdülmüttəlib Qaldı

Haşim, Mədinədə Həzrəc qəbiləsinin Nəccar oğulları qolundan Səlma bint Amr ilə evlənmiş, "Şeybə" adında bir oğlu olmuşdu. Səlma Mədinədən ayrılmadığı üçün, Şeybə də Mədinədə dayılarının yanında böyümüşdü. Haşimin vəfatından sonra, əmisi Müttəlib onu Məkkəyə gətirdi. Məkkəlilər Müttəlibin yanında tanımadıqları bir uşaq görüncə, Şeybəni Müttəlibin köləsi sanaraq, ona "Əbdülmüttəlib" dedilər. Buna görə Şeybə, Əbdülmüttəlibin adıyla tanındı.

### 1. Zəmzəm Quyusunun Təmizlənməsi

Müttəlibin ölümündən sonra, qəbilə başçılığı ilə Rifadə və Sikayə vəzifələri Əbdülmüttəlibə verilmişdir. Əbdülmüttəlib, Zəmzəm quyusunun yerini tapıb yenidən qazdırdı. Curhumilərin Məkkədən qaçarkən quyuya atdıqları qızıl maral heykəlləri, qılınc və zirehlər çıxarılaraq quyu təmizləndi. Bununla da zəmzəm quyusunun idarəsi Əbdülmüttəlib oğullarında qaldı.

### Ç. İki Qurbanlığın Oğlu

Əbdülmüttəlib, 10 oğlu olması halında, bunlardan birini Allah üçün qurban etməyə söz vermişdi.[33] Bu köhnə adət, bizə Hz. İbrahimin gördüyü bir yuxu səbəbiylə oğlu Hz.İsmayılı qurban etmək istəməsini xatırlatmaqdadır.[34]

---

33. İbn Hişam, Əbdülməlik (v. 218/834), *əs-Siyrətü'n Nəbəviyyə*, I, 160, Beyrut 1391/1971; İbnu'l-Əsir, Əli b. Məhəmməd əş-Şeybani (v. 630/1232), *əl-Kamil fi't-tarix*, II, 5, Beyrut, 1385/1965; İbn Sad, Əbu Abdullah Məhəmməd (v. 230/844), *ət-Tabakatu'l-Kubra*, I, 88, Beyrut 1398/1978.
34. Saffat, 37/102-110.

Əbdülmüttəlib, müxtəlif yoldaşlarından 10 oğlu olunca aralarında püşk ataraq əhdini yerinə yetirmək istədi. Püşk nəticəsinə görə, Rəsulullahın (s.ə.s) atası olacaq olan Abdullahın qurban edilməsi lazım idi. Bir arrafənin (qadın kahin) tövsiyəsinə uyğun olaraq müəyyən sayda dəvə ilə Abdullah arasında püşk atıldı. Püşk Abdullaha düşdükcə, dəvələrin sayı 10 dəvə daha artırıldı və yenidən püşk çəkildi. 10 dəvə ilə başlayan püşk çəkilişi, dəvələrin sayı 100 olanda nəhayət püşk dəvələrə düşdü.[35] Beləcə Abdullahın yerinə 100 dəvə qurban edildi. Bu hadisəyə və nəslindən gəldiyi Hz. İsmayılın qurban edilməsi təşəbbüsünə işarəylə Rəsululllah (s.ə.s) əfəndimizin: "Mən iki qurbanlığın oğluyam"[36] buyurduğu nəql edilmişdir. O zamana qədər 10 dəvə olan bədəl (öldürülən bir kimsənin qan əvəzi) də, bu hadisədən sonra, 100 dəvəyə yüksəlmişdir.[37] İslam hüququnda qan əvəzinin 100 dəvə olması, zamanla ənənə halına gələn bu hadisəyə əsaslanmaqdadır.

### D. Fil Hadisəsi (571 m.)

Həbəşistan krallığının Yəmən valisi Əbrəhə, xristianlığı ərəbistanda yaymaq və ərəbləri Kəbə ziyarətindən uzaqlaşdırmaq üçün, Sənada möhtəşəm Külleys adlı bir kilsə inşa etdirmişdi. Lakin, ərəblərdən bu kilsəyə maraq göstərən olmadı. Üstəlik, Kinanə qəbiləsindən bir ərəb, bir gecə gizlicə kilsənin içini pislədi. Əbrəhə bunu bəhanə edərək böyük bir ordu ilə Kəbəni yıxmaq üçün Məkkəyə hücuma keçdi. Ərəblərin bu orduya qarşı mübarizə aparacaq gücləri yox idi. Məkkəlilər şəhəri boşaldaraq ətrafdakı dağlara çəkildilər.

Əbrəhə, Məkkə yaxınlığında qərargahını qurdu. Qureyş qəbiləsinin rəisi olan Əbdülmüttəlibə elçi göndərərək, qan tökmək üçün deyil, yalnız Kəbəni yıxmağa gəldiyini bildirdi. Bu əsnada Əbrəhənin qabaqcıl qüvvələri məkkəlilərin sürülərini oğurlayıb öz qərargahlarına aparmışdılar. Bunlar arasında Əbdülmüttəlibin də yüz dəvəsi var idi. Əbdülmüttəlib, Əbrəhəyə gedərək oğurlanan sürülərin geri verilməsini istədi. Əbrəhə:

-"Mən, Kəbəni yıxmamağım üçün xahişə gəldiyini sanmışdım. Görürəm

35. İbn Hişam, *e.a.ə.*, I, 160-164; İbnu'l-Əsir, *e.a.ə.*, II, 6-7.
36. Acluni, *Kəşfu'l-Xafa*, I, 199 (Hədis No: 606), Beyrut 1351.
37. İbn Hişam, *e.a.ə.*, I, 163.

ki, sən dəvələrinin dərdindəsən, bunu sənə yaraşdırmadım...” deyincə, Əbdülmüttəlib böyük bir təmkinlə:

-“Mən, dəvələrin sahibiyəm, onları istəyirəm. Kəbənin də sahibi var. Onu sahibi qoruyacaq” deyə cavab vermişdi. Bu cavab qarşısında Əbrəhə, Əbdülmüttəlibin dəvələrini və məkkəlilərin oğurlanan bütün mallarını geri verdi.

Qurani-Kərimdə də açıqlandığı kimi, Əbrəhə məqsədinə çata bilmədi. Kəbəni yıxmaq üçün hücuma keçiləcəyi əsnada, Əbrəhənin hər səfərində özüylə bərabər apardığı Mahmu (Mahmud) adlı böyük fil ilə digər filləri hər cür səyə baxmayaraq, yerlərindən tərpədə bilmədilər. Hətda, diz çöküb olduqları yerdə qaldılar. Kəbə tərəfinə gedə bilmədilər. Bu əsnada göy üzündə sürü-sürü quşlar, ağızlarında və pəncələrində daşıdıqları kiçik daşları Kəbəyə hücuma hazırlaşan döyüşçülərin üstünə atdılar. Əbrəhənin böyük ordusu bir anda pərişan oldu.[38] Böyük bir qismi orada həlak oldu. Qaçıb xilas ola bilən döyüşçülərin bir qismi ilə Əbrəhə Sənaya dönsə də, düçar olduğu xəstəlikdən xilas ola bilməyərək çox keçmədən öldü.

Ordunun qarşısında yeriyən fillər səbəbiylə, tarixdə bu hadisəyə *“Fil Hadisəsi”*, bu hadisənin meydana gəldiyi ilə də *“Fil İli”* deyilmişdir.

---

38. Fil, 105/1–5; Rəsullulah (s.ə.s) əfəndimiz, Fil hadisəsindən təxminən 52 gün sonra dünyaya gəldiyi üçün bu hadisəni görməmişdir. Lakin, bu surə endiyi əsnada bu hadisə o qədər yaxşı bilinirdi ki, həyatda olanlardan, hadisəni görməmiş olanlar da sanki görənlər qədər hadisədən xəbərdar idi. Bu səbəblə Hz. Məhəmmədə (s.ə.s) hadisə zamanında dünyaya gəlməmiş olduğu halda “görmədinmi?” buyurulmaqdadır. Burada görmək, “bilmək və eşitmək” mənasında ifadə edilmişdir.

## I. Hz. MƏHƏMMƏDİN (s.ə.s) UŞAQLIQ DÖVRÜ

### A. Doğumu

“**Biz səni ancaq aləmlərə rəhmət olaraq göndərdik”.** (Ənbiya 21/107)

Hz. Məhəmməd (s.ə.s), miladdan sonra 571-ci il, (Fil ilində) 12 Rəbiüləvvəl (20 Aprel) bazar ertəsi gecəsi səhərə yaxın, Məkkənin şərqində olan “Haşimoğulları məhəlləsi”ndə, atasından ona miras qalan evdə doğulmuşdur. Ərəblərin təqvim başı olaraq istifadə etdikləri “Fil Hadisəsi”, Peyğəmbərimizin (s.ə.s) doğumundan 52 gün əvvəl olmuşdu.[39]

Əbdülmüttəlib, nəvəsinin doğulması şərəfinə verdiyi ziyafətdə uşağın adını soruşanlara:

*“Məhəmməd adını verdim. Diləyirəm ki, göydə Haqq, yer üzündə xalq, onu xeyrlə yad etsinlər...”* cavabını verdi. Anası da *“Əhməd”* dedi. (Məhəmməd, üstünlük və üstünlükləri xatırlanaraq çox-çox təriflənib mədh edilən; Əhməd də Allah təalanı uca sifətləri ilə tərifləyən, həmd edən kimsə deməkdir).[40] İslam tarixçiləri, Peyğəmbərimizin (s.ə.s) doğulduğu gecə bir

---

39. Siyər və islam tarixi müəllifləri, Rəsulullahın (s.ə.s) doğulmasının Rəbiüləvvəl ayında bir bazar ertəsi günü səhərə yaxın olduğunda ümumiyyətlə ittifaq etsələrdə, neçənci günü olduğu mövzusunda ixtilafdadırlar. Rəsulullah (s.ə.s) 1 Rəbiüləvvəl 11 h. /27 May 632 m. tarixinə rast gələn bazar ertəsi günü günortadan sonra vəfat etmişdir.

40. Peyğəmbərimizin ən məşhur və Qurani-Kərimdə keçən adları; “Məhəmməd” və “Əhməd”dir. Məhəmməd (s.ə.s) adı Qurani-Kərimdə 4 yerdə (Ali-İmran 3/144, Əhzab, 33/40, Məhəmməd, 47/2 və Fəth, 48/19); Əhməd adı isə 1 yerdə (Saf, 61/6) keçməkdədir. Fəth surəsində bu ad ayrıca “Rasulullah” olaraq xüsusiyyətlənmişdir. Saf surəsinin 6-cı ayəsində

sıra fövqəladə hadisələrin meydana gəldiyini nəql edirlər. O gecə İran Kisrasının Mədain şəhərindəki sarayının 14 sütunu yıxılmış, atəşpərəstlərin İranda İstahrabat şəhərində min ildən bəri yanmaqda olan "atəşgahları" sönmüş, Sava (Təbəriyyə) gölü yerə batmış, min ildən bəri qurumuş olan Səmavə dərəsinin suları daşmış, atəşpərəstlərin böyük alimi Mudiban qorxunc bir yuxu görmüş, Kəbədəki bütlərin üz üstü aşdıqları görülmüşdü. Həqiqətən onun doğulması ilə bütün dünyada hökm sürməkdə olan cəhalət və küfr atəşi sönmüş, bütpərəstlik yıxılmış, zülmün təzyiqi sona çatmışdır.

### B. Soyu (Nəsəbi)

Peyğəmbərimiz Hz. Məhəmmədin (s.ə.s) atası, Əbdülmüttəlibin oğlu Abdullah, anası isə Vəhbin qızı Əminədir. Atası Abdullah, Qureyş qəbiləsinin Haşimoğulları qolundan, anası Əminə isə Zührəoğulları qolundandır. Hər ikisinin soyu *"Kilab"* da birləşməkdədir. Hər ikisi də Məkkəlidir.

Peyğəmbər (s.ə.s) əfəndimiz, Hz.İbrahimin böyük oğlu Hz. İsmayılın nəslindəndir. Soyu Adnana qədər müəyyəndir.[41] Adnan ilə Hz. İsmayıl arasındakı nəsillərin sayında nəsəb alimləri ixtilaf etmişlər.[42]

Peyğəmbər (s.ə.s) əfəndimizin soyu, çox təmiz və çox şərəfli bir nəsəbdir. Bir hədisi-şərifdə Rəsuli-Əkrəm əfəndimiz:

*"Mən dövrdən dövrə (nəsildən nəsilə, ailədən ailəyə) seçilərək keçən Adəmoğulları soylarının ən təmizindən gəldim, nəticədə içində olduğum*

---

isə: **"Məryəm oğlu İsa: Ey İsrailoğulları! Doğrusu mən, məndən əvvəl endirilən Tövratı təsdiq edici, məndən sonra gələcək və adı Əhməd olacaq bir peygəmbəri də müjdələyici olaraq, Allahın sizə göndərilmiş bir peyğəmbəriyəm demişdi... "** buyurulmuşdur. Bu ayədə Hz. İsanın, özündən sonra "Əhməd" adında bir peyğəmbərin gələcəyini müjdələdiyi bildirilməkdədir.

41. Hz. Məhəmmədin (s.ə.s), babalarından Adnana qədər bilinən nəsəbi sırasıyla belədir: Abdullah, Əbdülmüttəlib, Haşim, Əbdüménaf, Kusay, Kilab, Mürrə, Kab, Lüey, Qalib, Fihr (Qüreyş), Malik, Nadr, Kinanə, Huzeymə, Müdrikə, İlyas, Mudar, Nizar, Məadd, Adnan, Anasının nəsəbi isə belədir: Vəhb, Əbdümənaf, Venera, Kilab, Mürrə...Görüldüyü kimi hər iki tərəfin nəsəbi Kilabda birləşməkdədir. Bax: Buxari, IV, 238; İbn Hişam, *e.a.ə.,* I, 1-2.

42. Ayni, *Umdətu'l-Qari*, VIII, 54; Kamil Miras, *Təcrid-i Sərih Tərcüməsi*, X, 43, (ilk üç cildi Ahmet Naim tərəfindən hazırlanmışdır.) İstanbul, 1928-1948.

*"Haşimoğulları" ailəsində doğuldum"*, buyurmuşdur.[43]

Digər bir hədisi-şərifdə bu seçilmə işi belə izah edilmişdir.

*"Allah, Hz İbrahimin oğullarından Hz. İsmayılı, İsmailoğullarından Kinanəoğullarını, Kinanəoğullarından Qureyşi, Qureyşdən Haşimoğullarını, Haşimoğullarından da məni seçmişdir."*[44]

Bir başqa hədisi-şərifində də Rəsuli-Əkrəm əfəndimiz belə buyurmuşdur:

*"Allah məni, daim halal ataların sulbündən, təmiz anaların rəhminə nəql edərək, sonunda atamla anamdan izhar etdi. Adəmdən, ana-atama gələnə qədərki nəsəbim içində nikahsız birləşən olmamışdır".*[45]

Hz. Məhəmmədin (s.ə.s) doğumundan təxminən iki ay əvvəl atası Abdullah, Suriya səyahətindən dönərkən Yəsribdə xəstələnərək 25 yaşında vəfat etmiş və orada dəfn edilmişdi. Peyğəmbərimizə (s.ə.s), atasından miras olaraq beş dəvə, bir çox qoyun, doğulduğu ev və kunyəsi Ümmü Eymən olan Həbəşli Bərəkə adlı bir xidmətçi qalmışdır.[46]

## C. Hz. Məhəmməd (s.ə.s) Süd Anasının Yanında

Təzə doğulan Məhəmmədi 3 və ya 7 gün anası Əminə əmizdirdi.[47] Südü çatmadığı üçün, daha sonra əmisi Əbu Ləhəbin xidmətçisi Süveybə tərəfindən əmizdirildi.[48]

Lakin, Hz. Məhəmmədin (s.ə.s) davamlı süd anası Həvazin qəbiləsinin Sadoğulları qolundan Həlimə olmuşdur.

---

43. Buxari, IV, 166; Kamil Miras, *e.a.ə*, IX, 316 (Hədis No: 1454) və X, 44.
44. Müslim, Əbul-Hüseyin Müslim b. el-Haccac b. Müslim el-Quşeyri, (v. 261/875), *əl-Camiu's-səhih*, Qahirə, 1374-1375 h/1954-1955 m. IV, 1782 (Hədis No: 2276).
45. İbn Kəsir, Əbul-Fida İsmayıl b. Ömər, (v. 774/1373), *el-Bidayə və'n-Nihayə*, II, 255–256, Beyrut, 1966.
46. Şibli, Mevlana və Süleyman Nedvi, *Əsr-i Səadət,* I, 187, (tərc., Ömer Rıza Doğrul) İstanbul, 1346-1353 h./1928-1935 m.
47. Mahmud Esad Efendi, *e.a.ə.,* II, 16.
48. İbnu'l-Əsir, *e.a.ə.,* I, 459; İbn Sa'd, *e.a.ə.*, I, 108.

Məkkənin havası ağır olduğu üçün, məkkəlilər yeni doğulan uşaqlarını çöldən gələn süd analara verərdilər. Çöl iqlimində uşaqlar həm daha sağlam yetişir, həm də pozulmamış (fəsih) ərəbcə öyrənirdilər. Hz. Məhəmməd də (s.ə.s) bu adətə görə süd anası Həliməyə verildi. Həlimə, yetim bir uşağı əmizdirməyin qazanclı bir iş olmayacağı düşüncəsiylə, başlanğıcda tərəddüd göstərsə də, daha sonra bu uşağın evlərinə uğur və bərəkət gətirdiyini görmüş və onu öz uşaqlarından daha çox sevmişdir. Süd qardaşı Şeyma da balaca Məhəmmədə baxmaqda anasına köməkçi olmuşdur.[49]

Hz. Məhəmməd (s.ə.s) süd anası və süd qardaşları ilə sonrakı illərdə daim maraqlanmışdır. Həlimə özünü ziyarətə gəldiyi zaman onu "anacan" deyərək qarşılamış, altına paltarını sərərək hörmət göstərmişdir.[50]

Hz. Məhəmməd (s.ə.s) dörd yaşına qədər, süd anasının yanında çöldə qaldı. Dörd yaşında Həlimə uşağı Məkkəyə apararaq anasına təslim etdi. İslam tarixçiləri, bu əsnada *"şaqq-ı sadr"* (sinə açma) hadisəsinin meydana gəldiyini, uşaqda görülən bu kimi fövqəladə halların Həliməni narahatlandırdığını, buna görə də Məhəmmədi anasına təslim etməyə məcbur qaldığını nəql edirlər. [51]

**Ç. Mədinə Ziyarəti**

Hz. Məhəmməd (s.ə.s) dörd yaşından altı yaşına qədər, öz anası Əminə ilə bərabər qaldı, onun şəfqət və qayğısı ilə yetişib böyüdü. Altı yaşında ikən, atasının Mədinədə olan qəbrini ziyarət etmək üçün, anası və sadiq xidmətçiləri Ümmü Eymənlə birlikdə Mədinəyə getdilər. Mədinədəki qo-

---

49. İbnu'l-Əsir, *e.a.ə.,* I, 460.
50. Mansur Ali Nasıf, *ət-Tacul-Cami-ili-Usul fi Əhadisur-Rusul*, V, 6, Qahirə, 1382/1962.
51. İbn Hişam, *e.a.ə.,* I, 174; Məhəmməd Həmidullah, *İslam Peyğəmbəri,* I, 40, (tərc., Said Mutlu və Salih Tuğ), İstanbul 1385-1388/1966-1969; Rəsulullahın (s.ə.s) həyatında şaqq-ı sadr hadisəsi bir neçə dəfə olmuşdur. Birinci dəfə, süd anası Həlimənin yanında ikən meydana gəlmişdir. Mələklər, sinəsini açıb, "şeytanın səndəki nəsibi" deyərək bir pıxtı qan çıxarıb atmışlar. (Müslim, I, 147). İlk vəhyin gəlişindən əvvəl də, vəhyin ağırlığına dayanabilmisi üçün, şaqq-ı sadr hadisəninin təkrarlandığı rəvayət edilmişdir. Merac möcüzəsindən əvvəl də Cəbrayıl (ə.s.), Rəsulullahın (s.ə.s) sinəsini açıb "zəmzəm suyu" ilə yuduqdan sonra iman və hikmət doldurmuşdur. Kamil Miras, *e.a.ə.,* II, 227, (Hədis No: 227).

humları Nəccaroğullarında bir aya qədər qonaq qaldılar. Dönüşdə, Mədinənin 23 mil (1 mil 1848 metr) cənubunda Əbva kəndində Əminə xəstələndi.[52] Hələ doğulmadan atasından yetim qalmış olan Hz. Məhəmməd (s.ə.s) altı yaşında ikən anasından da yetim qalırdı. Bu ağrını bütün varlığı ilə hiss edən ana, oğlunu şəfqət dolu gözlərlə süzdü. Bağrına basıb uzun-uzun öpdü. Günahsız üzünə baxaraq: *"Hər yeni köhnələcək, hər fani yox olub gedəcək. Mən də öləcəyəm, lakin buna qəm etmirəm. Adımı əbədi edəcək xeyirli bir xələf buraxıram..."* mənasında bir şeir söylədi. Bu sözlərdən sonra vəfat etdi.[53]

Anasının ölümündən sonra uşağı Ümmü Eymən Məkkəyə aparıb babası Əbdülmüttəlibə təslim etdi.

Altı yaşından səkkiz yaşına qədər, uşağa babası Əbdülmüttəlib baxdı. Əbdülmüttəlib səksən yaşını keçmiş bir qoca idi. Peyğəmbər (s.ə.s) əfəndimiz səkkiz yaşında ikən babası da öldü. Ölərkən, on oğlu içindən Hz. Məhəmməd (s.ə.s) əfəndimizin yetişdirilməsini, doğma əmisi Əbu Talibə həvalə etdi.[54]

İllər sonra, hicrətin 6-cı ili Hudeybiyə müqaviləsindən qayıdarkən Rəsulullah (s.ə.s) əfəndimiz, anasının qəbirini ziyarət edib, çox hüzünlü bir halda ağlamışdı.

Anamın mənə olan şəfqətini xatırlayaraq ağladım, buyurdu.[55]

## II. Hz. MƏHƏMMƏDİN (s.ə.s) GƏNCLİK DÖVRÜ

### A. Əbu Talibin Himayəsində

Peyğəmbərimizin həyatının səkkiz yaşından iyirmi beş yaşına qədər olan

52. İbn Hişam, I, 177; Kamil Miras, *e.a.ə,* IV, 699.
53. Mahmud Esad Efendi, *e.a.ə.,* II, 23; Kamil Miras, *e.a.ə.,* II, 699.
54. Əbdülmüttəlibin müxtəlif arvadlarından 10 oğlu və 6 qızı vardı. Bunlar içində Hz. Əlinin atası Əbu Talib ilə Peyğəmbərimizin (s.ə.s) atası Abdullah doğmaca qardaş idi. Bax: Mahmud Esad Efendi, *e.a.ə.,* II, 27; Oğulları: Abbas, Həmzə, Abdullah, Əbdimənaf, Zübeyr, Haris, Hacl, Mukavvim, Dırar, Əbu Ləhəb (əsl adı Əbduluzza) dir. Qızları isə: Safiyyə, Ümmü Hakim əl-Beydə, Cəldə, Ümeymə, Ərava, Bərrə. Bax: İbn Hişam, *e.a.ə.,* I, 113.
55. İbn Sad*, e.a.ə.,* I, 116-117; Kamil Miras, *e.a.ə.,* IV, 683.

dövrünə *“gənclik dövrü”* deyilir. Bu dövrdə Rəsulullah (s.ə.s) əmisi Əbu Talibin yanında, onun himayəsi altında qalmışdır.

Əbu Talib, ağıllı və alicənab bir şəxs idi. Zəngin olmamaqla birlikdə, zadəganlığı və alicənablığı səbəbiylə hər kəsdən hörmət görürdü. Qardaş oğlu Hz. Məhəmmədi çox sevir, heç yanından ayırmazdı.

**B. Şam Səyahəti**

Məkkə iqlimi əkinçiliyə əlverişli olmadığından, Məkkədə ticarətlə məşğul olur, uşaqlarına da ticarəti öyrədərdilər. Ticarət üçün karvanlarla, yayda Şama, qışda Yəmənə səyahət edərdilər. Əbu Talib də digər Məkkəlilər kimi karvan ticarəti edirdi. Bir dəfə Şama gedərkən, Hz. Məhəmmədə (s.ə.s) əmisindən ayrılmaq çətin gəldi və onu da yanında aparmasını istədi. Əbu Talib çox sevdiyi qardaşı oğlunu qırmadı. Onu da özüylə karvanda apardı. Bu əsnada hələ o on iki yaşında idi.

Şamın 90 km cənubunda Busra (köhnə Şam) deyilən qəsəbədə “Bahira” adında bir xristian rahibi var idi. Qəsəbəyə gələn karvanlarla heç maraqlanmadığı halda, Hz. Məhəmmədin (s.ə.s) içində olduğu karvanı qarşılayaraq bütün karvana bir ziyafət verdi. Bahira oxuduğu müqəddəs kitablardan əldə etdiyi məlumatlarla, Hz Məhəmmədin (s.ə.s) simasından, onun gələcəyini sezmişdi. Onunla danışdı. Suallar soruşdu. Aldığı cavablar, qənaətini qüvvətləndirdi. Şam səfərinin bu uşaq üçün təhlükəli olacağını düşündü və Əbu Talibə:

-*“Bu uşaq son peyğəmbər olacaq. Şam Yəhudiləri içində onun əlamət və xüsusiyyətlərini bilən kahinlər vardır. Tanisalar xəyanət və pislik edərlər. Bu uşağı Şama aparmayın. ..”*dedi. Bu sözlərdən sonra Əbu Talib Şama getməkdən imtina etdi. Ticarətini burada bitirib, geri döndü.[56]

Son Peyğəmbərin gələcəyi və onun bir çox xüsusiyyətləri Tövrat və İncildə bildirilmişdi. Bu səbəblə, Yəhudi və Xristian alimləri, onun əlamətlərini və xüsusiyyətlərini bilirdilər. Hicrətdən sonra Müsəlman olan Mədinəli Yəhudi alimi Abdullah İbn Salamın *“Tövratda Hz. Məhəmməd (s.ə.s) və Hz. İsanın (a.s.) sifətləri vardır”* dediyini, *“Kutub-i Sittə”* deyilən

56. Tirmizi Məhəmməd b. İsa Sərvər (v. 279/892), *əs-Sünən,* V, 590-591 (Hədis No: 3620), Qahirə 1385/1965; İbn Hişam, *e.a.ə.,* I, 91-194; İbnu’l-Əsir, *e.a.ə.,* II, 37.

altı etibarlı hədis kitabından biri olan Tirmizinin *"əs-Sünən"* ində rəvayət edilmişdir."[57]

### 1. Gülünc Bir İddia

Hz. Məhəmmədin (s.ə.s) 12 yaşında etdiyi bu səyahətdə rahib Bahira ilə görüşməsini, bəzi xristian yazarlar, xristianlığın bir zəfəri kimi göstərmək istəmişlər. Peyğəmbərimizin (s.ə.s) bütün dini əsasları bu rahibdən öyrəndiyini iddia etmişdilər.

Bu iddia son dərəcə gülünc və əsassızdır. On iki yaşındakı bir uşağın, islam kimi mükəmməl bir dinin əsaslarını bir neçə saatlıq görüşmə əsnasında öyrənməsi mümkün deyil. Bu rahib bu əsasları bilsəydi, özü təbliğ edərdi. Əgər burada belə bir mövzu danışılsaydı, karvanın gözü qarşısında edilən bu danışma ağızdan ağıza yayılardı. Peyğəmbərliyini elan etdiyi zaman inanmayanlar, *"bunlar Bahiranın sözləridır"* deməzdilərmi? Üstəlik islamiyyət, xristianların *"təslis"* (üçlü tanrı sistemi) inancını tamamilə rədd etmiş "Tövhid inancını" gətirmişdir. Görüldüyü kimi, bu iddia son dərəcə əsassız və çirkin bir böhtandan başqa bir şey deyildir.

Hz. Məhəmməd (s.ə.s) 17 yaşında olarkən, digər bir ticarət karvanı ilə əmilərindən Zübeyr və Abbasla birlikdə Yəmənə gedib gəlmişdir.[58]

### C. Ficar Döyüşünə Qatılması

İslamdan əvvəl (Cahiliyyət dövründə) ərəblər arasında vətəndaş müharibələri əskik olmazdı. Yalnız "Əşhur-i hurum" deyilən dörd ayda döyüşmək haram sayılardı. Bu dörd ayda (Zilqədə, Zilhiccə, Məhərrəm, Rəcəb) döyüş ediləcək olsa belə bu günah sayıldığı üçün buna "Ficar Döyüşü" deyilirdi.

Qureyş qəbiləsi ilə Həvazin qəbiləsi arasında qan davası üzündən bir döyüş başlamış, dörd il davam etmişdir. Döyüş, qan tökülməsi haram olan aylarda da davam etdiyi üçün buna "Ficar Döyüşü" deyilmişdir.

---

57. Tirmizi, V, 588, (Hədis No: 3617).
58. Mahmud Esad Efendi, *e.a.ə.,* II, 33.

Peyğəmbərimiz (s.ə.s) iyirmi yaşlarında olarkən bu döyüşə əmiləri ilə birlikdə qatıldı. Lakin kimsəyə ox atmamış, kimsənin qanını tökməmişdir. Yalnız qarşı tərəfdən atılan oxları yığıb, əmilərinə vermişdir.[59]

**Ç. Hılful-Fudul Cəmiyyətinə Üzvlüyü**

Uzun sürən Ficar döyüşü əsnasında Məkkədə asayiş pozulmuş, can və mal təhlükəsizliyi qalmamışdı. Xüsusilə çöldən mal gətirən xaricilərin malları yağmalanırdı.

As b. Vail Məkkəyə gələn Yəmənli bir tacirin bütün malını qəsbetmiş, haqsız olaraq əlindən almışdı. Yəmənli, Əbu Kubeys dağına çıxaraq məruz qaldığı haqsızlığa qarşı, bütün qəbilələri köməyə çağırdı. Yəmənlinin bu fəryadı üzərinə Peyğəmbərimizin (s.ə.s) əmisi Zübeyr, Qureyşin bütün irəli gələnlərini çağırdı. Haşimoğulları, Zührəoğulları, Əsədoğulları, Təmimoğulları, Əbdülluzzaoğulları, Zübeyrin dəvətinə razılıq edərək, Bəni Təmimdən Abdullah b. Cüdanın evində toplandılar. "Məkkədə zülmü önləməyə yerli-xarici heç kimə qarşı haqsızlıq etdirməməyə" qərar verdilər. Haqsızlığa məruz qalanlara kömək edəcəklərinə and içdilər. Yəmənlinin haqqını Asdan alıb geri verdilər. Bununla da Məkkədə asayişi bərpa etdilər.

Vaxtilə, Curhumilər zamanında Fadl b. Haris, Fudayl b. Vidaya və Mufaddal b. Fədala adlarında üç qəbilə başçısı, qəbilələri ilə toplanaraq, "Məkkədə zülmə meydan verməyəcəyik, zəiflərin haqqını ədalət üzrə alacağıq. .."[60] deyə and içmişdilər. Onların bu andlarına "Hılful-fudul" (Fadıllar andı) deyilmişdi. Abdullahın b. Cüdanın evində eyni mövzuda edilən anda da bu səbəblə "Hilful-fudul" deyildi.

Peyğəmbərimiz (s.ə.s) 20 yaşında ikən bu yığıncaqda əmiləri ilə birgə üzv olaraq iştirak etmişdi. Bu cəmiyyətin işlərindən son dərəcə məmnun qaldığını peyğəmbərliyindən sonra: *"İslamda da belə bir cəmiyyətə çağrılsam, yenə razı olardım"* sözlərilə ifadə etmişdir.[61]

59. İbn Hişam, *e.a.ə.,* I, 198.
60. İbnu'l-Əsir, *e.a.ə.,* II, 41.
61. Mahmud Esad Efendi, *e.a.ə.,* II, 36; Kamil Miras, *e.a.ə.,* VII, 101.

## III. Hz. MƏHƏMMƏDİN (s.ə.s) EVLİLİYİ

### A. Ticarət Həyatı

Bütün Məkkəlilər kimi Hz. Məhəmməd də (s.ə.s) əmisiylə birlikdə ticarət edirdi. İstər uşaqlığında, istərsədə ticarət həyatında, dürüstlüyü ilə tanınmışdı. Sözündə durmadığı, yalan danışdığı, başqalarına zərər verəcək bir davranışda olduğu, bir kimsəni incitdiyi əsla görülməmiş, əksinə dürüstlüyü dillərə dastan olmuşdu. Buna görə Məkkəlilər ona "əl-Əmin" (hər mövzuda etibarlı adam) deyirdilər. Onun bu yüksək əxlaqını öyrənən Qureyşin zəngin qadınlarından Xədicə, ona sərmayə verərək ticarət ortaqlığı təklif etdi. Beləcə Peyğəmbər (s.ə.s) ilə Xədicə arasında ticarət ortaqlığı başladı.

### B. Hz. Xədicə ilə Evlənməsi

Qureyşin Əsədoğulları qolundan Huveylid qızı Xədicə ağıllı, şərəf və zadəganlıq sahibi, 39–40 yaşlarında zəngin və gözəl bir xanım idi. Daha əvvəl iki dəfə evlənmiş və dul qalmışdı. Qureyşin irəli gələnlərindən xeyli sayda istəyənləri olmuş, lakin heç biri ilə evlənməmişdi. Güvəndiyi kəslərə sərmayə verərək ticarət ortaqlığı edir, beləcə sərvətini artırırdı. Yüksək əxlaq və alicənablığı səbəbiylə, özünə islamdan əvvəl "Tahirə" deyildiyi kimi, sonra da "Xədicətul-Kubra" deyilmişdir.

Hz. Xədicə bir ticarət karvanıyla Peyğəmbərimizi (s.ə.s) Şama göndərdi. Köləsi Meysərəni də xidmətinə verdi. Lakin, Hz. Peyğəmbər (s.ə.s) Şama qədər getmədi. Malları Busrada sataraq geri döndü. Çünki, Bahiranın ölümündən sonra yerinə keçən Rahib Nestura da, Hz. Məhəmmədin (s.ə.s) Şama getməsini uyğun görməmişdi.[62]

Üç ay sonra, Hz. Məhəmməd (s.ə.s) gözləniləndən daha çox qazanc əldə edərək döndü. Hz. Xədicə də bu böyük insanın əminlik, dürüstlük və səyinə heyran oldu. Daha sonra evlənmələri qərarlaşdırıldı. Bu əsnada Hz. Məhəmməd (s.ə.s) 25, Hz Xədicə isə 40 yaşında idi.[63]

62. İbnu'l-Əsir, *e.a.ə.,* II, 39.
63. İbnu'l-Əsir, *e.a.ə.,* II, 39.

Nikah, Xədicənin əmisi oğlu Varaka b. Novfəl tərəfindən Hz. Xədicənin evində qıyıldı. Əbu Talib ilə Varaka nikah zamanı xeyir dua vermiş və hər iki ailənin üstünlüklərini dilə gətirmişdilər.[64] Əsasən, Hz. Peyğəmbər (s.ə.s) ilə Hz. Xədicənin nəsəbləri Kusayda birləşir. Hz. Xədicəyə 20 dişi dəvə mehir verildi.[65] Nikahdan sonra dəvələr kəsilərək qonaqlara ziyafət verilmişdi.

Evlənmələrindən sonra Hz. Məhəmməd (s.ə.s), Hz. Xədicənin evinə yerləşdi. Nümunəvi və xoşbəxt bir ailə yuvası qurdular. Hz. Xədicə, Hz. Məhəmmədə (s.ə.s) dərin bir hörmət və sevgi ilə bağlı idi. Peyğəmbərliyindən əvvəl olduğu kimi, peyğəmbərlik dövründə də ən böyükköməkçisi oldu. Yüksək və bənzərsiz bir xanım olduğunu göstərdi.

Peyğəmbərimiz də (s.ə.s) ondan son dərəcə məmnun idi. O dövrdə çox evlilik adət olduğu, bir çox təkliflərin, aralarında yaş fərqinin olmasına baxmayaraq, onun üzərinə evlənməmiş ölümündən sonra da onu həmişə xeyrlə anmışdı.

**C. Hz. Peyğəmbərin (s.ə.s) Uşaqları**

Peyğəmbərimizin (s.ə.s) Hz. Xədicədən ikisi oğlan, dördü də qız olmaqla sırasıyla, Qasım, Zeynəb, Ruqiyyə, Ümmü Gülsüm, Fatimə və Abdullah adlarında altı uşağı oldu. Ərəblərdə ilk uşağın adı ilə çağrılmaq adət olduğundan Hz. Peyğəmbərə də "Əbül-Qasım" deyildi. Qasım ilə Abdullah kiçik yaşda vəfat etdilər. Qızları isə böyüdülər. Lakin, Fatimədən başqa hamısı da atalarından əvvəl vəfat etdilər. Yanlız Fatimə, peyğəmbərin (s.ə.s) vəfatından sonra altı ay yaşadı.

Rəsuli-Əkrəm (s.ə.s), qızlarının ən böyüyü olan Zeynəbi Əbul-As ilə evləndirdi. Əbül As, müsəlman olmadığı üçün, Zeynəbin hicrətinə icazə verməmişdi. Bədir döyüşündə əsir düşdü. Zeynəbi Mədinəyə göndərmək şərti ilə sərbəst buraxıldı. Daha sonra müsəlman olaraq Mədinəyə gəldi. Zeynəblə təkrar evləndi.[66]

---

64. Hər iki xütbənin mətin və tərcümələri üçün bax: Mahmud Esad Efendi, *e.a.ə.,* II, 47-48.
65. İbn Hişam, *e.a.ə.,* I, 201. Beşyüz qızıl və ya beşyüz dirhəm kimi rəvayətlər də vardır.
66. Əbul-As ilə əlaqəli daha geniş məlumat üçün bax: Kamil Miras, *e.a.ə.,* II, 373–376 (Hədis No: 313).

Ruqiyyə ilə Ümmü Gülsümü, əmisi Əbu Ləhəbin oğullarından Utbə və Uteybə ilə evləndirmişdi. İslamiyyətdən sonra Əbu Ləhəb, Hz. Peyğəmbərə (s.ə.s) olan düşmənliyi səbəbiylə oğullarına yoldaşlarını boşamaları üçün təzyiq etdi. Onlar boşadıqdan sonra, Rəsulullah (s.ə.s) Ruqiyyəni Hz. Osmanla evləndirdi. Ruqiyyənin ölümündən sonra da Hz. Osmana digər qızı Ümmü Gülsümü nikahladı. Buna görə Hz. Osmana *"iki nur sahibi"* mənasına gələn*"Zin-nureyn"* deyildi.

Ən kiçik qızı Fatiməni isə Hz. Əli ilə evləndirdi. Həsən və Hüseyin, Hz. Fatimənin uşaqlarıdır. Rəsuli-Əkrəmin (s.ə.s) nəsli, Hz. Fatimə ilə davam etmişdir.

Peyğəmbərimizin (s.ə.s) Misirli yoldaşı Mariyədən də İbrahim adlı bir oğlu olmuş, lakin hicrətin 10-cu ilində hələ iki yaşına çatmadan ölmüşdür.

**Ç. Kəbənin Təmirində Hakimliyi (605 m.)**

Hz. İbrahim və Hz. İsmayıl tərəfindən inşa edilmiş olan Kəbə, uzun əsrlər içində yağış və sel suları ilə xarabolmuş, təmir edilməsinə ehtiyac var idi.

Qureyşlilər, Kəbə binasını yıxaraq, yenidən inşa etməyə qərar verdilər. Köməklər toplandı, lazımlı vəsait təmin edildi. Hz. İbrahimin qurduğu təmələ qədər yıxaraq, divarları yenidən hörməyə başladılar. Ancaq; *"Hacər-i Əsvəd"*i yerinə qoyma sırası gəlincə razılaşa bilmədilər. Qureyşin bütün qolları, bu şərəfin özlərinə aid olmasını istəyirdi. Anlaşılmazlıq dörd gün davam etdi, qan tökülmək üzrə idi ki,[67] Qureyşin ən qocası Əbu Ümeyyə və ya Huzeyfə b. Muğirə *"Hərəm qapısından ilk girəcək şəxsin hakim edilərək, onun verəcəyi qərara tabe olunmasını"* təklif etdilər.[68] Bu təklif qəbul edildi. Az sonra qapıdan Hz. Məhəmməd (s.ə.s) girmişdi. Buna o qədər sevindilər ki, "əl-əmin, əl-əmin, onun hakimliyinə razıyıq..." deyə bağrışdılar. Yanlarına gəlincə, vəziyyəti izah etdilər.

Hz. Məhəmməd (s.ə.s), üzərinə Hacər-i Əsvədi qoyduğu bezin uclarını

67. Əbduddaroğulları, əllərini bir çanaqdakı qana batıraraq, *"qanımız axıdılmadıqca bu mövzuda kimsə bizim önümüzə keçə bilməz"* deyə and içmişdilər. Mahmud Esad Efendi, *e.a.ə.,* II, 55.
68. Mahmud Esad Efendi, *e.a.ə.,* II, 55.

Qureyşin ağsaqqallarının tutmasını istədi. Hamısı birlikdə Hacər-i Əsvədi qoyulacağı yerə qədər apardılar. Hz. Peyğəmbər (s.ə.s) də daşı götürüb yerinə yerləşdirdi. Anlaşılmazlığın bu şəkildə həll edilməsi hər kəsi məmnun etdi. Beləcə böyük bir fəlakət önlənmiş oldu.[69]

Bu hadisə, Hz. Məhəmmədi (s.ə.s) zəka və dirayəti yanında, onun Məkkəlilər arasındakı sonsuz etibarını da göstərməkdədir. Bu zaman Rəsuli-Əkrəm (s.ə.s) 35 yaşında idi.

Kəbənin təmirində Hz. Peyğəmbər də (s.ə.s) şəxsən işləmiş, daş daşımış, hətta buna görə çiyinləri yara olmuşdu. Bir dəfə əmisi Abbasın sözünü dinləyərək daş ağrıtmasın deyə paltarını çiyininə yığdığında bədəni açılınca huşsuz halda yerə yıxılmışdı. Rəsulullah (s.ə.s) o andan sonra heç üryan görülməmişdir.[70]

69. İbn Hişam, *e.a.ə.,* I, 209; İbnu'l-Əsir, *e.a.ə.,* II, 45; Kamil Miras, *e.a.ə.,* VI, 40-44.

70. Buxari, I, 96; Kamil Miras, *e.a.ə.,* I, 240 (Hədis No: 237).

## I. Hz. MƏHƏMMƏDİN (s.ə.s) PEYĞƏMBƏR SEÇİLMƏSİ (610–632)

Hz. Məhəmməd (s.ə.s) 40 yaşında peyğəmbər oldu. 23 illik peyğəmbərlik dövrünün 13 ili Məkkədə, 10 ili Mədinədə keçdi. Beləliklə peyğəmbərlik dövrünün:

**a.** Peyğəmbərlikdən hicrətə qədər davam edən 13 illik müddətinə **"Məkkə Dövrü"** (610- 622)

**b.** Hicrətdən vəfatına qədər olan 10 illik müddətinə də **"Mədinə Dövrü"** (622–632) deyilir

### A. Məkkə Dövrü

### 1. Hirada İnziva

Keçmişdən bəri Məkkədəki hənif və zahidlər, rəcəb ayında inzivaya çəkilərdilər. Hər biri, Məkkənin 3 mil (bir saat) şimalında olan Hira (Nur) dağında bir küncə çəkilər, təfəkkürə dalardılar.[71]

40 yaşlarına doğru Hz. Peyğəmbərin (s.ə.s) ürəyində də bir təklik sevgisi meydana gəldi. O da Hira (Nur) dağında bir mağaraya çəkilib, günlərlə orada qalır, Allah təalanın sonsuz qüdrət və əzəmətini düşünərək ona ibadət edirdi. Gedərkən azuqəsini də özü ilə aparır, bitincə evinə dönür, sonra təkrar gedirdi. Beləcə Allah təala, onu böyük vəzifəsinə hazırlayırdı. Zaman-zaman

71. Mahmud Esad Efendi, *e.a.ə.,* II, 60.

*"Sən Allahın elçisisən..."* deyə qulağına səslər gəlir, lakin ətrafda heç bir şey görə bilmirdi.[72]

Hz. Məhəmmədə (s.ə.s) ilahi vəhyin başlanğıcı, sadiq yuxular şəklində oldu. Gördüyü hər yuxu, olduğu kimi çıxırdı.[73] Bu hal, altı aya qədər davam etdi.

### a. İlk Vəhy

610 ili Ramazan ayının[74] Qədr gecəsində,[75] əbasına bürünüb Hiradakı mağarada təfəkkürə dalmış olduğu bir vaxtda, bir səsin onu adı ilə çağırmaqda olduğunu eşitdi. Başını qaldırıb ətrafına baxdı, kimsəni görə bilmədi. Bu əsnada hər tərəfi qəflətən bir nur örtmüşdü, dözə bilməyib huşunu itirdi. Özünə gəldiyində qarşısında vəhy mələyi Cəbrayılı gördü. Mələk ona:

-"Oxu" Dedi. Hz. Məhəmməd (s.ə.s):

-"Mən oxumağı bilmirəm", deyə cavab verdi. Mələk, Hz. Məhəmmədi (s.ə.s) qucaqlayıb taqətdən düşənə qədər sıxdı.

-"Oxu" deyə əmrini təkrarladı. Hz. Məhəmməd (s.ə.s) yenə:

-"Mən oxumağı bilmirəm" cavabını verdi. Mələk əmrini təkrarlayıb üçüncü dəfə Hz. Peyğəmbəri (s.ə.s) sıxdıqdan sonra "əl-Ələq" surəsinin ilk beş ayəsini oxudu.

**"Yaradan Rəbbinin adıyla oxu. O, insanı alakdan (peyvənd edilmiş yumurtadan) yaratdı. Oxu, qələmlə (yazmağı) öyrədən, insana bilmədiyini öyrədən Rəbbin sonsuz kərəm sahibidir."** (Ələq, 96/1–5)

Mələyin arxasından Hz. Peyğəmbər də (s.ə.s) bu ayələri təkrarladı. Həyəcanla mağaradan çıxaraq evinə gəldi. Yolda irəliləyərkən göy üzündən bir səsin:

"Ey Məhəmməd! Sən Allahın elçisisən, mən də Cəbrayılam" dediyini

72. İbn Hişam*, e.a.ə.,* I, 250.
73. Buxari, I, 3; Kamil Miras, *e.a.ə.*, I, 3 (Hədis No: 3); İbn Hişam, *e.a.ə.,* I, 249–250.
74. Bəqərə, 2/185.
75. Qədr, 97/1.

eşitdi. Başını qaldırdığı zaman, Cəbrayılı gördü.[76] Qorxu içində evinə qayıtdı. Yoldaşı Hz. Xədicəyə:

*“Məni örtün, tez məni örtün” dedi. Bir müddət istirahət edib həyəcanı keçdikdən sonra gördüklərini Hz. Xədicəyə də izah etdi, özümdən qorxuram, dedi. Hz. Xədicə onu bu ölməz sözlərlə təsəlli etdi.*

*“Elə dəmə. Allaha and içərəm ki, Allah təala heç bir vaxt səni utandırmaz. Çünki sən , qohumlarına baxırsan. İşini görməkdən aciz kəslərin ağırlıqlarını yüklənirsən, kasıba verir, kimsənin qazandıra bilməyəcəyini qazandırırsan. Qonağı qarşılayırsan. Haqq yolunda zühur edən hadisələrdə xalqa kömək edirsən...”*[77]

### b. Varakanın Sözləri

Xədicə daha sonra Hz. Peyğəmbəri (s.ə.s) əmisi oğlu Varaka b. Novfələ apardı. Varaka həniflərdən idi. Tövrat və İncili oxumuş, İbrani dilini və köhnə dinləri bilən bir qoca idi. Varaka Peyğəmbərimizi (s.ə.s) dinlədikdən sonra:

-*“Müjdə sənə ey Məhəmməd, Allaha and içirəm ki, sən Hz. İsanın xəbər verdiyi son peyğəmbərsən. Gördüyün mələk, səndən əvvəl Allah təalanın Musaya göndərmiş olduğu Cəbrayıldır. Kaşki gənc olsaydım da, qövmün səni yurdundan çıxaracağı günlərdə sənə köməkçi ola bilsəydim... Heç bir peyğəmbər yoxdur ki, qövmü tərəfindən düşmənliyə məruz qalmasın, əziyyət görməsin...”*[78] dedi. Aradan çox keçmədən Varaka öldü.

### c. Nəbilik və Rəsulluq

**“(Ey Rəsulum!) Həqiqətən, Biz səni (bəşər övladına) bir şahid, bir müjdəçi və (Allahın əzablı ilə) qorxudan bir peyğəmbər olaraq göndərdik.”** (Fəth, 48/8)

---

76. İbn Hişam, *e.a.ə.,* I, 253..
77. Buxari, I, 3; Kamil Miras, *e.a.ə.,* I, 3–10 (Hədis No: 3).
78. Buxari, I, 3; Kamil Miras, *e.a.ə.,* I, 3–10 (Hədis No: 3).

İlk vəhydən sonra, qısa bir müddət vəhyin arxası kəsildi.[79] Bir gün Hz. Peyğəmbər (s.ə.s) Hiradan dönərkən, bir səs eşitdi. Başını qaldırıb səmaya baxınca, özünə daha əvvəl Hiradakı mağarada gələn mələyi gördü. Qorxu və həyəcan içində evinə döndü.

"Dərhal məni örtün, məni örtün." dedi. Bu əsnada Cəbrayıl, əl-Müddəssir surəsinin ilk ayələrini gətirdi.

**"Ey (libasına) bürünüb sarınan (Peyğəmbər)! Qalx (qövmünü Allahın əzabı ilə) qorxut! Öz Rəbbini uca tut! Libasını təmizlə! (Nəfsini günahlardan pak et!) (Əzaba səbəb olacaq) pis şeylərdən uzaqlaş! (Bütləri tərk et!)"** (Müddəssir, 74/1–5)

İlk vəhy ilə Hz. Məhəmməd (s.ə.s) "Nəbi" olmuş, hələ başqalarına "Haqq Dini" təbliğ ilə vəzifələndirilməmişdi. Bu ikinci vəhy ilə "Risalət" verildi. Haqq dini təbliğ ilə vəzifələndirildi. Ancaq açıq dəvət hələlik əmr edilmədi.

### B. İslamda İlk İbadət və İlk Müsəlmanlar

İslamda Allaha imandan sonra ilk fərz qılınan ibadət namazdır. İkinci vəhy ilə Müddəssir surəsinin ilk ayələrinin endirilməsindən sonra, Məkkənin yuxarı hissəsində bir vadidə, Cəbrayıl (ə.s.), Rəsulullaha (s.ə.s) öyrətmək üçün dəstəmaz almış, sonra Cəbrayıldan gördüyü kimi Rəsulullah da (s.ə.s) dəstəmaz almışdır.

Sonra Cəbrayıl (ə.s.) Hz. Peyğəmbərə (s.ə.s) namaz qıldırmış və namaz qılmağı öyrətmişdir.[80] Evə dönüncə Rəsulullah (s.ə.s) dəstəmaz almış və namaz qılmağı yoldaşı Hz. Xədicəyə öyrətmiş, o da dəstəmaz almış və ikisi birlikdə camaat şəklində namaz qılmışlar.

**"Və öndə olanlar. Onlar (dünyada Allah yolunda, imanda, əməldə,**

79. İlk vəhy ilə ikinci vəhy arasında keçən "fətrət-i vəhy" müddətinin nə qədər davam etdiyinə dair rəvayətlər 15 gün ilə 3 il arasında dəyişməkdədir. Hadisələrin seyrinə görə, 1–2 aydan daha çox olmaması lazımdır. 2–3 il kimi uzun müddət olduğunu söyləyənlər, "gizli dəvət" müddəti ilə "fətrət-i vəhy"i ayıra bilməmiş olmalıdırlar. Bax: Kamil Miras, *e.a.ə.,* I. 11.
80. İbn Hişam, *e.a.ə.,* I. 260–261; Kamil Miras, *e.a.ə.,* II, 231, Tahir Olgun, *İbadət Tarixi,* 28, İstanbul, 1946.

**xeyirdə öndə olduqları kimi, axirətdə də) öndədirlər! (Nə xoşbəxtdir onlar!)"**. (Vaqiə, 56/10)

Hz. Peyğəmbərə (s.ə.s) ilk iman edən və onunla birlikdə ilk dəfə namaz qılan, yoldaşı Hz. Xədicə oldu. Daha sonra övladlığı Zeyd b. Harisə[81] və əmisi oğlu Hz. Əli müsəlman oldular.

## 1. Hz. Əlinin İslamı Qəbul Etməsi

Əbu Talib, Hz. Məhəmmədi (s.ə.s), 8 yaşından 25 yaşına qədər evində saxlamış onu öz uşaqlarından daha çox sevmişdi. Evliliyindən sonra Hz. Məhəmməd (s.ə.s), yoldaşı Hz. Xədicənin evinə köçmüş və maddi baxımdan rifaha qovuşmuşdu.[82] Əbu Talibin ailəsi isə çox böyük idi. Peyğəmbərimiz (s.ə.s) əmisinin çətinliyinin bir az azalması üçün 5 yaşından etibarən Əlini yanına götürmüşdü. Buna görə Əli, Hz. Peyğəmbərin (s.ə.s) yanında qalırdı.[83]

Hz. Əli, Peyğəmbərimiz (s.ə.s) ilə Hz. Xədicəni namaz qılarkən görüncə, bunun nə olduğunu soruşdu. Peyğəmbər əfəndimizdə ona bunları başa saldı.

- Biz kainatı yaradan Allaha səcdə edirik. O, mənə Peyğəmbərlik verdi. Bütlərə ibadət etməyi qadağan etdi. Allah birdir, şəriki və bənzəri yoxdur. Lat, Uzza boş şeylərdir. Bax, Allah mənə nələr vəhy edir-, dedi. Qurandan nazil olan ayələrdən ona bir az oxudu. İslam dinini qəbul etmək üçün qəlbində bir meyl yarandı. Ancaq atasıyla məsləhətsiz iş görən uşaq olmadığı üçün, onunla məsləhətləşməyi fikirləşdi. Sonra isə fikrini dəyişdi, Hz.Məhəmmədin hüzuruna gedib:

---

81. Zeyd, Kudaa qəbiləsindən idi. Kiçik yaşda əsir tutularaq, kölə olaraq satılmışdı. Hz. Xədicə, evliliklərindən sonra onu Hz. Məhəmmədə (s.ə.s) hədiyyə etdi. Atası Harisə, oğlunu axtara-axtara nəhayət Hz. Peyğəmbərin (s.ə.s) yanında tapdı. Hz. Peyğəmbər (s.ə.s), onu azad edərək atası ilə getməsinə icazə verdi. Lakin, Zeyd atası ilə getmədi; "atam da sənsən, anam da..." deyərək, Hz. Məhəmməddən (s.ə.s) ayrılmadı. Hz. Məhəmməd də (s.ə.s) onu övladlığa götürdü. Qurani-Kərimdə açıq olaraq adı çəkilən səhabə, yalnız Zeyddir. (Əhzab, 33/37) Peyğəmbərimiz (s.ə.s), onu Ümmü Eymənlə evləndirmiş, bu evlilikdən məşhur komandir "Üsamə" doğulmuşdur. Zeyd, hicrətin 8-ci ilində Mutə döyüşündə şəhid olmuşdur. İbn Hişam, *e.a.ə.,* I, 265.
82. Duha, 93/ 8.
83. Hz. Peyğəmbərin (s.ə.s) əmisi Abbas da eyni məqsədlə Cəfəri himayəsinə götürmüşdü. Bax: İbn Hişam, *e.a.ə.,* I, 263.

- Allah məni yaratdığı zaman, Əbu Talibdən soruşmadı ki? Mən niyə Allaha ibadət etmək üçün ondan soruşum, dedi və musəlman olduğunu açıqladı. Bu zaman Hz. Əli hələ on yaşlarında bir uşaq idi.

### 2. Hz. Əbu Bəkrin Müsəlman Olması

Hz. Məhəmmədin (s.ə.s) yaxın və ən səmimi dostu olan Əbu Bəkir b. Kuhafə, Qureyş qəbiləsinin Teymoğulları qolundandır. Ata və ana tərəfindən soyu, Hz. Peyğəmbərin (s.ə.s) soyu ilə Murrədə birləşir.

Hz. Əbu Bəkrin Məkkədə Qureyş arasında böyük bir etibarı vardı. Zəngin və dürüst bir tacir idi. Aralarındakı güvən və səmimiyyət səbəbiylə, Peyğəmbərimiz (s.ə.s), ailəsi xaricindəkilərdən ilk olaraq Hz. Əbu Bəkri islama dəvət etdi. Hz. Əbu Bəkir bu dəvəti tərəddüdsüz qəbul etdi. O, cahiliyyət dövründə belə bütlərə heç sitayiş etməmiş, ağzına içki qoymamışdı. Hz. Əbu Bəkrin müsəlman olmasıyla, Peyğəmbərimiz (s.ə.s) böyük bir dəstəyə qovuşdu. Onun səy və köməyilə, Məkkənin əhəmiyyətli şəxsiyyətlərindən Osman b. Affan, Əbdürrəhman b. Avf, Sad b. Əbi Vakkas, Zübeyr b. Avvam və Talha b. Ubeydullah da müsəlmanlığı qəbul etdilər. Hz. Xədicədən sonra müsəlman olan bu 8 şəxsə *"İlk Müsəlmanlar"* (Sabiqin-i İslam) deyilər.

### C. Açıq Dəvətin Başlaması (613–614 m.)

Peyğəmbər (s.ə.s) əfəndimiz ilk üç il xalqı gizlicə islama dəvət etdi. Yalnız çox güvəndiyi insanlara islamı açıqladı.[84] Başda Hz. Əbu Bəkir olmaqla, Haqq dini qəbul etmiş olanlar da, gizlicə güvəndikləri yoldaşlarını təşviq edirdilər. Bu üç il içində müsəlmanların sayı ancaq 30-a çıxa bildi.[85] Bunlar ibadətlərini evlərində gizlicə edirdilər.

Peyğəmbərliyin dördüncü ilində (614 m.) enən: **"(Ya Rəsulum!) Sənə əmr olunanı (Quranı) açıq-aşkar təbliğ et və müşriklərdən üz döndər!"**.

84. İbn Hişam, *e.a.ə.,* I, 280.

85. Mahmud Esad Efendi, *e.a.ə.,* II, 145; Bu əsnada islam ətrafda yavaş-yavaş eşidilir, ağızdan ağıza yayılırdı. Məhəmməd (s.ə.s) yeni bir din gətirmiş, Əbdülmüttəlibin yetiminə göydən xəbərlər gəlirmiş... deyə lağ edənlər olurdu.

(Hicr, 15/94) mənasındakı ayə ilə islamı açıqdan təbliğ etməsi əmrolundu. Bunun üzərinə Rəsuli-Əkrəm (s.ə.s) xalqı açıqdan islama dəvətə başladı.

Hərəm-i Şərifə gedib özünə nazil olan ayələri açıqdan oxuyurdu:

"**(Ey Rəsulum!) De: "Ey insanlar! Mən Allahın sizin hamınıza göndərilmiş peyğəmbəriyəm. (O Allah ki) göylərin və yerin hökmü Onundur, Ondan başqa heç bir tanrı yoxdur. O dirildir və öldürür. Buna görə də Allah, eləcə də Onun Allaha və Allahın sözlərinə (ayələrinə, nazil etdiyi kitablara) inanan və ümmi peyğəmbər olan Rəsuluna iman gətirin və ona tabe olun ki, doğru yolu tapa biləsiniz!"** (Əraf, 7/158) deyərək onları islama dəvət edirdi.

Açıq dəvətin başlamasından sonra, insanlarla daha asan təmas edə bilmək üçün Rəsulullah (s.ə.s), öz evindən, Səfa ilə Mərvə arasında işlək bir yerdə olan "Ərkam"ın evinə yerləşdi. Bir çox kimsə bu evdə islamla şərəfləndiyi üçün bu evə *"Daru-l İslam"* deyildi.[86]

### 1. Yaxın Qohumlarını İslama Dəvəti

**"Və ən yaxın qohumlarını qorxut!"** (Şuəra, 26/214) mənasındakı ayə enincə Rəsuli-Əkrəm (s.ə.s), Səfa təpəsinə çıxaraq:

*"Ey Əbdülmüttəliboğulları, ey Fihroğulları, ey Əbdimənafoğulları, ey Zührəoğulları..." deyərək bütün qohumlarına səsləndi.* Hamısı toplandıqdan sonra:

*-"Ey Qureyş camaatı, sizə" -bu dağın ətəyində və ya bu vadidə düşmən süvarisi var. Üzərinizə basqın edəcək desəm, mənə inanarsınızmı?"* deyə soruşdu. Hamısı bir ağızdan:

-"Bəli, inanarıq, çünki indiyə qədər səndən heç yalan eşitmədik, sən yalan danışmazsan..." dedilər. O zaman Rəsulullah (s.ə.s):

*-"O halda mən sizə, önümüzdə şiddətli bir əzab günü olacaq, Alaha inanıb, Ona qulluq etməyənlərin bu büyük əzaba uğrayacaqlarını xəbər verirəm... And içərəm ki, Allahdan başqa ibadətə layiq tanrı yoxdur. Mən də*

86. Mahmud Esad Efendi, *e.a.ə.,* II, 151.

*Allahın sizə və bütün insanlara göndərdiyi peyğəmbəriyəm. Allahdan özünüzü ibadət qarşılığında satın alaraq, əzabından qurtarın. Bu əzabdan xilas olmanız üçün, mən Allah tərəfindən verilmiş heç bir nüfuza sahib deyiləm."* [87]

-*"Ey Qureyş Camaatı! Siz yuxuya gedər kimi öləcəksiniz. Yuxudan oyanar kimi diriləcəksiniz. Qəbirdən qalxıb Allah divanına çatdığınızda, şübhəsiz dünyadakı bütün etdiklərinizdən hesaba çəkiləcəksiniz. Yaxşılıqlarınızın mükafatını, pisliklərinizin də cəzasını görəcəksiniz. "O mükafat əbədi cənnət, cəza da cəhənnəmə girməkdir..."*[88] deyərək sözlərini bitirdi.

Peyğəmbərimizin (s.ə.s) bu sözləri, ümumi bir müxalifətlə qarşılanmadı. Yalnız Əbu Ləhəb:

-"Ay səni, bizi bunun üçünmü çağırdın?", "Ar olsun sənə" demiş və hətda daş atmışdı.

Bu sözləriylə Rəsulullahın (s.ə.s) könlünü qırdı. Bunun üzərinə onun haqqında:

**"Əbu Ləhəbin əlləri qurusun, qurudu da! (Və ya: Əbu Ləhəbin əlləri qurusun, o ölsün!) (Qiyamət günü) ona nə mal-dövləti fayda verəcək, nə də qazandığı (və ya: oğl-uşağı). O, alovlu atəşə girəcəkdir. Onun odun daşıyan (Peyğəmbərlə düşmənçilik edən, adamlar arasında söz gəzdirən) övrəti də həmçinin! Onun (övrətinin) boğazında xurma lifindən hörülmüş ip (və ya: yetmiş arşın uzunluğunda zəncir) olacaqdır!"** (Ləhəb, 111/1–5) tərcüməsindəki surə nazil oldu.[89]

## II. MƏKKƏ MÜŞRİKLƏRİNİN MÜSƏLMANLARA QARŞI DAVRANIŞLARI

İslamın Məkkədə yayılmağa başlaması ilə Məkkə xalqı iki hissəyə ayrıldı.

---

87. İmam Nəvəvi, *Riyazu's-salihin*, I, 361, (Hədis No: 327).
88. Buxari, III, 191 və IV, 161; Kamil Miras, *e.a.ə.*VIII, 252–255 (Hədis No: 1170) və IX, 283–289; İbnu'l-Əsir, *e.a.ə.,* II, 60–61.
89 İbnu'l-Əsir, *e.a.ə.,* II, 60-61; Mahmud Esad Efendi, *e.a.ə.,* II, 154.

**l.** Müsəlmanlar

**2.** Müsəlmanlığı qəbul etməyən müşriklər.

Müşriklərin, müsəlmanlara qarşı davranışlarını beş mərhələdə toplamaq mümkündür: Alay (lağ), təhqir, işgəncə, əlaqələri kəsmə (boykot), şəhərdən çıxarma və öldürmə (şiddət siyasəti).

**A. Alay və Təhqir Dövrü**

Qureyşlilər başlanğıcda Hz. Məhəmmədin (s.ə.s) Peyğəmbərliyinə əhəmiyyət verirmiş kimi görünürdülər. İman etməməklə birlikdə, bütlər əleyhinə söz söyləmədikcə, Hz. Peyğəmbərin (s.ə.s) dəvətinə səs çıxarmadılar. Yalnız, Rəsulullahı (s.ə.s) gördüklərində, "Budur, göydən özünə xəbər gəldiyini iddia edən..." deyərək əylənirdilər. Müsəlmanlarla alay edib onları kiçik görməyə başladılar. Beləcə *"alay dövrü"* başlamış oldu.

Qurani-Kərim, onların bu münasibətlərini bizə bildirməkdədir: **"Həqiqətən, günahkarlar iman gətirmiş kimsələrə (dünyada) gülürdülər. (Möminlərin) yanlarından keçərkən (onları dolamaq məqsədilə) bir-birinə qaşgöz edirdilər. Ailələrinin (yaxın adamlarının) yanına qayıtdıqda isə (onları doladıqları üçün) kefləri kök qayıdırdılar. Onlar (möminləri) gördükdə: "Doğrusu, bunlar (haqq yoldan) azanlardır!"** deyərlərdi. (Mutəffifin, 83/29–32)

Bütlərlə əlaqədar, **"(Ey Məkkə əhli!) Siz və Allahdan qeyri ibadət etdiyiniz bütlər isə cəhənnəm yanacağısınız (odunusunuz). Siz ora varid olacaqsınız!"** (Ənbiya, 21/98) mənasındakı ayə enincə, müşriklər son dərəcə əsəbləşdilər. Artıq müsəlmanlara düşmən olub, təhqir etməyə başladılar. Beləcə, *"təhqir dövrü"* başladı.

Qureyşin bütlərə inanmaqda faydaları var idi. Məkkə bütpərəstlərin məkəzi vəziyyətində idi. Kəbə və ətrafındakı bütləri ziyarət üçün gələnlərlə Məkkə hər gün dolub daşıyır, buna görə Qureyş, həm pul, həm etibar qazanırdı. Məkkədə islam yayılsa bütün bu mənfəətlər əldən getdiyi kimi, digər qəbilələr Qureyşə düşmən ola bilərdilər. Üstəlik islam hər kəsi bərabər sayır, soy-nəsəb, zadəganlıq, zənginlik-kasıblıq fərqi güdmürdü. Buna görə Qureyşin liderləri islamı öz mənfəətləri üçün təhlükəli gördülər. İslamın yayılmasını önləmək və ortadan qaldırmaq üçün hər çarəyə əl atdılar.

### B. İşgəncə Dövrü

#### 1. Qureyşin Əbu Talibə Müraciət Etməsi

Qureyşin liderlərindən Utbə b. Rəbiə, Şeybə b. Rəbiə, Əbu Cəhil, Əbu Süfyan, Vəlid b. Muğirə, As b. Vail və As b. Hişamdan ibarət olan bir heyət Haşimoğullarının rəisi Əbu Talibə gələrək:

"Qardaşının oğlu ilahlarımızı təhqir edir, dinimizi tənqid edir, bizi axmaq, babalarımızı anormal göstərir. Ya O bu işdən imtina etsin, yaxud sən himayəndən imtina et ki, biz haqqından gələk..." dedilər. Əbu Talib onları şirin dillə yola saldı.[90] Hz. Peyğəmbərin (s.ə.s) əvvəlki kimi vəzifəsinə davam etdiyini görüncə yenidən Əbu Talibin yanına gəldilər.

"Artıq səbr və dözümümüz qalmadı. Nə olacaqsa olsun, iki tərəfdən biri yox olsun, digəri xilas olsun..." deyə hədələdilər. Əbu Talib vəziyyətin çox ciddi olduğunu gördü. Bütün Qureyşə qarşı çıxa bilməzdi. Qardaşı oğlu Hz. Məhəmmədə (s.ə.s) vəziyyəti izah edərək:

-"Bax oğlum, qohum arasına nifaq salmaq yaxşı olmaz. Sən yenə dininə görə hərəkət et, amma onların bütlərini alçaltma, onlara anormal demə. Özünü də, məni də qoru, mənə gücümün çatmayacağı yük yükləmə..." dedi. Hz. Peyğəmbər (s.ə.s) kədərləndi. Artıq əmisi də onu qoruya bilməyəcəkdi. Müsəlmanlar hələ say baxımından az və zəif idi. Mübarək gözləri yaşlarla dolaraq:

-"Ey əmi, Allaha and içirəm ki, onlar sağ əlimə günəşi, sol əlimə də ayı qoysalar, mən yenə vəzifəmi buraxmaram..." deyərək ayrılmaq üçün yerindən qalxdı. Qardaşı oğlununun kədərlənməsinə dözə bilməyən Əbu Talib:

-"Ey qardaşımın oğlu, istədiyini söylə and içirəm ki, səni heç bir zaman, heç bir şey qarşısında himayəsiz buraxacaq deyiləm." dedi.[91] Daha sonra Əbu Talib, Haşimoğullarını yığaraq vəziyyəti izah etdi və Qureyşə qarşı ailə şərəfi adına Hz. Peyğəmbərin (s.ə.s) qorunmasını istədi. Əbu Ləhəbdən başqa bütün ailə fərdləri, müsəlman olsun, olmasın, bu təklifi qəbul etdilər.[92]

---

90. İbn Hişam*, e.a.ə.,* I, 283-284; İbnu'l-Əsir, *e.a.ə.,* II, 63.
91. İbn Hişam, *e.a.ə.,* I, 284; İbnu'l-Əsir, *e.a.ə.,* II, 64; Mahmud Esad Efendi, *e.a.ə.,* II, 156.
92. İbn Hişam, *e.a.ə.,* I, 287; Mahmud Esad Efendi, *e.a.ə.,* II, 158.

**2. Qureyşin Hz. Peyğəmbərə (s.ə.s) Müraciət Etməsi**

Əbu Talibə etdikləri müraciətlərdən bir nəticə ala bilməyən Qureyş liderləri şəxsən, Hz. Peyğəmbərin (s.ə.s) yanına gəldilər.

-"Ey Məhəmməd! Sən soy və şərəf cəhətdən hamımızdan üstünsən. Lakin ərəblər arasında, indiyə qədər heç kimin etmədiyini etdin, aramıza ayrılıq saldın, bizi bir-birimizə düşmən etdin. Əgər məqsədin zəngin olmaqdırsa, səni qəbiləmizin ən zəngini edək. Rəislik istəsən, başçı seçək. Evlənməyi düşünürsənsə, Qureyşin ən zadəgan və ən gözəl qadınları ilə evləndirək. Əgər cinlərin pisliyinə düçar olmusansa, səni müalicə etdirək. İstədiyin hər fədakarlığa dözərik. Bu iddiandan imtina et, nizamımızı pozma..." dedilər. Rəsulullah (s.ə.s):

-"Söylədiklərinizdən heç biri məndə yoxdur. Məni Rəbbim sizə peyğəmbər göndərdi, mənə kitab endirdi. Allah təalanın əmrlərini sizə təbliğ edirəm. İman etsəniz, dünya və axirətdə xoşbəxt olarsınız. İnkar etsəniz, Allah təala aramızda hökm edənə qədər səbr edib gözləyəcəyəm. Bütlərə ibadətdən imtina edib, yalnız Allaha ibadət edin...." deyə cavab verdi.[93]

- "Bizim 360 dənə bütümüz Məkkəni idarə edə bilməzkən, bir tək Allah dünyanı necə idarə edər?" deyərək getdilər.[94]

**"Onlar öz içərilərindən özlərinə (Allahın əzabı ilə) qorxudan bir peyğəmbər gəlməsinə təəccüb etdilər və kafirlər belə dedilər: "Bu, yalançı bir sehrbazdır! Əcaba, o, (Allahdan başqa heç bir tanrı yoxdur deməklə) tanrıların hamısını bir tanrımı edir? Bu, doğrudan da, çox təəcüblü bir şeydir.".** (Sad, 38/4–5)

**3. İlk Müsəlmanların Gördükləri Əzab və Cəfalar**

Müşriklər, Əbu Talib və Hz. Peyğəmbərlə etdikləri görüşmələrdən bir nəticə əldə edə bilmədikləri üçün müsəlmanlara əzab və işgəncə verməyə başladılar.[95]

93. İbn Hişam, *e.a.ə.,* I, 315–316; Mahmud Esad Efendi, *e.a.ə.,* II, 161.
94. Mahmud Esad Efendi, *e.a.ə.,* II, 163.
95. İbn Hişam, *e.a.ə.,* I, 287.

Hz. Əbu Bəkir, Hz. Osman kimi qüvvətli və etibarlı bir ailəyə mənsub olanlara çox toxuna bilmirdilər. Lakin kimsəsiz, kasıb müsəlmanlara, xüsusilə kölə və xidmətçilərə dünya tarixində mislinə rast gəlinməyən vəhşilik dərəcəsində işgəncələr edirdilər. Əbu Füheykə, Habbab, Bilal, Suheyb, Ammar, Yasir və Sümeyyə bunlardan idi.

Safvan b. Ümeyyənin köləsi olan Əbu Füheykə, əfəndisi tərəfindən hər gün ayağına ip bağlanaraq qumlar üzərində sürüklədilirdi.

Dəmirçi olan Habbab, köz halındakı kömürlərin üzərinə yatırdılmış, kömürlər sönüb qaralana qədər, sinəsinə basılaraq yandırılmışdı.

Ammarın atası Yasir, ayaqlarından iki ayrı dəvəyə bağlanıb, dəvələr tərs yönlərə sürülərək parcalanmış, ərinin bu şəkildə vəhşicə öldürülməsinə dözə bilməyib müşriklərə qarşı gələn Sümeyyə, Əbu Cəhlin atdığı bir oxla ölmüşdü.[96]

Ümeyyə b.Xələf, köləsi Həbəşli Bilalı hər gün çılpaq şəkildə qızğın qumlar üzərinə yatırdar, sinəsinə böyük bir daş qoyaraq günəşin altında saatlarla saxlayar, Hz. Peyğəmbərə (s.ə.s) söyməsi, islamı tərk etməsi üçün əzab edərdi. Bir gün, əllərini ayaqlarını sıx bağlayaraq boynuna bir ip keçirmiş, küçə uşaqlarının əlinə verərək çılpaq bədənini qızğın qumlar üzərində Məkkə küçələrində sürütmüştü. Dərisi üzülüb qanlar içində qalan Bilal, bu vəziyyətdə yarı huşsuz halda belə “Əhad, Əhad” (Allah birdir, Allah birdir) deyirdi.[97]

Ana və atası vəhşicə öldürülən Ammar, gördüyü işgəncələrə dözə bilməmiş, müşriklərin istədikləri sözləri söyləmişdi. Əllərindən xilas olunca, ağlayaraq Hz. Peyğəmbərə (s.ə.s) vəziyyəti izah etmiş, Rəsulullah da (s.ə.s) ona: *“Sənə təkrar əziyyət etsələr, xilas olmaq üçün yenə elə söylə” demişdi.”*[98]

96. İbn Qayyim, Məhəmməd b. Əbu Bəkir, (v. 751/1350), *Zadu’l-məad,* II, 116, Qahirə, 1373/1953; *Əsr-i Səadət*, I, 254.
97. İbn Qayyim, *e.a.ə.,* II, 116; *Əsr-i Səadət,* I, 253.
98. **“Qəlbi imanla sabit olduğu halda (küfr sözünü deməyə) məcbur edilən (dil ilə deyib ürəyində onu təsdiq etməyən) şəxs istisna olmaqla, hər kəs iman gətirdikdən sonra küfr etsə (onu ağır təhlükə gözləyir). Lakin qəlbən küfrə razı olanlara (qəlbində könüllü surətdə küfrə yer verənlərə) Allahın qəzəbi tutar və onlar şiddətli bir əzaba düçar olarlar!”** (Nəhl, 16/106) mənasındakı ayə o hadisədən sonra endi.

Hz. Əbu Bəkir, müşrik sahiblərinin işgəncələrindən qurtarmaq üçün, yeddi müsəlman kölə və xidmətçini böyük qarşılıq ödəyərək satın alıb azad etmişdi. (Lübeynə, Zinnirə, Nəhdiyyə, Ümmü Abis və s.) Rəsulullahın (s.ə.s) müəzzini Bilal bunlardan biri idi.[99]

Haşimilərdən çəkindikləri və Əbu Talibin himayəsində olduğu üçün əvvəllər Rəsulullahın (s.ə.s) özünə toxuna bilmirdilər. Zamanla "məcnun, falçı, şair, sehirbaz" kimi sözlər söyləməyə başladılar. Nəhayət fürsət tapdıqca ona da təhqir, işgəncə və hər cür pisliyi etməkdən çəkinmədilər. Keçəcəyi küçələrə tikanlar tökür, üzərinə murdar şeylər, qan və pislik bulaşdırılır və evinin önünə pislik atırdılar. Bir dəfə Hərəm-i Şərifdə namaz qılarkən "Ukbə b. Əbi Muayt" hücum edib boğmaq istəmiş, Hz. Əbu Bəkir qurtarmışdı.[100] Başqa bir zaman, Kəbənin yanında namaz qılarkən, Ukbə b. Əbi Muayt, Əbu Cəhlin təşviqiylə yeni kəsilmiş bir dəvənin iç orqanlarını, səcdəyə getdiyində üzərinə atmış, qızı Fatimə gəlib üzərindəki pislikləri təmizlədikdən sonra, başını səcdədən qaldıra bilmişdi.[101] Müşriklərin hərəkətləri gedərək dözülməz bir həddə çatmışdı ki, bunun nəticəsində də müsəlmanlar Məkkədə yaşaya bilməz hala gəlmişdilər.

### C. Həbəşistana İlk Hicrət Edənlər (615 m.)

**"Zülmə məruz qaldıqdan sonra Allah uğrunda hicrət edənləri dünyada gözəl bir yerdə sakin edəcəyik. Axirət mükafatı (Cənnət) isə daha böyükdür. Kaş (kafirlər və hicrətdən geri qalanlar bunu) biləydilər!"** (Nəhl, 16/41)

Müşriklərin əzabları dözülməz bir hal almışdı. Müsəlmanlar sərbəstcə

---

99. İbnu'l-Əsir, *e.a.ə.,* II, 66-70; İbn Qayyim, *e.a.ə.,* II, 117;

100. Buxari, IV, 240; Kamil Miras, *e.a.ə.,* X, 45–48 (Hədis No: 1544); İbnul-Əsir, *e.a.ə.,* II, 279.

101. Buxari, I, 65; Kamil Miras, *e.a.ə.,* I, 161–164 (Hədis No: 177) və II, 377-378 (Hədis No: 314); Rəsulullah (s.ə.s) namazını qurtardıqdan sonra, üç dəfə: *"Allahım, Qureyşi Sənə həvalə edirəm"* buyurmuş sonra da orada gülüşüb istehza etməkdə olan Əbu Cəhil, Utbə b. Rəbiə, Şeybə, b. Rəbiə, Ukbə b. Əbi Muayt, Ümeyyə b. Xələfi ad-ad sayaraq, *"Allahım! Bu qrupu sənə həvalə edirəm"* buyurmuşdur. Bunların hamısı da Bədir döyüşündə öldürülərək bir çuxura atıldılar. Kamil Miras, *e.a.ə.,* I, 161 (Hədis No: 177) və X, 47-48.

ibadət edə bilmirdilər. Bu səbəblə Rəsulullah (s.ə.s) müsəlmanların Həbəşistana hicrət etmələrinə icazə verdi.

Müsəlmanlar Həbəşistana iki dəfə hicrət etdilər. İlk dəfə 11 kişi və 4 qadın cəmi 15 nəfər Məkkə dövrünün (Peyğəmbərliyin) 5-ci ilinin (615 m.) Rəcəb ayında Məkkədən gizlicə ayrılaraq Qırmızı dəniz sahilində birləşdilər. Başlarında bir rəisləri yox idi. Buradan kirayəyə götürdükləri bir gəmi ilə Həbəşistana keçdilər. İçlərində, Hz. Osman yoldaşı Ruqiyyə, Zübeyr b. Avvam, Əbdürrəhman b. Avf və Abdullah b. Məsud kimi möhtərəm şəxslər də vardı.[102]

**1. İkinci Həbəşistan Hicrəti (616 m.)**

İlk hicrət edənlər Həbəşistanda ikən enən "Nəcm surəsi"ni Hz. Peyğəmbər (s.ə.s) Hərəm-i Şərifdə müşriklərə oxudu. Bitincə, surənin sonunda "səcdə ayəsi" olduğu üçün, Allaha səcdə etdi. Bu surənin 19 və 20-ci ayələrində müşriklərin bütlərindən "Lat, Uzza və Mənatın" adları da keçdiyindən müşriklər də Hz. Peyğəmbərlə (s.ə.s) birlikdə bütləri üçün səcdə etmişdilər. Bu hadisə, *"Məkkəlilər müsəlman oldu"* deyə bir şayiənin çıxmasına səbəb olmuş, bu əsassız şayiə də Həbəşistanda eşidilmiş, buna görə hicrət edən müsəlmanlar da, Həbəşistanda üç ay qaldıqdan sonra dönmüşdülər.[103]Müsəlmanlar, Həbəşistandan döndüklərinə peşman oldular. Çünki, müşriklər zülm və işgəncələrini daha da artırmışdılar. Bu səbəblə müsəlmanlar, Məkkə dövrünün 6-cı ilində (616 m.) 77 kişi və 13 qadın olmaqla ümumilikdə 90 nəfər 2-ci dəfə Həbəşistana hicrət etdilər. Bu ikinci hicrətdə qafilənin başçısı Hz. Əlinin böyük qardaşı Cəfəri Tayyar idi.[104]

**a. Qureyş Elçiləri ilə Cəfər Arasında Keçən Dialoq**

Müsəlmanların Həbəşistana hicrəti, müşrikləri narahat edirdi. İslamın ətrafa yayılmasından qorxdular. Hicrət edən müsəlmanların özlərinə təslim

102. İbn Hişam, *e.a.ə.,* II, 344-353; İbnul-Əsir, *e.a.ə.,* II, 76-77; İbn Qayyim, *e.a.ə.,* II, 117.
103. İbnul-Əsir, *e.a.ə.,* II, 77; İbn Hişam, *e.a.ə.,* II, 3; İbn Qayyim, *e.a.ə.,* II, 118.
104. İbnul-Əsir, *e.a.ə.,* II, 78.

edilməsi üçün Həbəşistan Nəcaşisi[105] Əshaməyə qiymətli hədiyyələrlə Amr b. As ilə Abdullah b. Əbi Rəbiəni elçi olaraq göndərdilər.[106] Nəcaşi, müsəlmanlarla Qureyş elçilərini dinləyərək müqayisə etdi. Müsəlmanlara:

-"Qureyşlilər elçi göndərmişlər, sizi geri istəyirlər, nə deyirsiniz" deyə soruşdu. Müsəlmanların rəisi Cəfər ayağa qalxaraq:

-"Ey hökmdar, soruşun onlara, biz onların köləsiyikmi?"

Qureyş nümayəndələri adına Amr b.As cavab verdi:

- Xeyr, hamısı azaddır.

- Onlara borcumuzmu var?

- Xeyr, heç birində alacağımız yoxdur.

- Qisas edilməyimiz üçün, onlardan öldürdüyümüz kimsə varmı?

- Elə bir istəyimiz yoxdur.

- O halda bizdən nə istəyirlər?

Amr cavab verdi:

-"Bunlar atalarımızın dinindən çıxdılar, ilahlarımızı təhqir etdilər, gənclərin inanclarını pozdular, aramıza ayrılıq saldılar."

Bu iddialara qarşı Cəfər:

-"Ey hökmdar, biz cahil bir qövmdük. Daşdan, ağacdan etdiyimiz bütlərə ibadət edirdik. Qız uşaqlarımızı diri-diri torpağa basdırır, ölmüş heyvanların leşlərini yeyirdik. İçki, qumar, fahişəlik və hər cür əxlaqsızlığı edirdik. Haqq-hüquq tanımırdıq. Güclülər zəifləri əzir, zənginlər kasıbların kürəyindən dolanırdı.

Allah təala bizim hidayətimizi dilədi. İçimizdən soyu-nəsəbi, zadəganlığı, əxlaq, fəzilət və dürüstlüyü haqqında kimsənin pis söz deyə bilməyəcəyi bir peyğəmbər göndərdi. O bizi bütə ibadət etmək zillətindən qurtardı. Tək, Allahı tanıtdı. Tək ona qulluğa çağırdı. Bütün əxlaqsızlıqlardan uzaqlaşdırdı.

---

105. "Nəcaşi", Həbəş hökmdarlarının ünvanıdır. "Nəcaşi", A.J. Wensinck, İslam Ensklopediyası, IX, 153, İstanbul, 1993.

106. İbn Hişam, *e.a.ə.,* I, 356–357; İbnu'l-Əsir, *e.a.ə.,* II, 79; İbn Qayyim, *e.a.ə.,* II, 121.

Doğru söyləməyi, əmanəti qorumağı, qohumluq haqqlarına riayəti, qonşularla xoş dolanmağı öyrətdi. Yalan danışmağı, yetim malı yeməyi, haqsızlıq etməyi qadağan etdi.

Biz ona inandıq. Onun göstərdiyi Haqq dini qəbul etdik. Buna görə qövmümüzün təhqir və işgəncələrinə məruz qaldıq. Lakin, dinimizdən dönmədik. Vəziyyət dözülməz hala gəlincə onlardan qaçıb sizin himayənizə sığındıq...” dedi. Qurani-Kərimdən ayələr oxuyaraq hər kəsi həyəcana gətirib ağlatdı.[107] Hz. İsa və Məryəmlə əlaqədar olaraq:

**“(Məryəm) uşağı götürüb öz adamlarının yanına gəldi. Onlar dedilər: “Ey Məryəm! Sən çox əcaib bir şeylə (atasız uşaqla) gəldin! (Və ya çox çirkin bir iş gördün!). Ey Harunun bacısı! Atan pis kişi, anan da zinakar deyildi!” (Məryəm onun özü ilə danışın, deyə) ona (uşağa) işarə etdi. Onlar: “Beşikdə olan uşaqla necə danışacaq?”… dedi”.**

**Bu, (yəhudilərin və xaçpərəstlərin barəsində) şübhəyə düşdükləri Məryəm oğlu İsa haqqında (Allahın buyurduğu) haqq sözdür!”** (Məryəm, 19/27–34)

Bu ayələri dinləyən Həbəş hökmdarı:

-“Allaha and içirəm ki, bu sözlər Hz. İsaya gələn sözlərlə eyni qaynaqdandır” dedi və Qureyş elçilərinin təklifini rədd etdi.[108]

Sabahısı gün  Amr Nəcaşinin hüzuruna çıxaraq:

-“Onlar Hz. İsa haqqında uyğun olmayan sözlər söyləyirlər”, deyərək hökmdarı təhrik etmək istədi. Çünki Həbəş Nəcaşisi Əshama Xiristian idi.

Bu idiaya qarşı Cəfər:

-“Biz, Hz. İsa haqqında Allah təala Quranda nə bildirmişsə ancaq onu söyləyirik” dedi və sonra bu mənadakı ayəni oxudu.

**“Ey kitab əhli! Öz dininizdə həddi aşmayın! Allah barəsində yalnız haqqı deyin. Həqiqətən, Məryəm oğlu İsa əl-Məsih ancaq Allahın**

107. İbn Hişam, *e.a.ə.,* I, 359-360; İbnu’l-Əsir, *e.a.ə.,* II, 79-81; Mahmud Esad Efendi, *e.a.ə.,* II, 216-218.
108. İbn Hişam, *e.a.ə.,* I. 360; Mahmud Esad Efendi, *e.a.ə.,* II, 221.

**peyğəmbəri, (Cəbrail vasitəsilə) Məryəmə çatdırdığı bir söz və Onun tərəfindən olan bir ruhdur. Allaha və peyğəmbərlərinə iman gətirin. (Allah barəsində) "üçdür" deməyin. (Belə sözlərə) son qoyun ki, (bu) sizin üçün daha yaxşı olar. Həqiqətən, Allah tək bir tanrıdır. Övladı olmaqdan (bu bəşəri xüsusiyyətdən) kənardır. Göylərdə və yerdə nə varsa, (hamısı) Onundur. Allahın (sizə) vəkil olması bəs edər!".** (Nisa, 4/171)

Bunun üzərinə Nəcaşi yerdən bir çöp götürüb göstərərək:

"-Hz. İsanın dedikləri ilə sizin söylədikləriniz arasında bu çöp qədər belə fərq yoxdur. Sizi və Peyğəmbərinizi təbrik edirəm. Şahidlik edərəm ki, O şəxs, Haqq Peyğəmbərdir. Onu Hz. İsa müjdələmişdi..." dedi. Sonra, Qureyş elçilərinə:

"-Peyğəmbərlərini yalanlayan qövmün hədiyyəsi mənə lazım deyil," deyərək gətirdikləri hədiyyələri geri verdi.[109]

Həbəşistanda müsəlmanlar güvən içində yaşadılar. Bunlardan bir qismi müsəlmanlar Mədinəyə hicrət edincə (622 m.) Mədinəyə getdilər. Bir qismi Hudeybiyə sülhünə qədər (628 m.) orada qaldılar. Cəfərin başçılığında son 16 nəfərlik qrup isə Xeybərin fəthi əsnasında Mədinəyə döndü. (628 m.)

### Ç. Hz. Həmzə və Hz. Ömərin İslamı Qəbul Etmələri

#### 1. Hz. Həmzənin Müsəlman Olması

Həmzə, Peyğəmbərimizin əmilərindəndir. Süveybədən O da süd əmdiyi üçün, Rəsulullah (s.ə.s) ilə süd qardaşdır. Məkkə dövrünün 6-cı (616 m.) ilində müsəlman olmuşdur.

Peyğəmbərimiz bir gün "Səfa" təpəsində oturarkən yanından Əbu Cəhil keçdi. Rəsulullahı (s.ə.s) çirkin sözlərlə təhqir etdi. Peyğəmbərimiz heç bir cavab vermədi.

Həmzə o gün ova getmişdi. Ovdan qayıtdığı zaman, bir xidmətçi hadisəni Həmzəyə izah etdi. Həmzə hələ müsəlman olmamışdı. Qardaşı oğlunun təhqir edilməsinə dözə bilmədi, silahını çıxarmadan, dərhal Qureyşin yığın-

109. İbn Hişam, *e.a.ə.,* I, 361-362; İbnu'l-Əsir, II, 81.

caq yerinə getdi. “Qardaşımın oğlunu təhqir edən sənsənmi?” deyərək yayı ilə Əbu Cəhlin başına vurub yaraladı. Əbu Cəhil, “Həmzə müsəlman olar” qorxusu ilə səs çıxarmadı.[110] Əbu Cəhldən, Peyğəmbərimizə etdiyi təhqirin qisasını alan Həmzə, Rəsulullahın (s.ə.s) yanına gedərək onu təsəlli etmək istədi. Rəsulullahın (s.ə.s) ancaq iman etməsi ilə məmnun olacağını söyləməsi üzərinə, şəhadət gətirib müsəlman oldu.[111]

Hz. Həmzə son dərəcə cəsur, qüvvətli və heç bir çətinlikdən çəkinməyən bir adam idi. Özündən üç gün sonra da Ömər müsəlman oldu. Bu ikisinin müsəlman olmalarıyla, müsəlmanlar böyük dəstək qazandılar.

### 2. Hz. Ömərin Müsəlman Olması

Hz. Həmzənin islamı qəbul etməsi, müsəlmanları sevindirmiş, lakin müşrikləri təlaşlandırmışdı. Qureyşin liderləri “Darun-Nədvə” də toplandılar. “Bunlar getdikcə çoxalıb qüvvətlənirlər, tez çarəsinə baxmazsaq, irəlidə önünü ala bilməyəcəyimiz təhlükələr yaranacaq... Buna qəti çarə tapmalıyıq” dedilər. Müxtəlif təkliflər ortaya atıldı. Əbu Cəhil:

“-Məhəmmədi (s.ə.s) öldürməkdən başqa çıxış yolu yoxdur. Bu işi edənə bu qədər dəvə və qızıl verək,” deyincə Ömər ayağa qalxdı:

“-Bu işi ancaq Xəttab oğlu edər” dedi. Ömər alqışlar arasında yola çıxdı. Silahlarını qurşanıb gedərkən yolda Nuaym b. Abdullaha rast gəldi.Nuaym:

“-Hara belə ey Ömər”? deyə soruşdu. Ömər:

“-Ərəblər arasına ayrılıq salan Məhəmmədin bədənini ortadan qaldırmağa”... deyə cavab verdi.

“-Ey Ömər, sən çox çətin bir işə cəhd etmisən. Müsəlmanlar Məhəmmədin (s.ə.s) ətrafında pərvanə kimi fırlanır, səni ona yaxınlaşdırmazlar. Bunu edə bilsən belə Haşimoğulları səni yaşatmazlar”... deyə qarşılıq verdi.. Ömər bu sözlərə əsəbləşdi.

“-Yoxsa səndəmi onlardansan”? deyə bağırdı. Nuaym:

---

110. İbnu’l-Əsir, *e.a.ə.,* II, 83.
111. Mahmud Esad Efendi, *e.a.ə.,* II, 228.

“-Sən məndən əvvəl öz yaxınlarına bax. Yeznən Səid ilə bacın Fatimə müsəlman oldular,” dedi.

Ömər buna heç ehtimal vermədi. Lakin, içinə düşən şübhəni aradan qaldırmaq üçün, yolunu dəyişdirib birbaşa yeznəsi Səid b. Zeydin evinə getdi. Bu əsnada içəridə Qurani-Kərim oxunurdu. Ömər, qapı qarşısında oxunanları eşitdi. Qapını qırarcasına döydü.

İçəridəkilər Öməri görüncə təlaşlandılar. Ömərin islama olan düşmənliyini bilirdilər. Dərhal Quran səhifəsini saxladılar və qapını açdılar. Ömər:

-“Nədir o oxuduğunuz şey”?, deyə qışqırdı. Yeznəsi:

-“Bir şey yoxdur”, deyə cavab verdi. Ömər:

-“Eşitdiklərim doğruymuş” deyərək, hiddətlə qaynının üstünə atıldı. Araya girən bacısını bir sillə ilə üzünü qan içində qoydu. Canı acıyan bacısı Fatimə:

-“Ey Ömər, Allahdan qorx. Mən və yoldaşım müsəlman olduq, bundan qürur duyuruq və səndən qorxmuruq. Öldürsəndə də dinimizdən dönmərik”... dedi və şəhadət gətirdi. Üzü qan içindəki bacısınının bu halı və sözləri Öməri sarsıtdı, ürəyində bir yumşalma başladı, sanki etdiklərinə peşman idi. Olduğu yerə oturdu:

-“Hələ bu oxuduğunuz şeyi gətirin”, dedi. Bacısı Qurani-Kərim səhifəsini ona verdi. Bu səhifə “Taha” və ya “Hədid” surəsinin ilk ayələri idi. Ömər böyük bir maraq ilə səhifəni oxumağa başladı.

**“Göylərdə və yerdə nə varsa, (hamısı) Allahı təqdis edib şəninə təriflər deməkdədir. O, yenilməz qüvvət sahibi, hikmət sahibidir! Göylərin və yerin hökmü Onun əlindədir. Dirildən də, öldürən də Odur. O, hər şeyə qadirdir! Əvvəl də, axır da, zahir də, batin də Odur. O, hər şeyi biləndir! (Allah Öz əzəli elmi və qüdrəti ilə hər şeyi görüb bildiyi halda, Özü görünməz, dərkolunmazdır. Allahın varlığı aşkar, mahiyyəti isə tamamilə gizlidir).”** (Hədid, 57/1-3)

Ömər bu ayələri oxuduqdan sonra dərin bir düşüncəyə daldı. Allah kəlamının yüksək mənası onun ürəyinə işləmişdi. “Göylərdə və yerdə olan şeylər hamısı Allahındır, bizim bütlərimizin bir şeyi yoxdur...,” deyə düşün-

dü. “Məni Rəsulullahın (s.ə.s) yanına aparın” dedi O əsnada Hz. Peyğəmbər (s.ə.s) Səfa səmtində Ərkamın evində idi.

Ömərin silahlı olaraq gəldiyini görən müsəlmanlar təlaşlandılar. Yalnız, Hz. Həmzə:

-Yaxşılıq üçün gəlirsə nə əla, əks halda gələcəyi varsa, görəcəyi də var, təlaşa ehtiyac yoxdur... dedi. Sağından və solundan iki adam tutaraq Rəsulullahın (s.ə.s) oturduğu yerə apardılar. Ömər, Hz. Peyğəmbərin (s.ə.s) qarşısında diz çökərək şəhadət gətirdi. Orada olanlar sevinclərindən hamısı birdən təkbir gətirdilər. Səfa təpəsindən yüksələn “Allahu əkbər” sədası ilə Məkkə üfüqlərini lərzəyə gətirdilər.[112]

Ömər:

-“Neçə nəfərik”?, deyə soruşdu.

-“Səninlə 40 olduq”, dedilər. Ömər:

-“O halda niyə dayanırıq”? Dərhal çıxaq, Hərəm-i Şərifə gedək, dedi. Bütün müsəlmanlar toplu halda Kəbəyə getdilər.

Qureyş, Darun-Nədvədə nəticəni maraq içində gözləməkdə idi. Müsəlmanların toplu halda Hərəm-i Şərifə irəlilədiyini görüncə:

-“Budur Ömər, hamısını önünə qatıb gətirir”... dedilər.

Ömər Qureyşliləri görüncə:

-“Məni bilən bilsin, bilməyən öyrənsin, Mən Xəttab oğlu Öməırəm. Mən müsəlman oldum”... dedi və şəhadət gətirdi. Qureyşlilər çaş-baş qaldılar. Hər biri bir tərəfə qaçdı.

Müsəlmanlar ilk dəfə Hərəm-i Şərifdə birgə namaz qıldılar.[113]

Həmzə və Ömərin müsəlman olmalarıyla, islamın yayılması sürətləndi. Daha əvvəl 6 il ərzində sayları ancaq 40 nəfərə çata bilmişkən, bir il sonra müsəlmanların sayı 300-ü keçmiş, bunlardan 90-ı Həbəşistana hicrət etmişdi.

---

112. İbn Hişam, *e.a.ə.,* I, 366-371; İbnu’l-Əsir, *e.a.ə.,* II, 84-87.
113. Mahmud Esad Efendi, *e.a.ə.,* II, 238–239.

### D. Müşriklərin Boykot Elanı

#### 1. Müsəlmanların Mühasirəyə Alınması (616 m.)

Məkkə müşrikləri, islam nurunun sönməsi üçün , əllərindən gələn hər şeyi etdilər.

Alay, təhqir və işgəncənin hər növünü sınadılar. Bütün bunlar islamın yayılmasına, müsəlmanların çoxalmasının gündən günə artmasına mane ola bilmirdi.

Məkkə dövrünün 6-ci ili (616 m.) Məhərrəm ayında Qureyş liderlərindən 40 nəfər Əbu Cəhlin başçılığında toplandılar. Haşim oğullarıyla alış-veriş etməməyə, qız alıb-verməməyə, görüşməməyə, iqtisadi və ictimai hər cür əlaqəni kəsməyə qərar verdilər. Bu qərarı bir əhdnamə şəklində yazıb möhürlədilər və bir bezə bükərək Kəbənin içinə asdılar. Beləcə müsəlmanları canlarından bezdirib, Hz. Peyğəmbərin özlərinə təslim ediləcəyini ümid etdilər. Qərara zidd heç bir şey etməyəcəklərinə dair and içərək, güzəştə getmədən tətbiq etməyə başladılar.[114]

Bu qərardan sonra, orada-burada dağınıq halda olan bütün müsəlmanlar Əbu Talib məhəlləsində Haşimilərlə birləşdilər. Əbu Ləhəb, Haşimilərdən olduğu halda, müşriklərlə birlikdə oldu və məhəllədən çıxdı. Əbu Talib müsəlman olmadığı halda, müsəlmanların başına keçdi. Hz. Peyğəmbər də üç ildən bəri iqamət etməkdə olduğu Ərkamın evindən, Əbu Talib məhəlləsinə köçdü. Müsəlmanlar burada üç il (616-619 m.) mühasirə altında qaldılar.

#### 2. Kədərli Günlər

Müsəlmanlar mühasirə altında qaldıqları bu üç il içində çox çətinliklər gördülər. Kifayət qədər ərzaq təmin edə bilmədikləri üçün, aclıqdan ağac yarpaqlarını yeyirdilər. Bəzi kiçik uşaqlar, qidasızlıqdan öldü. Əbu Cəhil gecə-gündüz Əbu Talib məhəlləsinə girib çıxanları nəzarət edir, məhəlləyə gizlicə ərzaq göndərilməsinə imkan vermirdi. Həmzə və Ömər kimi cəsur olanların xaricində kimsə bazara çıxıb alış-veriş edə bilmirdi. Sad b. Əbi Vakkas, bir dəfə tapdığı bir dəri parçasını islatmış, atəşdə qovuraraq yemişdi. Qadınların

114. Buxari, II, 158; Kamil Miras, *e.a.ə.,* VI, 132 (Hədis No: 786); İbnu'l-Əsir, II, 87; Mahmud Esad Efendi, *e.a.ə.,* II, 243-246; İbn Qayyim, *e.a.ə.,* II, 122.

və uşaqların aclıqdan fəryadları məhəllə xaricindən eşidilirdi. Müsəlmanlar illik yemək və digər ehtiyaclarını ancaq "əşhur-i hurum" deyilən qan tökülməsi qadağan dörd ayda (Zilqədə, Zilhiccə, Məhərrəm və Rəcəb) təmin etməyə çalışırdılar. Peyğəmbər əfəndimiz də dəvət və təbliğ vəzifəsini, xüsusilə Məkkəyə çöldən gələnlərə ancaq bu aylarda edə bilirdi. Müsəlmanlar üç il davam edən bu boykot əsnasında dözülməz çətinliklərə dözdülər. Lakin, Qureyş bundan da heç bir nəticə ala bilmədi.

### 3. Boykot Razılaşmasının Ləğvi

Müsəlmanların bu kədərli vəziyyəti müşriklərdən bəzi insaflı kəsləri də narahat etməyə başladı. Hişam b. Amr, Züheyr b. Əbi Ümeyyə, Mutim b. Adiy, Əbul-Bəxtəri, Zema b. Əsvəd və Adiy b. Kays bu qərarı pozmaq üçün razılaşdılar.[115] Qureyşin birgə olduğu bir anda Hərəm-i Şərifə getdilər. İçlərindən Züheyr:

-"Ey Qureyş birliyi, bu etdiyimiz şey, insanlığa yaraşmaz. Biz hər imkandan faydalanarkən, bizim qəbiləmizin bir qolu olan Haşimoğullarının ac buraxılması insafa uyğun gəlməz. Bu qərarın pozulması lazımdır... And içirəm ki, bu zalım əhdnamə cırılmadıqca buradan ayrılmayacağam." deyə sözə başladı. Əbu Cəhil, Züheyri susdurmaq istədisə də, digərləri də onu dəstəklədikləri üçün müvəffəq ola bilmədi.[116]

Əsasən Kəbəyə asdıqları bu əhdnamənin ağac qurdları tərəfindən yeyildiyini Hz. Peyğəmbər (s.ə.s) xəbər vermişdi. Bir küncdə oturmaqda olan Əbu Talib də:

-"Gedin baxın, əgər qardaşım oğlunun sözü doğru çıxmazsa mən hər istədiyinizə razıyam. Amma doğru isə sizin də bu zülmə son verməyiniz lazımdır." demiş, bu xəbər bütün Məkkədə yayılmışdı. Həqiqətən, əhdnaməni cırmaq üçün əllərinə götürdüklərində, bütün yazıların qurdlar tərəfindən yeyilmiş olduğunu gördülər.[117] Müsəlmanlar Məkkə dövrünün 10-cu ilində beləcə bu qorxunc boykotdan xilas olmuş oldular.

---

115. İbn Hişam, *e.a.ə.,* II, 14–17; İbnu'l-Əsir, *e.a.ə.,* II, 88; Mahmud Esad Efendi, *e.a.ə.,* II, 200-252.
116. İbn Hişam, *e.a.ə.,* II, 15-16; İbnu'l-Əsir, *e.a.ə.,* II, 89.
117. İbn Hişam, *e.a.ə.,* II, 16; İbnu'l-Əsir *e.a.ə.,* II, 89-90; İbn Qayyim, *e.a.ə.,* II, 123; Kamil Miras, *e.a.ə.,* VI, 133.

## E. Hüzn İli

### 1. Əbu Talib və Hz. Xədicənin Vəfatı

Müsəlmanlar mühasirədən xilas olduqları üçün sevinirdilər. Çəkdikləri əzabları unutmağa başladılar. Lakin sevincləri uzun çəkmədi. Boykotun ləğvindən 8 ay sonra, iki böyük acı ilə qarşılaşdılar. Məkkə dövrünün 10-cu ili Şəvval ayında əvvəl Əbu Talib, üç gün sonra da Hz. Xədicə vəfat etdi.[118]

Əbu Talib müsəlman olmamışdı.[119] Lakin, Hz. Peyğəmbərə (s.ə.s) son dərəcə bağlı idi. Onu çox sevir, buna görə hər fədakarlığa dözərək, müşriklərdən gələcək pisliklərə qarşı onu qoruyurdu. Ölərkən belə, Haşimoğullarına, "ona bağlı qalmalarını, uğrunda hər fədakarlığı etmələrini, sözündən çıxmamalarını" vəsiyyət etmişdi.

Hz. Xədicə onun qəm ortağı, şəfqətli bir həyat yoldaşı idi. Ən çətin anlarında onu təsəlli edir, bütün varlığı ilə ona dəstək olurdu.

Ən böyük dəstəyi olan, sevdiyi iki insanı arxa-arxaya itirdiyi üçün Rəsulullah (s.ə.s) çox kədərləndi. Bu səbəblə Məkkə dövrünün 10-cu ilinə "Sənətul-huzn" (Hüzn ili ) deyildi.

Müşriklər, Əbu Talibin sağlığında, Hz. Peyğəmbərin (s.ə.s) özünə çox da toxuna bilmirdilər. Onun ölümündən sonra, Rəsulullaha da (s.ə.s) hər cür pisliyi etməyə başladılar. Bir dəfə, Kəbədə namaz qılarkən, Əbu Cəhlin təşviqi ilə Ukbə b. Əbu Muayt, yeni kəsilmiş bir dəvənin bağırsaqlarını gətirib, səcdədə ikən üzərinə qoymuş, Rəsulullah (s.ə.s) başını səcdədən qaldıra bilməmişdi. Qızı Fatimə yetişərək, üzərini təmizləmiş, Rəsulullah (s.ə.s) namazını bitirdikdən sonra ətrafında gülüşən müşrikləri işarə edərək üç dəfə:

-*"Allahım Qureyşdən bu zümrəni sənə həvalə edirəm"* dedikdən sonra:

"Əbu Cəhil, Ukbə b. Əbu Muayt, Şubən b. Haccac, Rəbiənin oğulları Utbə və Şeybəni, Xələfin oğulları Übeyy və Ümeyyəni, sənə həvalə edirəm." deyə adlarını bir-bir saymışdı. Rəsulullahın (s.ə.s) adlarını saydığı bu azğın

118. İbn Qayyim, *e.a.ə.,* II, 123; İbn-Hişam, *e.a.ə.,* II, 57-58; İbnu'l-Əsir, *e.a.ə.,* II, 90-91 (Hz. Xədicə, Əbu Talibdən 50-55 gün sonra vəfat etdiyi rəvayəti də vardır.).

119. Əbu Talib ilə Hz. Peyğəmbərin (s.ə.s) ana və atasının əhli nəcatdan olub olmadığı haqqında bax: Kamil Miras, *e.a.ə.,* IV, 679-703 (Hədis No: 665 və izahı) və X, 57-59 (Hədis No: 1549).

müşriklərin hamısı da Bədir döyüşündə qətl edilib, cəsədləri Bədirdəki **"Qalıb"** deyilən quyuya atılmışdır.[120]

## 2. Taif Səfəri (620 m.)

### a. Hz. Peyğəmbərin Taifdə Qarşılanması

Qureyşin zülmləri artıq dözülməz bir hala gəlmişdi. Buna görə Hz. Peyğəmbər (s.ə.s), Məkkə dövrünün 10-cu ili (620 M.) Şəvval ayında, yanına övladlığı Zeyd b. Harisəni götürərək Taifə getdi. Taifliləri "**Haqq Din**"ə dəvət edəcəkdi.

Taifdə Sakif qəbiləsi vardı, onlar da bütpərəst idi. Rəsulullah (s.ə.s), 10 gün ərzində onlara islamı izah etməyə çalışdı, liderləri ilə görüşdü. Heç biri müsəlman olmadığı kimi, "Səndən başqa peyğəmbərlik gələcək kimsə qalmadımı?" deyə lağ etdilər "Məmləkətimizdən çıx, hara gedirsənsə get.." deyə Allah sevimlisini qovub təhqir etdilər. Taifdən ayrılarkən də balaca uşaqları və aşağı təbəqədən olan şəxsləri yolun iki tərəfinə sıralayıb onu daşlatdılar. Rəsulullahın (s.ə.s) ayaqları, atılan daşlarla ayaqqabıları qanla doldu. Ayaqlarındakı yaraların verdiyi ağrıdan yeriyə bilməz hala gəlib oturmaq istədikcə, məcburən qaldırıb yaralı ayaqlarını daşlamağa davam edirlər. Bu ürək parçalayan kədərli halına gülüb əylənirdilər. Vücudunu atılan daşlara sipər edən övladlığı Zeyd, bir neçə yerindən yaralandı. Rəsulullah (s.ə.s), həyatı boyunca qarşılaşdığı çətinliklərdən ən böyüyünü o gün yaşamışdı. Nəhayət Rəbiənin oğulları Utbə və Şeybənin yol üstündəki bağına sığınaraq bu insanların təqiblərindən xilas ola bildi. Burada bir çardağın kölgəsində əllərini qaldırıb bu qəmli duanı etdi:

-"*İlahi, qüvvətimin zəiflədiyini, çarəsizliyimi, xalqın gözündə xor və alçaq görüldüyümü ancaq sənə ərz edirəm. Ey mərhəmətlilərin ən mərhəmətlisi, hər kəsin zəif görüb də sənə sığınan biçarələrin Rəbbi sənsən İlahi! Heysiyyətsiz və üzsüz bir düşmənin əlinə məni salmayacaq, hətda həyatımı əlinə verdiyim qohumumdan bir dosta belə buraxmayacaq qədər mənə mərhəmətlisən.*

120. Buxari I, 65; Kamil Miras, *e.a.ə.,* I, 161 (Hədis No: 177) və II, 377 (Hədis No: 314) və X, 45 (Hədis No: 1544).

*Ey Rəbbim! Əgər mənə qarşı qəzəbli deyilsənsə, çəkdiyim bəla və çətinlikləri heç vecimə almaram, lakin sənin əsirgəyiciliyin bunları da göstərməyəcək qədər genişdir.*

*Ey Rəbb! Qəzəbinə düçar olmaqdan, razılığından məhrum qalmaqdan, sənin qaranlıqları işıqlandıran, din və dünya işlərini nizamlayan üzünün nuruna sığınıram. Razı olana qədər beləcə əfvini diləyirəm. Bütün qüvvət və qüdrət ancaq səninlədir..."* [121]

Görüldüyü kimi edilən bu qədər əzab və cəfaya baxmayaraq bəddua etməmiş, hətta yolda Məkkəyə iki mil məsafədə "**Qarın**" deyilən yerdə Cəbrayıl gələrək:

-"*Ey Allahın Rəsulu! Allah qövmünün sənə söylədiklərini eşitdi, etdiklərini gördü, sənə bu dağlar mələyini göndərdi. Qövmün haqqında nə diləsən, bu mələyə əmr edə bilərsən..."* dedi. Dağlar əmrinə verilmiş olan mələk də özünü salamladıqdan sonra:

-"*Ey Məhəmməd, əmrinə hazıram. (Əbu Kubeys ilə Kayakan deyilən) bu iki yalçın dağın Taiflilər üzərinə aşıb, bir-birinə qovuşaraq müşrikləri tamamilə əzmələrini istəsən əmr et..."* dedi. Lakin Rəsulullah (s.ə.s):

-"*Xeyr, onların əzilib yox olmalarını deyil, Rəbbimin bu müşriklərin nəslindən, Ona heç bir şeyi ortaq qoşmayan və tək Allaha ibadət edən bir nəsil meydana gətirməsini istəyirəm..."* demişdir.[122]

Rəbiənin oğulları, Peyğəmbər əfəndimizin kədərli halını gördülər. Xristian kölə Addas ilə ona bir salxım üzüm göndərdilər. Rəsulullah (s.ə.s) *"Bismillah..."* deyərək üzümü yeməyə başlayınca, Addas heyrətlə:

-"Bu bölgə xalqı belə söz söyləməzlər, onlar Allah adını xatırlamazlar", dedi. Hz. Peyğəmbər ona haralı olduğunu soruşdu. Addas:

-"Ninovalıyam, xristianam", deyə cavab verdi. Rəsulullah (s. ə.s.):

-"*Demək qardaşım Yunus peyğəmbərin məmləkətindənsən"...* dedi. Addas:

121. Kamil Miras, *e.a.ə.,* II, 614 (Hədis No: 431 və açıqlaması); İbn Hişam, *e.a.ə.,* II, 61; İbnu'l-Əsir, *e.a.ə.,* II, 91–92; İbn Qayyim, *e.a.ə.,* II, 123–124.
122. Buxari, IV, 83; Kamil Miras, *e.a.ə.,* IX, 35 (Hədis No: 1333); İbn Qayyim, *e.a.ə.,* II, 124.

-Sən Yunusu haradan bilirsən? deyə soruşdu. Rəsulullah (s.ə.s):

*-Yunus mənim qardaşımdır. O da mənim kimi peyğəmbər idi* -dedi. Daha sonra Rəsuli-Əkrəm Addasa islamiyyəti izah etdi. Addas da orada müsəlman oldu.[123]

Hz. Məhəmməd (s.ə.s) ən çətin anlarında belə peyğəmbərlik vəzifəsinə laqeyd yanaşmırdı. Rəsuli-Əkrəmin himayəsiz Məkkəyə girməsi qeyri-mümkün idi. Əsasən, həyatı təhlükədə olduğu üçün Məkkədən Taifə getmişdi. Bu səbəblə dönüşdə, Hira (Nur) dağına çıxaraq, Qureyşin hörmət edilən böyüklərindən Mutim b. Adiyə xəbər göndərdi. Onun himayəsində gecə vaxtı Məkkəyə girdi. Kəbəni təvaf edib Hərəm-i Şərifdə iki rükət namaz qıldıqdan sonra evinə döndü. Ərəb adətlərinə görə, bir kimsə himayəsinə götürdüyü adamı qorumağa məcbur idi. Bu səbəblə, Mutim və uşaqları silahlanıb Kəbənin dörd bir tərəfini tutdular. Peyğəmbər əfəndimizin Məkkəyə girib sərbəstcə təvaf etməsini və evinə getməsini təmin etdilər. (620 m.)[124]

Mutim, Bədir döyüşündə müşrik olaraq öldü. Peyğəmbər əfəndimiz, Mutimin bu yaxşılığını unutmamış, Bədir əsirlərinin qurtarılması üçün Mədinəyə gələn oğlu Cübeyr b. Mutimə: - *"Əgər sənin o qoca atan, sağ olsaydı da bu murdar şəxsləri məndən istəsəydi, hamısını ona bağışlayardım."* demişdi.[125]

## III. QƏBİLƏLƏRİ İSLAMA DƏVƏT VƏ AKABƏ BEYƏTLƏRİ

### A. Qəbilələri İslama Dəvət

Hz. Peyğəmbər (s.ə.s) Taifə Şəvval ayında getmişdi. Dönüşündə "əşhür-u hurum" deyilən qan tökülməsi qadağan aylardan Zilqədə girmiş, həcc mövsümü başlamışdı.

Rəsulullah (s.ə.s) Həcc mövsümündə Məkkə yaxınlığında qurulan Ukaz, Məcənnə və Zülməcaz kimi yarmarkalara gedir, oralarda toplanan digər ərəb

123. İbn-Hişam, *e.a.ə.,* II, 62; İbnu'l-Əsir, *e.a.ə.,* II, 92.
124. İbnu'l-Əsir, *e.a.ə.,* II, 92-93; İbn Qayyim, *e.a.ə.,* II, 124; Mahmud Esad Efendi, *e.a.ə.,* II, 278-279.
125. Buxari, V, 20; Kamil Miras, *e.a.ə.,* X, 170 (Hədis No: 1574).

**1. Azanın Məşruiyyəti**

Məscid-i Nəbinin inşası bitdikdən sonra, namaz vaxtlarının müsəlmanlara eşitdirilməsinə ehtiyac hiss edildi. Çünki, namaza erkən gələnlər vaxtın girməsini gözləyib işlərindən qalırlar, gec gələnlər isə camaata yetişə bilmədikləri üçün kədərlənirdilər.

Rəsulullah (s.ə.s) vəhy gəlməyən mövzularda səhabələri ilə müşavirə edərdi.[172] Bu mövzuda edilən müşavirə əsnasında, namaz vaxtlarının "zəng və ya boru çalınaraq, atəş yandırılaraq, yüksək bir yerə bayraq qaldırılaraq eşitdirilməsi" təklifləri edildi. Rəsulullah (s.ə.s), "zəng çalmaq xristianların, boru çalmaq yəhudilərin, atəş yandırmaq atəşpərəstlərin adətidir." deyərək qəbul etmədi. Bayraq qaldırma təklifi də bəyənilmədi. Müşavirə nəticəsində heç bir şeyə qərar verilmədi.

Ənsardan Abdullah b. Zeyd yuxusunda əlində zınqırov olan birisini görmüş, namaz vaxtlarını eşitdirmək üçün bu zınqırovu satın almaq istəmiş, yuxusunda gördüyü bu şəxs ona:

-"Mən sənə daha gözəlini öyrədim" deyərək əzan sözlərini söyləmişdir. Abdullah oyanınca, Rəsulullaha (s.ə.s) gələrək yuxusunda gördüklərini xəbər verdi. Rəsuli-Əkrəm (s.ə.s):

-"İnşallah haqq yuxudur. Bilalın səsi səninkindən gurdur. Gördüyünü ona öyrət. Namaz vaxtında əzanı o oxusun", buyurdu. Bilalın oxuduğu əzan, Mədinənin hər tərəfindən eşidildi. Eyni yuxunu Hz. Ömər də görmüş, lakin Abdullah daha əvvəl xəbər vermişdi.[173] Daha sonra Bilal, səhər azanlarına "**əs-salatu xayrun minən-nəvm**" (namaz yuxudan xeyirlidir.) cümləsini də əlavə etmişdir.

Əzan, şəair-i islamiyədəndir. Vacib dərəcəsində qüvvətli bir sünnədir. Tək yuxu ilə deyil, Rəsulullahın (s.ə.s) sünnəsi və daha sonra enən ayələrlə də sabitdir.[174]

172. Ali-İmran, 3/159.

173. Əbu Davud Süleyman b. Əşas əs-Sicistani, (v. 275/888), *əs-Sünən,* I, 116 (Hədis No: 499), Misir, 1371/1952; Kamil Miras, *e.a.ə.,* II, 451 (Hədis No: 358).

174. Maidə, 5/58; Cumə, 62/9; Kamil Miras, *e.a.ə.,* II, 451 (Hədis No: 358 və şərhi).

### C. Ənsar ilə Mühacirlər Arasında Qardaşlıq

Məkkəli müsəlmanlar, dinləri uğrunda bütün sərvət və varlıqlarını Məkkədə buraxmış, Mədinəyə hicrət edərək mühacir olmuşdular. Mədinəli müsəlmanlar, onları özlərindən belə çox sevərək onlara hər cür köməyi etmiş, onların bütün ehtiyaclarını qarşılamışdılar.[175] Lakin, mühacirlər ənsara yük oluruq, öz qazancımız yoxdur, deyə kədərlənirdilər.

Rəsulullah (s.ə.s), mühacirlərin bu kədərini aradan qaldırmaq, aradakı sevgi və səmimiyyəti gücləndirmək üçün hicrətin 7-ci ayında mühacirlərlə ənsarı, Ənəs b. Malikin evində topladı.[176] Burada, bir mühaciri, bir ənsarla qardaş edərək 90 (və ya 360) nəfər arasında qardaşlıq bağı qurdu.[177] Ənsar, mühacir qardaşlarını götürüb evlərinə apardılar. Mallarına ortaq etdilər. Rəsuli-Əkrəmə (s.ə.s) müraciət edərək:

-Ya Rəsulullah, xurmalıqlarımızı mühacir qardaşlarımızla aramızda paylaşdır... dedilər. Rəsulullah (s.ə.s):

-Xeyr, mülkiyyət sizə aiddir. Mühacir qardaşlarınızla birlikdə işləyin, sonunda məhsulu paylaşacaqsınız... buyurdu.[178] İki tərəf buna razı oldular. Qardaşlar bir-birlərinə o dərəcə bağlandılar ki, başlanğıcda qohumlardan əvvəl bir-birlərinə varis belə oldular.[179]

Ənsardan Sad b. Rəbi, mühacir Əbdürrəhman b. Avfa:

-Mən mal baxımından ənsarın ən zənginiyəm. Rəsulullah (s.ə.s) ikimizi qardaş etdi. Malımın yarısı sənindir. İki arvadım var, dilədiyini boşayacağam. Onu da nikahlayarsan... dedi. Əbdürrəhman:

-Allah malını da, arvadı da sənə mübarək etsin. Mənim bunlara ehtiyacım yoxdur.Sən mənə bazarı göstər... dedi.[180]

175. Həşr, 59/9.
176. Kamil Miras, *e.a.ə.,* VII, 99 (Hədis No: 1035); İbn Qayyim, *e.a.ə.,* II, 146.
177. Kimin kimə qardaş olduğu haqqında bax: İbn Hişam, *e.a.ə.,* II, 150-153; Kamil Miras, *e.a.ə.,* VII, 102-106.
178. Kamil Miras, *e.a.ə.,* VIII, 66-69 (Hədis No: 1145).
179. Ənfal, 8/72.
180. Buxari, III, 3; Kamil Miras, *e.a.ə.,* VI, 407 (Hədis No: 958).

Əbdürrəhman ticarətə başladı və qısa zamanda zəngin oldu. Mühacirlərin böyük qismi ticarətlə həyatlarını qurdular.

Ənsar və mühacirlərdən müəyyən şəxslər arasında Hz. Peyğəmbər tərəfindən edilən qardaşlıq, daha sonra **“Möminlər ancaq qardaşdırlar”** (Hucurat, 49/10) ayəsi ilə daha da təsdiqləndi. Lakin bu qardaşlığın, mirasla əlaqədar hökmü, Bədir döyüşündən sonra **“...Qohum olanlar (miras barəsində) Allahın Kitabında möminlərdən və mühacirlərdən daha yaxındır..”** (Əhzab, 33/6) və **“Allahın Kitabında (miras barəsində) qohumlar bir-birlərinə daha yaxındır.”** (Ənfal, 8/75) ayeyi-kərimələri ilə qaldırıldı.[181] Çünki mühacirlər işləyib, ticarət edərək ilk çətin günlərindən xilas oldular. Bədir döyüşü qənimətlərindən də faydalandıqdan sonra, artıq ənsarın köməyinə ehtiyacları qalmadı.

### Ç. Müsəlmanlarla Yəhudilər Arasında Vətəndaşlıq Razılaşması

Rəsulullah (s.ə.s) Məkkəli mühacirlərlə, Mədinəli ənsarı qardaş edərək bir-birlərinə bağladıqdan sonra, Mədinəni xarici düşmənlərə qarşı müştərək müdafiə etmək məqsədiylə mühacirlər, ənsar və Mədinədəki yəhudilər arasında yazılı bir “vətəndaşlıq razılaşması” hazırladı. Bu razılaşmaya görə:

1. Diyet və fidyələrə aid qaydalar, köhnədən olduğu şəkildə davam edəcək
2. Yəhudilər öz dinlərində sərbəst olacaqlar
3. Müsəlmanlarla yəhudilər, barış içində yaşayacaqlar
4. İki tərəfdən biri, üçüncü bir tərəflə döyüşsə, digər tərəf köməkçi olacaq
5. Tərəflərdən biri Qureyşlə dostluq qurmayacaq və onları himayəsinə götürməyəcək
6. Çöldən bir təcavüz olsa, Mədinə birlikdə müdafiə ediləcək
7. İki tərəfdən biri, üçüncü bir tərəflə sülh etsə, digər tərəf bu sülhü tanıyacaq

---

181. Kamil Miras, *e.a.ə.,* VII, 99-106 (Hədis No: 1035 və şərhi); İbn Qayyim, *e.a.ə.,* II, 146.

8. Müsəlmanlarla yəhudilər arasında çıxacaq hər cür anlaşılmazlıqda Hz. Peyğəmbər (s.ə.s) hakim qəbul ediləcəkdi.[182]

**D. Mədinədə Müsəlmanların Vəziyyəti**

Müsəlmanlar mədinəyə köç etməklə rahatlığa qovuşmuş olmadılar. Bir baxıma təhlükə və düşmənləri daha da çoxaldı. Hicrətdən əvvəl qarşılarında düşmən olaraq yalnız məkkə müşrikləri vardı. Hicrətdən sonra bütlərə sitayiş edən müşriklər, münafiqlər və yəhudilər olmaqla üç sinif düşmənlə qarşı-qarşıya qaldılar.

a. Bütlərə sitayiş edən müşrik ərəblər: Ərəbistanın müxtəlif bölgələrində Kəbəni və bütlərini ziyarətə gələn ərəb qəbilələri sayəsində bol qazanc əldə edən Məkkəlilər, maddi mənfəətlərini bütpərəstliyin yaşamasında gördükləri üçün, islama düşmən oldular və müsəlmanları yox etmək üçün əllərindən gələn hər şeyi etdilər. İslamın, Şam ticarət yolu üzərində olan mədinədə yayılması da onların maraqlarına uyğun gəlmədi. Bu səbəblə hicrətdən sonra, müsəlmanları rahat buraxmadılar. İslamı hələ qüvvətlənmədən yox edə bilmək üçün bildikləri hər üsula müraciət etdilər.

b. Yəhudilər: Evs və Həzrəc qəbilələri arasındakı mübarizəni qızışdıraraq onları zəiflədib, mədinədə iqtisadi yöndən hakim vəziyyətə gələn yəhudilərin də, islam dini mənfəətlərinə uyğun gəlməmişdi. Peyğəmbər əfəndimiz bunlardan gələcək təhlükələrin qaşısını almaq üçün yəhudi qəbilələrinin hər biriylə ayrı-ayrı razılaşmalar etmişdi. Lakin, bunlar razılaşmalara sadiq qalmırlar, Qureyş qəbiləsi və müsəlmanlara düşmən olan digər qəbilələrlə əməkdaşlıq edirdilər.

c. Münafiqlər: Hicrətdən əvvəl Həzrəc qəbiləsinin liderlərindən Abdullah b.Übeyin həzrəc qəbiləsinə rəis olması qərarlaşdırılmışdı. Tərəfdarları ona bəzəkli bir tac belə hazırlamışdılar. İslamın Mədinədə sürətlə yayılması və Rəsulullahın (s.ə.s) buraya hicrət etməsi, Abdullahın rəisliyinə mane oldu. Buna görə Abdullah və tərəfdarları islama düşmən oldular. Lakin mübarizələrini daha təsirli edə bilmək üçün, iman etmədikləri halda

182. 47 maddəlik bu yazılı andlaşmanın tam mətni üçün bax. İbn Hişam, *e.a.ə.*, , II, 147-150; M. Həmidullah, *İslam Peyğəmbəri*, I, 131-134.

müsəlman kimi göründülər. Beləcə bir də "Münafiqlər zümrəsi" meydana gəldi. Peyğəmbər əfəndimiz (s.ə.s) bunları bilir, lakin ayıblarını üzlərinə vurmurdu.

Məkkəli müşriklər, Mədinədəki yəhudilərlə münafiqləri, müsəlmanlara qarşı əl altından davamlı təşviq və təhrik edirdilər. Mədinə ətrafındakı müşrik ərəb qəbilələriylə razılaşmalar edərək Mədinəyə basqın etməyə hazırlanırdılar. Münafiqlərin rəisi Abdullah b. Übeyə bir məktub yazaraq:

"Siz Məhəmmədin (s.ə.s) yurdunuzda sığınmasına icazə verdiniz. Onu öldürməz və ya bizə təslim etməz, yaxud da Mədinədən çıxarmasanız hamınızı öldürmək, əsir etmək və qadınlarınıza təcavüz etmək üçün Mədinəni tutacağıq"[183] deyə münafiqləri belə hədələmişdilər. Mədinəlilərin gözlərini qorxutmaq və müsəlmanlara kömək etməkdən imtina etdirmək üçün bir dəfə də Kürz b. Cabirin əmrindəki bir qrup  ilə Mədinəlilərin otlaqda otlamaqda olan heyvanlarını sürüb aparmışdılar.

Göründüyü kimi müsəlmanlar, Mədinədə hicrətdən sonra da güvən içində olmadılar. Buna görə Peyğəmbər əfəndimiz (s.ə.s), Mədinəni müdafiə etməklə əlaqədar tədbirlər gördü. Mədinədəki yəhudilər və ətrafdakı müşrik ərəb qəbilələri ilə razılaşmalar imzaladı. Ətrafa səriyyələr (kiçik əsgəri birliklər) göndərərək, düşmənin hərəkətlərini idarə altına aldı. Məkkəlilərin Şam ticarət yolunu bağladı. Müşriklərin gecə basqını ehtimalına qarşı gecələri Mədinə küçələrində səhabələr keşik tutdu. Peyğəmbər əfəndimiz (s.ə.s) belə ancaq qapısında növbət çəkildiyi zamanlarda ancaq rahat yata bilirdi.[184]

Müdafiə etmə ilə əlaqədar alınan tədbirlər arasında, müsəlmanların sayını bilməyə də ehtiyac görüldüyündən, Rəsulullah (s.ə.s) "Mənə müsəlman olduqlarını söyləyənlərin adlarını yazın," buyurmuşdur. Siyahıya alma nəticəsində Mədinədə 1500 müsəlmanın olduğu aydın olmuşdur.[185]

---

183. *Əsri Səadət,* I, 327.

184. Kamil Miras, *e.a.ə.,* VIII, 372 (Hədis No: 1217).

185. Buxari, IV, 34; Kamil Miras, *e.a.ə.,* VIII, 483 (Hədis No: 1277).

## II. DÖYÜŞƏ İCAZƏ VERİLMƏSİ VƏ BƏDİR DÖYÜŞÜ (623-624 m.)

**“(Ey möminlər!) Sizinlə vuruşanlarla siz də Allah yolunda vuruşun, lakin həddən kənara çıxmayın. Allah həddi aşanları sevməz!”** (Bəqərə, 2/190)

İslamda əsl olan barışdır. Döyüş, zülmün önlənməsi, haqqın qəbul etdirilməsi üçün qanuni sayılmışdır. 13 illik Məkkə dövründə və Mədinə dövrünün ilk ilində, müşriklərdən gördükləri bu qədər zülm, işgəncə və haqsızlığa baxmayaraq, möminlərə səbrli olmaları, Allahın dinini gözəlliklə təbliğə davam etmələri əmr edilmiş,[186] döyüşə icazə verilməmişdi. Müsəlmanlardan:

-Ey Allahın Rəsulu, nədir bu çəkdiklərimiz? İcazə ver də bunları gizli-gizli öldürək, deyə icazə istəyənlərə Hz. Peyğəmbər (s.ə.s):

-Hələ döyüşə icazə verilmədi, səbr edin, Allahın köməyi yaxındır, çəkdiyiniz əziyyətlərin mükafatını görəcəksiniz, deyə cavab vermişdi.

Hicrətdən sonra müsəlmanlar, müşriklərə qarşı mübarizə edə biləcək vəziyyətə gəldilər. Üstəlik müsəlmanların düşmənləri çoxaldı, səbr yolu ilə barışı davam etdirmək artıq mümkün deyildi. Bundan ötəri hicrətin 2-ci ilinin Səfər ayında;

**“Zülmə məruz qaldıqlarına görə vuruşanlara (kafirlərə qarşı Allah yolunda döyüşməyə) izin verilmişdir. Allah onlara kömək etməyə, əlbəttə, qadirdir! O kəslər ki, haqsız yerə, ancaq “Rəbbimiz Allahdır” - dediklərinə görə yurdlarından (Məkkədən) çıxarıldılar. Əgər Allah insanların bir qismini digər qismi ilə (müşrikləri möminlərlə) dəf etməsəydi, sözsüz ki, içərisində Allahın adı çox zikr olunan soməələr (rahiblərin yaşadığı monastırlar), kilsələr, məbədlər (yəhudi məbədləri) və məscidlər dağılıb gedərdi (darmadağın edilərdi). Allah Ona (öz dininə)**

186. **“(Ya Rəsulum!) İnsanları hikmətlə (Qur’anla, tutarlı dəlillərlə), gözəl öyüd-nəsihət (moizə) ilə Rəbbinin yoluna (islama) də’vət et, onlarla ən gözəl surətdə (şirin dillə, mehribanlıqla, əqli səviyyələrinə müvafiq şəkildə) mübahisə et. Həqiqətən, Rəbbin yolundan azanları da, doğru yolda olanları da daha yaxşı tanıyır!”** Nəhl, 16/125.

**yardım edənlərə, şübhəsiz ki, yardım edər. Həqiqətən, Allah yenilməz qüvvət, qüdrət sahibidir!"** (Həcc, 22/39-40) mənasındakı ayeyi-kərimələrlə, müsəlmanlara özlərini müdafiə etmək üçün döyüş icazəsi verildi.

**A. İlk Səriyyələr**

Rəsulullah (s.ə.s) düşmənin hərəkətini idarə altına almaq, Mədinəni olabiləcək hər təhlükədən qorumaq üçün, ətrafdakı bəzi bölgələrə "kəşf qrupları" (səriyyə) göndərmiş, lakin özlərinə silahlı hücum olmadıqca vuruşmağa icazəsi verməmişdir.

Hicrətin ilk ilində üç səriyyə göndərilmişdir. İlk səriyyə, Hz Peyğəmbərin (s.ə.s) əmisi. Hz. Həmzənin əmrindəki 30 şəxslə olan səriyyədir. İslamda ilk bayraq bu səriyyəyə verilmişdir.

2-ci səriyyə, Rəsulullahın (s.ə.s) əmilərindən Ubeydə b.Harisin əmrində, 3-cü səriyyə isə Sad b. Əbi Vakkasın əmrində göndərilmişdir.

Bunlar Qureyş karvanlarını təqib üçün göndərilmişdilər. İlk iki səriyyədə qarşılaşma olduğu halda vuruşma olmamışdır. Yalnız Sad b. Əbi Vakkas, ikinci səriyyədə bir ox atmışdır ki, islamda Allah yolunda atılan ilk ox budur.

Bu səriyyələr, hicrətin 7-8 və 9-cu (Ramazan, Şəvval və Zilqədə) aylarında göndərilmişdir.

Səriyyə: Rəsulullahın (s.ə.s) özünün iştirak etmədiyi kiçik hərbi dəstəsi deməkdir. Rəsulullahın (s.ə.s) iştirak və şəxsən idarə etdiyi əsgəri hərəkata isə "Qəzvə" deyilir. Səriyyələr, ümumiyyətlə gecə çıxarılan və sayları 5-400 arasında dəyişən əsgəri birliklərdir. Qəzvələrin sayı 19-dur.

**1. Abdullah b. Caxş Səriyyəsi və Bətni-Nəhlə Hadisəsi**

Mədinəyə basqın hazırlığı görən Qureyşin hərəkətindən xəbər almaq üçün Peyğəmbər əfəndimiz, Rəcəb ayının son günlərində, Məkkə tərəfinə bibisinin oğlu Abdullah b. Caxş əmrində, 8 nəfərlik bir səriyyə göndərdi. Sadəcə iki gün sonra açmaq üçün Abdullaha bir məktub verməşdi. Məktubda, Məkkə ilə

Taif arasındakı Nəhlə vadisinə qədər gedilməsi, Qureyşin fəaliyyətləri haqqında məlumat toplanılması istənilirdi.[187]

Nəhlə vadisində, Qureyşin Taifdən dönməkdə olan bir karvanına rast gəldilər. Karvanın rəisi Əmr b. Hadramı öldürüb, ələ keçirdikləri iki əsir və qənimət olaraq götürdükləri mallarla Mədinəyə döndülər. Rəsulullah (s.ə.s) bu hadisəni xoş qarşılamadı. Çünki, onlara vuruşma icazəsi verilməmişdi. Üstəlik bu hadisə, qan tökülməsi qadağan sayılan "əşhur-i hurum"dan Rəcəb ayında meydana gəlmişdi. Məkkə müşrikləri bu hadisədə öldürülən Əmr b.Hadramın intiqamını bəhanə edərək döyüş hazırlıqlarını sürətləndirdilər. "Məhəmməd haram aylara belə hörmət göstərmir, haram aylarda qan tökür, yağma edir." deyə danışmağa başladılar.[188]

**2. Qiblənin Dəyişməsi**

İslamın ilk illərində namaz, Beyt-i Məqdisə (Qüdsə) doğru qılınırdı. Ancaq, hicrətdən əvvəl Rəsulullah (s.ə.s) Məkkədə namaz qılarkən, mümkün mərtəbə Kəbəni arxasına almazdı. Kəbə ilə Beyt-i Məqdis arasında qalacaq şəkildə, Rükn-i Yəməni ilə Rükn-i Hacər-i əsvəd arasında namaza durardı. Beləcə həm Kəbəyə həm də Qüdsdəki Məscid-i Əqsaya yönəlmiş olurdu. Hicrətdən sonra Mədinədə Məscid-i Əqsaya yönəldiyində Kəbənin arxa tərəfdə qalmasından Rəsulullah (s.ə.s) hüznlənir və qiblənin Kəbəyə çevrilməsini içdən arzu edirdi.[189] Çünki Kəbə, atası Hz. İbrahimin qibləsi idi.

Hicrətdən 16-17 ay sonra, Şaban ayının 15-ci günü Hz. Peyğəmbər (sa.s.) Mədinədə Sələməoğulları yurdunda günorta namazını qıldırarkən, ikinci rükətin sonunda[190]

**" (Ya Rəsulum!) Biz sənin üzünün göyə tərəf çevrildiyini görürük,**

187. İbn Hişam, *e.a.ə.,* II, 252; İbnu'l-Əsir, *e.a.ə.*, II, 113.

188. Bəqərə, 2/217; İbn Hişam, *e.a.ə.,* II, 254 .

189. İbn Qayyim, *e.a.ə.,* II, 147.

190. Buxari, I, 15; Kamil Miras, *e.a.ə.,* I, 41 (Hədis No: 38); İbnu'l-Əsir, *e.a.ə.,* III, 252; Mahmud Esad Efendi, *e.a.ə.,* III, 65; Tahir Olgun, *e.a.ə.,* s. 80; Mehmed Zihni Efendi, *Kitabü's-Salat*, s. 75, İstanbul, 1326.

**ona görə də səni razı olduğun qibləyə tərəf döndərəcəyik. İndi üzünü Məscidülhərama tərəf çevir! (Ey müsəlmanlar!) Harada olsanız (namaz vaxtı) üzünüzü oraya döndərin! Kitab verilmişlər bunun öz Rəbbi tərəfindən bir həqiqət olduğunu yaxşı bilirlər. Allah onların əməllərindən xəbərsiz deyildir."**[191] mənasındakı ayə nazil oldu. Hz. Peyğəmbər yönünü dərhal Qüdsdən Məscid-i Hərəmə çevirdi. Camaat da saflarıyla birlikdə döndülər. Qüdsə doğru başlanılan namazın, son iki rükəti, Kəbəyə yönələrək tamamlandı. Buna görə Sələməoğulları məscidinə "Məscid-i Qibləteyn" (iki qibləli məscid) deyilmişdir.

### B. İlk Qəzvələr

Məkkə müşrikləri, Mədinəyə basqın hazırlığı edirdilər. Rəsulullah (s.ə.s), düşmənin hazırlıqları haqqında məlumat əldə etmək üçün zaman-zaman səriyyələr göndərdiyi kimi, Mədinə ilə Məkkə arasındakı qəbilələrlə görüşüb razılaşmalar etmək, Qureyşin planladığı yağmaların qarşısını almaq üçün şəxsən özü də əsgəri birliklərə qatıldı. Rəsulullahın (s.ə.s) qatılıb şəxsən idarə etdiyi əsgəri hərəkata "Qəzvə" deyilir.

Rəsulullahın (s.ə.s) ilk qəzvəsi, 60 nəfərlik dəstə ilə Əbva kəndinə edilən qəzvədir.[192] Hicrətin ikinci ili Səfər ayının əvvəlində edilmişdir. Eyni il içində sırasıyla Buvat, Uşeyrə, Kiçik Bədir və Böyük Bədir qəzvələri olmuşdur. İlk dördündə düşmənlə qarşılaşma olmamış, qan tökülməmişdir. Böyük Bədir qəzvəsi, müsəlmanların etdiyi ilk döyüş olmuşdur.

### C. Müsəlmanlar Bədirdə (17 Ramazan 2 h./13 Mart 624 m.)

**"(Ey Rəsulum!) Həqiqətən, siz Bədrdə (düşmənə nisbətən az və) zəif olduğunuz halda, Allah sizə yardım etdi. (Allaha) şükür edən olmaq üçün Allahdan qorxun!"** (Ali-İmran, 3/123)

Qureyş Mədinəni tutaraq Rəsulullahı (s.ə.s) öldürmək və islamı ortadan qaldırmaq üçün hazırlanırdı. Ediləcək döyüşün xərclərini qarşılamaq üçün, Əbu Süfyanın başçılığında böyük bir ticarət karvanı Mədinə yolu ilə Şama

---

191. Bəqərə, 2/144.
192. İbn Hişam *e.a.ə.,* II, 241.

göndərilmişdi. Nəhlə vadisində öldürülən Əmr b.Hadramın qardaşı Amir, Məkkə küçələrində lümlüt:

-“Vah Amrah, vah Amrah!” deyərək gəzir, xalqı döyüşə və intiqama təşviq edirdi. Karvan dönər-dönməz, Mədinəyə hücum edəcəkdilər.

Göndərdiyi səriyyələr (kəşfiyyat) vasitəsi ilə Hz. Peyğəmbər (s.ə.s), Məkkədə olub bitənləri, edilən hazırlıqları tamamilə öyrənmişdi. Əbu Süfyanın idarəsindəki ticarət karvanından əldə ediləcək qazanc, müsəlmanlarla ediləcək döyüş üçün istifadə ediləcəkdi. Buna görə, Rəsulullah (s.ə.s), Şama gedərkən mane olmaq üçün “Uşeyrə” deyilən yerə qədər bu karvanı izləmiş lakin yetişə bilməmişdi. Dönüşünü xəbər alınca, karvanı ələ keçirmək məqsədiylə, Ramazanın 12-ci günü Abdullah b. Ümmi Məktumu Mədinədə imam buraxaraq 313 səhabə ilə şəhərdən çıxdı. Yolda ənsardan Əbu Lübabəni Mədinəyə gözətçi təyin edərək, geri göndərdi. 8 nəfər də üzrləri səbəbiylə icazə aldılar. Bununla da 64-ü mühacir, digərləri də ənsardan omaqla 305 nəfər qaldılar. Minik yetişmədiyi üçün dəvələrə növbəli minirdilər.

Əbu Süfyan, dönüşdə müsəlmanların karvana hücum etmə ehtimalına qarşı Məkkəyə xəbərçi göndərərək qorunması üçün kömək istəmişdi. Döyüş hazırlığı edən Məkkəlilər, karvanı qurtarmaq və müsəlmanlardan intiqam almaq üçün Əbu Cəhlin əmrində 950-1000 nəfərlik bir ordu ilə hərəkət etdilər. Əbu Ləhəbdən başqa bütün Qureyş liderlərinin qatıldığı bu ordunun 200-ü atlı, 700-ü dəvəli, digərləri də piyada idi. Zireh, ox, mızraq, qılınc kimi hər cür döyüş alət və silahları tamam idi. Əbu Ləhəb, xəstəliyi səbəbiylə səfərə qatıla bilməmiş, yerinə əvəz olaraq başqasını göndərmişdi.

### 1. İki Qalibiyyətdən Biri

Karvanı araşdırdığı əsnada, yolda Safra yaxınlığında Zəfiran vadisində Qureyşin böyük bir ordu ilə karvanı qurtarmaq üçün Mədinəyə doğru hərəkət etdiyini öyrənən Rəsulullah (s.ə.s), vəziyyəti müsəlmanlara izah edərək:

-Qureyş Məkkədən çıxmış, üzərimizə doğru gəlir. Karvanımı izləyək, yoxsa Qureyş ordusunumu qarşılayaq? deyə müşavirə etdi. Mədinədən döyüş

hazırlığı ilə çıxılmadığı üçün, əksəriyyət karvanın təqib edilməsini istəyirdi.[193]

Rəsulullahın (s.ə.s) bu vəziyyətə kədərləndiyini görən Hz. Əbu Bəkir və Hz. Ömər növbə ilə ayağa qalxaraq, Qureyş ordusunun qarşısına çıxmağın daha uyğun olacağını müdafiə etdilər. Hz. Peyğəmbər (s.ə.s), bu mövzuda ənsarın düşüncəsini öyrənmək istəyirdi. Sonra ilk müsəlmanlardan Mikdad b. Əsvəd, mühacirlərin adından danışmağa başladı.

-Biz, qövmünün Hz. Musaya "Sən və Rəbbin gedin və düşmənə qarşı döyüşün. Biz burada oturub gözləyək",[194] dedikləri kimi deməzik. Biz sənin sağında, solunda, qarşında arxanda vuruşarıq. Allah və Rəsulunun əmri nə isə ona itaət edərik. Sən hara gedərsən oraya gedərik,[195] dedi. Ənsar adına danışan Sad b. Muaz da:

-"Ey Allahın Rəsulu, biz sənə iman etdik. Gətirdiyin Quranın haqq olduğuna şahidlik etdik, sözlərini dinləməyə və itaət etməyə, düşmənə qarşı səni qorumağa söz verdik. Sən necə istəsən elə et. Səni haqq Peyğəmbər olaraq göndərən Allaha and içirəm ki, sən bizə dənizi göstərib ora girsən biz də girərik, heç vaxt geri dönmərik. Biz düşmənlə döyüşməyi bilirik. Allaha güvənərək düşmən ordusunun üzərinə gedək..."[196] dedi. Rəsulullah (s.ə.s) bu danışmadan son dərəcə məmnun oldu.

-Elə isə haydı Allahın adıyla yeriyin. Sizi müjdələyirəm ki, **"Allah iki taifədən birini (karvanın ələ keçərilməsi və ya Qureyş ordusunun uduzmasını) bizə vəd etdi"**.[197] Zəfərimiz qətidir. Mən indidən Qureyş rəislərinin hərb meydanında yıxılacaqları yerləri görür kimiyəm, buyurdu. Sonra da Bədirə doğru hərəkət etdi.[198]

Bədir dəvə yeriyişi ilə Mədinəyə 3, Məkkəyə isə 10 günlük (80 mil) məsafədə bir kənd idi. Hər il burada yarmarka qurular, bu səbəblə Suriya-

193. Ənfal, 7/5-6.
194. **(İsrail oğulları) dedilər: "Ey Musa, nə qədər ki, onlar oradadırlar, biz ora girməyəcəyik. Sən və Rəbbin gedib onlarla vuruşun. Biz isə burada oturacağıq".** Maidə, 5/24.
195. Buxari, V, 4; Kamil Miras, *e.a.ə.,* X, 146 (Hədis No: 1562); İbn Hişam, *e.a.ə.,* II, 266; İbnu'l-Əsir, *e.a.ə.*, II, 120.
196. İbn Hişam, *e.a.ə.,* II, 267; İbnu'l-Əsir, *e.a.ə.*, II, 120; Müslim, III, 1403 (Hədis No: 1779).
197. Ənfal, 8/7.
198. İbn Hişam, *e.a.ə.,* II, 267; İbn Qayyim, *e.a.ə.,* II , 217; Kamil Miras, *e.a.ə.,* X, 148-149.

ya gedən karvanlar buradan keçərdi. Qureyş ordusu bura müsəlmanlardan əvvəl gəlib, suyun başını tutmuşdu. Əbu Süfyanın idarəsindəki 50 nəfərlik Qureyş karvanı isə,müsəlmanlar Mədinədən çıxdıqları əsnada, sahil yolunu izləyərək Mədinədən uzaqlaşmış, Qureyşlilərə də geri qayıtmaları üçün xəbər göndərilmişdi. Lakin, ordusuna çox güvənən Əbu Cəhil döyüşmək istəyirdi. Buna görə Məkkəlilər geri dönməyib, Bədirə qədər irəliləmişlər və burada qərargah qurmuşdular.

**2. Tərəflərin Vəziyyəti**

17 Ramazan 2 h. /13 Mart 624 m. Cümə günü iki ordu Bədirdə qarşılaşdı. Ərəblər əvvəllər həmişə qəbiləçilik təəssübkeşliyi ilə döyüşmüşdülər. Bu döyüşdə isə din uğrunda eyni qəbilənin insanları bir-birləriylə vuruşacaq, qardaş, əmi, qardaş (bacı) oğlu, hətta, ata-oğul bir-birlərini öldürəcəkdilər.[199]

Müsəlmanların bayraqdarı Musab b. Umeyrin qardaşı Əbu Əziz, Qureyşin bayraqdarıydı. Utbə b. Rəbiənin oğullarından Vəlid öz yanında, ikinci oğlu Əbu Huzeyfə möminlərin arasında idi. Hz. Əbu Bəkrin bir oğlu Abdullah özü ilə birlikdə, digər oğlu Əbdürrəhman isə müşriklər tərəfində idi. Rəsulullahın (s.ə.s) əmilərindən Hz. Həmzə öz yanında, digər əmisi Abbas isə qarşı tərəfdə iştirak edirdi. Hz. Peyğəmbəri ömrü boyunca himayə etmiş olan əmisi Əbu Talibin bir oğlu Hz. Əli müsəlmanlar içində, digər oğlu Aqil isə müşriklərin safında idi. Rəsulullahın (s.ə.s) ilk xanımı Hz. Xədicənin qardaşı Novfəl ilə kürəkəni (qızı Zeynəbin yoldaşı) Əbul-As müşriklər içində idilər.[200]

Düşmən ordusu say, silah, təcrübə və qüvvə baxımından müsəlmanlardan qat-qat üstün idi. Olduqları yer də döyüş üçün daha əlverişli idi. Ancaq, səhərə yaxın yağan yağış, üzərində rahat yerimək mümkün olmayan qumlu zəmini sərtləşdirmiş və müsəlmanların su ehtiyacını qarşılamışdı. Beləliklə müsəlmanların əhvalları yüksəlmiş, Allahın köməyinə sonsuz güvən hiss etməyə başlamışdılar. Özləri üçün ölüm-qalım demək olan bu döyüşdə, islamın izzəti və üstünlüyü üçün Allaha dua edirdilər.

---

199. Ali-İmran, 3/13.
200. Mahmud Esad Efendi, *e.a.ə.,* III, 100-101.

### 3. Döyüş Başlayır

Qureyş addım-addım müsəlmanlara yaxınlaşırdı. Mənzərə çox qəmli idi. Bir ovuc müsəlman, "*Allah adını ucaltmaq üçün*", təpədən-dırnağa kimi silahlı böyük müşrik ordusunun qarşısına çıxırdı. Rəsulullah (s.ə.s), yanına Hz Əbu Bəkri götürərək, özü üçün hazırlanan kölgəliyə çəkildi, əllərini səmaya qaldırıb: *"Ya Rəbb, budur Qureyş bütün qürur və kibiriylə sənin dinini yox etmək üçün gəldi. Sənə meydan oxuyur, peyğəmbərini yalanlayır. Ya Rəbb, peyğəmbərlərinə kömək edəcəyinə dair əhdini, mənə verdiyin zəfər vədini gözləyirəm. Bu bir ovuc mömin tələf olub yox olsa, bu gündən sonra yer üzündə sənə ibadət və qulluq edəcək kimsə qalmayacaq..* " -deyə dua edirdi.

Rəsuli-Əkrəm (s.ə.s) vəcd içində, özündən keçərək, o qədər çox dua etmiş və əllərini elə səmaya qaldırmışdı ki, kürəyindən ridasının düşdüyünü belə bilməmişdi. Hz. Əbu Bəkir onun ridasını örtüb, əlindən tutaraq: Ey Allahın Rəsulu, yetər artıq, duan ərşi titrətdi, Allah vədini yerinə yetirəcək, dedi. Rəsulullahın (s.ə.s) bu halını görən müsəlmanlar həyəcandan ağlayırdılar. Nəhayət Rəsuli-Əkrəm (s.ə.s): **"(Bədr vuruşunda) bu dəstə mütləq məğlub olacaq və arxa çevirib qaçacaqdır!"** (Qəmər, 54/45) mənasındakı ayeyi-kərimәni oxuyaraq çadırdan çıxdı.[201] Allah köməyini beləcə müjdələmiş, zəfərin müsəlmanların olacağını bildirmişdi.[202]

Döyüşü Qureyş başlatdı. Bətn-i Nəhlə də qardaşı öldürülən Əmiri-Hadraminin atdığı ox, Hz. Ömərin azadlı köləsi Mihcaya dəyərək onu şəhid etdi.

Döyüşdən əvvəl, hər iki tərəfdən bir neçə adamın ortaya çıxıb vuruşaraq tərəfləri qızışdırması adət idi. Buna "mübarizə" deyilirdi. Qureyş rəislərindən Utbə b. Rəbiə, qardaşı Şeybə ilə oğlu Vəlid birlikdə irəlilədilər. Müsəlmanlardan özlərinə qarşı çıxacaq ər istədilər. Bunlara qarşı Hz. Peyğəmbərin (s.ə.s) əmri ilə Ubeydə, Həmzə və Əli çıxdılar. Həmzə Şeybəni, Əli də Vəlidi bir hücumda öldürdülər. Sonra yaralı Ubeydənin köməyinə qaçıb Utbənin də işini bitirdilər.[203]

---

201. Buxari, III, 230; Müslim, III, 1384 (Hədis No: 1763) İbn Hişam, *e.a.ə.,* II, 279; İbnu'l-Əsir, *e.a.ə.,* II, 125; Kamil Miras, *e.a.ə.,* VIII, 385 (Hədis No:1228).
202. Ənfal, 8/9-12.
203. İbn Hişam, *e.a.ə.,* II, 277; İbnu'l-Əsir, *e.a.ə.,* II, 125.

## 4. Haqqın Batilə Zəfəri

Artıq döyüş qızışmışdı, müşriklər hücuma keçdilər. Möminlər qəhrəmanlıqla mübarizə edirdilər. Allahın köməyi ilə müşrik ordusunu məğlubiyyətə uğratdılar.[204] Müşriklər döyüş meydanında 70 ölü, 70 əsir buraxaraq qaçdılar. Öldürülənlərdən iyirmi dördü müsəlmanlara ən çox düşmənlik edən Qureyş böyükləri idi. Döyüşün baş komandiri Əbu Cəhil də ölənlər arasında idi.[205] Müsəlmanlardan şəhid olanlar isə altısı mühacirlərdən, səkkizi də ənsardan olmaqla 14 nəfər idi.[206]

Bədir zəfəri Mədinədə bayram sevinci meydana gətirdi. Məkkə isə matəmə büründü. Əbu Ləhəb bir həftə sonra kədərindən öldü. Lakin Qureyşlilər, müsəlmanlar sevinməsinlər deyə yas tutmadılar.

Zəfərdən sonra Rəsuli-Əkrəm (s.ə.s) Bədirdə üç gün qaldı. Şəhidlər dəfn edildi. Meydanda qalan müşrik ölüləri bir çuxura basdırıldı.

Rəsulullah (s.ə.s), Bədirdən ayrılacağı əsnada bu çuxurun başında durub, içindəki cəsədlərin hər birinin adını söyləyərək: -*Ey filan oğlu filan, biz Rəbbimizin bizə vəd etdiyi zəfər həqiqətə çevrildi. Siz də sizin rəbbinizin sizə vəd etdiyi həqiqəti gördünüzmü?* -deyə səsləndi.[207] Hz. Ömər: -Ey Allahın Rəsulu, ruhları olmayan cəsədlərləmi danışırsan? dedikdə, Rəsulullah (s.ə.s): -*Allaha and içirəm ki, söylədiklərimi siz onlardan daha yaxşı eşitmirsiniz* -buyurdu.[208]

## 5. Bədir Əsirləri

Hz. Peyğəmbər (s.ə.s) yolda Safra deyilən yerdə, əldə edilən qənimətləri qazilərə bərabər olaraq paylaşdırdı. Müxtəlif səbəbdən ordudan ayrılmış olan 8 adama da pay ayırdı. Əsirlərlə əlaqədar hələ bir hökm enməmişdi. Mədinəyə gəlincə Rəsulullah (s.ə.s), bu mövzunu səhabələriylə müşavirə etdi. Hz Əbu

---

204. Ali-İmran, 3/123.
205. Kamil Miras, *e.a.ə.,*VIII, 507-509 (Hədis No: 1298).
206. İbnu'l-Əsir, *e.a.ə.,* II, 136.
207. Buxari I, 65; Kamil Miras, *e.a.ə.,* I, 161-164 (Hədis No: 177) və II, 377-378 (Hədis No: 314)
208. Buxari V, 8; Kamil Miras, *e.a.ə.,* IV, 734 (Hədis No: 673) və X, 160 (Hədis No: 1567); İbn Hişam, *e.a.ə.,* II, 292; İbnu'l-Əsir, *e.a.ə.,* II, 129.

Bəkir, fidyə (qurtuluş əvəzi) qarşılığında sərbəst buraxılmalarını, Hz. Ömər isə hamısının boyunları vurularaq öldürülmələrini istədi. Rəsuli-Əkrəm (s.ə.s) və səhabələrin əksəriyyəti Hz. Əbu Bəkrin təklifini uyğun gördülər.[209] Əsirlərdən fidyələrini ödəyənlər, dərhal sərbəst buraxıldı. Ödəyə bilməyənlər isə, hər biri Mədinəli 10 uşağa oxuyub-yazma öyrətmək şərtiylə azadlığa buraxıldı..

Bu hadisə, dinimizin elmə və oxuyub yazmağa nə qədər çox əhəmiyyət verdiyini, Rəsulullahın (s.ə.s) müsəlmanların düşməni olan müşriklərə belə müəllimlik etdirməkdə qorxu görmədiyini göstərməkdədir.

### 6. Bəni Kaynuka Yəhudilərinin Mədinədən Çıxarılması (Şəvval 2 h./Aprel 624 m.)

Hz. Peyğəmbər (s.ə.s), Mədinədə yəhudilərlə müqavilələr imzalayaraq onlarla sülh şəraitində yaşamaq istəyirdi. Lakin yəhudilər, daim düşmən kimi davranırdılar. Hər fürsətdə Evs və Həzrəc qəbilələri arasındakı köhnə düşmənçiliyi xatırladıb, müsəlmanları bir-birinə vurmağa çalışırdılar. Özləri əhl-i kitab və tək Allah inancında olduqları halda, "müşriklər, möminlərdən daha doğru yolda"[210] dedilər. Səhər müsəlman kimi görünüb, axşam dönərək,[211] müsəlmanlara lağ etdilər. Hz. Peyğəmbər (s.ə.s) və müsəlmanlar əleyhinə şeirlər yazdılar. Halbuki, əllərində olan Tövratdakı məlumatlardan Hz. Məhəmmədin (s.ə.s) haqq peyğəmbər olduğunu da bilir,[212] amma buna baxmayaraq düşmənlik edirdilər.

Müsəlmanlarla Mədinədəki yəhudi qəbilələri arasında edilən vətəndaşlıq razılaşmasını ilk pozan Kaynukaoğulları oldu.[213]

Müsəlmanlardan bir qadın, Kaynuka yəhudilərindən bir zərgərin dükanında alış-veriş edərkən, bir yəhudi, qadının xəbəri olmadan onun örtüyünün ətəyini arxasına bağlamış, qadın qalxıb getmək istəyəndə hər tərəfi açılmış-

---

209. İbnu'l-Əsir, *e.a.ə.,* II, 136; Ənfal 8/67-68.
210. Nisa, 4/51.
211. Ali-İmran, 3/72.
212. Bəqərə, 2/146.
213. İbnu'l-Əsir, *e.a.ə.,* II, 137.

dı. Qadının fəryadına gələn bir müsəlman bu yəhudini öldürmüş, orada olan yəhudilər də bu müsəlmanı öldürmüşdülər. Bu hadisə səbəbindən Kaynukaoğulları ilə müsəlmanların arası pozuldu.[214] Rəsulullah (s.ə.s), Bəni Kaynukaya müqaviləni yeniləməyi təklif etdi, onlar buna razı olmadılar.

-"Sən bizi, döyüş bilməyən Məkkəlilərdənmi sanırsan? Biz döyüşə hazırıq...." dedilər.[215] Rəsulullah (s.ə.s), Əbu Lübabəni Mədinədə vəkil buraxaraq Şəvval ayının ortalarında ordusu ilə Bəni Kaynukanı mühasirəyə saldı. Mühasirə 15 gün davam etdi. Kaynukaoğulları digər yəhudi qəbilələri və münafiqlərdən gözlədikləri köməyi ala bilmədikdə, təslim olmağa məcbur oldular. Müqaviləni pozduqları, vətənə xəyanət etdikləri üçün öldürülmələri lazım idi. Kaynukaoğulları daha əvvəl Həzrəc qəbiləsinin himayəsində idi. Həzrəc qəbiləsi əşrafından, münafiqlərin başçısı Abdullah b. Ubey, bunu bəhanə edərək bunların öldürülməmələri üçün təkid etdiyindən, Rəsulullah (s.ə.s) Mədinədən çıxarılmalarını əmr etdi. Bununla da 700 nəfərdən ibarət Kaynuka yəhudiləri, Mədinədən Şam tərəfə sürgün edildilər.[216] Ələ keçən qənimət mallarının beşdə biri beytül-mala (dövlət xəzinəsinə) ayrıldı.[217] Geri qalanı qazilərə paylaşdırıldı. Torpaqları da, torpaqsız müsəlmanlara verildi. Beləliklə müsəlmanlar, yəhudilərin ən cəsuru sayılan Kaynukaoğullarının düşmənçiliklərindən xilas olmuş oldular.

### 7. Sevik Qəzvəsi (Zilhiccə 2 h./May 624 m.)

Bədir döyüşündə Məkkəlilərin liderləri öldürülmüş, Qureyşin başına Əbu Süfyan keçmişdi. Əbu Süfyan müsəlmanlarla döyüşüb, Bədir məğlubiyyətinin qisasını almadıqca qadınlarına yaxınlaşmayacağına, yuyunmayacağına və qoxu sürməyəcəyinə and içmişdi. 200 atlı ilə Məkkədən çıxaraq Mədinəyə bir saatlıq məsafədə Urayz kəndinə gəlmiş, cüt sürməkdə olan ənsardan Sad b. Amir ilə xidmətçisini şəhid edib bir neçə ev və xurma ağaclarını yandırdıqdan sonra, **"andım yerinə gəldi",** deyərək dönüb qaçmışdır.

214. İbn Hişam, *e.a.ə.,* III, 51; İbnu'l-Əsir, *e.a.ə.,* II, 138.
215. İbn Hişam, *e.a.ə.,* III, 50; İbnu'l-Əsir, *e.a.ə.,* II, 137.
216. İbn Qayyim, *e.a.ə.,* II, 230.
217. Ənfal, 8/41; İbnu'l-Əsir, *e.a.ə.,* II, 138.

Hz. Peyğəmbər (s.ə.s) bu vəziyyəti eşitdikdə 80 süvari, 120 piyada ilə dərhal təqibə çıxmasına baxmayaraq, Əbu Süfyan sürətlə qaçdığı üçün ona yetişə bilməmişdir. Məkkəlilərin ərzaq olaraq gətirib, qaçarkən ağırlıq olmasın deyə buraxdıqları çuvallardakı qovrulmuş un (sevik) müsəlmanların əlinə keçdiyinə görə, bu qəzvəyə Sevik (qovrulmuş un, kavut) Qəzvəsi deyilmişdir.[218]

## Ç. Hicrətin İkinci İlində Olan Digər Hadisələr

Mədinə dövrünün 2-ci ilində, Bədir döyüşündən əvvəl Şaban ayında Ramazan orucu fərz qılındı. Zəkat da hicrətin 2-ci ilində fərz qılınmışdır. Bəzi islam alimləri, zəkatın Məkkə dövrüdə fərz qılındığı, Mədinə dövründə isə, zəkatın veriləcəyi yerlərin təyin olunduğu fikirindədir.[219] Yenə bu ildə Ramazan, Qurban bayramları namazları ilə fitrə sədəqəsi və qurban kəsmək fərz qılınmışdır.[220]

Rəsulullahın (s.ə.s) qızı Hz. Osmanın arvadı Ruqiyyə Bədir zəfəri əsnasında Mədinədə vəfat etmişdir. Yoldaşı xəstə olduğuna görə Hz. Osman Bədir döyüşünə qatıla bilməmişdir.

Rəsulullaha (s.ə.s) ilk vəhyin gəldiyi il doğulmuş olan ən kiçik qızı Hz. Fatimə ilə Hz. Əli bu ildə evlənmişlər. Evlənənə qədər Hz. Əli Rəsulullahla (s.ə.s) birgə qalmış və onun yanında yetişmişdi. Evləndikdən sonra ayrı bir evə köçdülər. Rəsulullahın (s.ə.s) ən sevimli qızı Fatiməyə cehiz olaraq verdiyi əşyalar; bir yataq, bir döşəkçə, (döşək), bir su tuluğu, bir əl dəyirmanı, iki su bardağı və bir su qabından ibarətdir.

Bədir əsirləri arasında Hz. Peyğəmbərin (s.ə.s) kürəkəni, Zeynəbin yoldaşı Əbul-As da vardı. Zeynəb, yoldaşının fidyəsi (qurtuluş əvəzi) üçün özünə anası Hz. Xədicə tərəfindən toy hədiyyəsi olaraq verdiyi boyunbağını da göndərmişdi. Bunu görüb kədərlənən Rəsulullah (s.ə.s) və səhabələri, Əbul-Ası fidyə almadan sərbəst buraxmış, Zeynəbin boyunbağını da geri göndərmişdilər. Ancaq Rəsuli-Əkrəm (s.ə.s), Əbul-Asdan müşrik olduğu üçün

218. İbn Hişam, *e.a.ə.,* III, 47-48; İbnu'l-Əsir, *e.a.ə.,* II, 139-140; İbn Qayyim, *e.a.ə.,* II, 229.
219. Muhammed Hamdi Yazır, (v. 1358/1942), *Hak Dini Kur'an Dili,* VII, 5438, İstanbul 1935–1939
220. İbnu'l-Əsir, *e.a.ə.,* II, 115 və II, 138.

Zeynəbin özünə halal olmadığını, buna görə dərhal Mədinəyə göndərməsini istəmişdi. Əbul-As sözünü yerinə yetirdi. Beləliklə Rəsulullahın (s.ə.s) ən böyük qızı Zeynəb də bu ildə Mədinəyə hicrət etmişdir.[221]

## III. UHUD DÖYÜŞÜ (11 Şəvval 3 h./27 Mart 625 m.)

**"(Uhud müharibəsində baş vermiş bəzi hadisələrə görə) ruhdan düşməyin və qəmgin olmayın. Halbuki, əgər möminsinizsə, siz (Allah yanında inanmayanlardan) çox yüksəkdə durursunuz! "**(Ali-İmran, 3/139)

Bədir döyüşündə Məkkə müşriklərindən 70 nəfər öldürülmüşdü. Bunlar arasında Əbu Cəhil, Ukbə, Utbə, Şeybə, Ümeyyə, As b. Hişam kimi Qureyşin rəhbərləri var idi. Buna görə Məkkəlilər Bədir məğlubiyyətini unuda bilmir və intiqam atəşiylə yanırdılar.

Bədirdə, atalarını, qardaşlarını, oğullarını və digər yaxınlarını itirənlər, Məkkə rəisi Əbu Süfyana müraciət etdilər. Darun-Nədvədə toplanaraq, Şam karvanının qazancı ilə bir ordu yığıb Mədinəyə hücum edib və müsəlmanlardan qisas almağa qərar verdilər.[222]

Məkkə xaricindəki müşrik ərəb qəbilələrinə, şairlər, natiqlər göndərdilər. Bunlar, Bədirdə öldürülənlər üçün, şeirlər, mərsiyələr söyləyərək xalqı həyəcana gətirdilər. Dəyəri 50 min qızıl olan karvan qazancının yarısı ilə Məkkə xaricindəki müşrik qəbilələrdən 2000 döyüşçü yığdılar. Məkkədən qatılanlarla, 700 zirehli, 200 atlı olmaqla, Əbu Süfyanın əmrində 3000 nəfərlik mükəmməl bir ordu ilə Mədinə üzərinə getdilər. Orduda ayrıca 300 dəvə, şərab tuluqları, müğənni və rəqqasə qadınlar var idi. Bunlardan başqa, başda Əbu Süfyanın arvadı Hind olmaqla Qureyş liderlərindən 14 nəfərin qadınları da özləri ilə birlikdə döyüşə qatılmışdılar.

---

221. İbn Hişam, *e.a.ə.,* II, 306-308.
222. İbnu'l-Əsir, *e.a.ə.,* II, 148-149.

**A. Abbasın Məktubu**

Rəsulullahın (s.ə.s) Məkkədəki əmisi Abbas, Bədirdə əsir düşdükdən sonra müsəlman olmuş, lakin müsəlmanlığını gizlətmişdi. Bədirdə çox zərər gördüyünü bəhanə edərək, bu orduya qatılmadı. Xüsusi xəbərçiylə bir məktub göndərərək, vəziyyətdən Rəsulullahı (s.ə.s) xəbərdar etdi. Göndərilən kəşfiyyatçılar da, Qureyş ordusunun Mədinəyə yaxınlaşdığını xəbər verdilər.

Vəhy gəlməyən mövzularda, qərar vermədən əvvəl Rəsulullah (s.ə.s) səhabələrlə müşavirə edərdi. Mühacir və ənsarı yığaraq:

-Düşməni Mədinə xaricindəmi qarşılayaq, yoxsa şəhəri içindənmi müdafiə edək?, deyə müşavirə keçirdi.

Peyğəmbər əfəndimiz, bir gecə əvvəl yuxusunda, qılıncında bir dəlik açıldığını, yanında bir heyvanın boğazlanıldığını və mübarək əlini zirehi içində mühafizə etdiyini görmüşdü. Qılıncında açılan dəliyi, əhli-beytindən birinin şəhid olması, malın kəsilməsinin, səhabələrindən bəzilərinin şəhid olmaları, zirehi də Mədinə ilə yozmuş, buna görə Mədinə xaricinə çıxılmayaraq, şəhərdə müdafiə olunmasını uyğun görmüşdü.[223] Hz. Əbu Bəkir, Sad b. Muaz kimi səhabələrin böyükləriylə münafiqlərin başı Abdullah b.Übey də bu fikirdə idilər. Lakin səhabələrin əksəriyyəti, xüsusilə Bədir döyüşündə iştirak etməyən gənc müsəlmanlarla Hz. Həmzə:

- Biz belə bir günü gözləyirdik. Düşmənlə Mədinə xaricində döyüşək, deyə israr etdilər.[224] Rəsulullah (s.ə.s) əksəriyyətin arzusuna uyğun olaraq, üst-üstə iki zireh geyib, dəbilqəsini başına keçirərək xanə-i səadətindən çıxdı. Mədinə xaricində döyüşülməsini istəyənlər, Peyğəmbər əfəndimizin arzusuna zidd davranmaqla səhv etdiklərini anlayaraq fikirlərindən əl çəkdilər. Lakin Rəsulullah (s.ə.s): -"Bir peyğəmbər zirehini geydikdən sonra, döyüşmədən onu çıxarmaz. "[225] Əgər səbr edər, vəzifənizi tam etsəniz, Allahın köməyiylə zəfər bizimdir" -dedi.

Qureyş ordusu, Mədinənin 5 km. şimalındakı Uhud dağı ətəyində qərargahını qurmuşdu. Rəsulullah (s.ə.s) Abdullah b. Ümmi Məktumu

223. İbn Hişam, *e.a.ə.,* III, 66-67; İbnu'l-Əsir, *e.a.ə.,* II, 150; İbn Qayyim, *e.a.ə.,* II, 232.
224. İbn Hişam, *e.a.ə.,* III, 67.
225. İbn Qayyim, *e.a.ə.,* II, 231; İbnu'l-Əsir, *e.a.ə.,* II, 150.

Mədinədə vəkil təyin edərək, 1000 nəfərlik ordu ilə cümə namazından sonra şəhərdən çıxdı. O gün Uhuda qədər irəliləməyib gecəni "Şeyxeyn" deyilən yerdə keçirdi. Səhər şəfəqiylə birlikdə Uhuda çatdılar, döyüş üçün ən əlverişli yeri seçdilər.

Yolda Abdullah b. Übeyy, "Məhəmməd (s.ə.s) bizim kimi yaşlı və təcrübəliləri dinləmədi, uşaqların sözünə tabe oldu. Mən meydan döyüşünü uyğun görməmişdim..." bəhanəsiylə, özünə bağlı 300 münafiqlə, ordudan ayrıldı. Beləcə müsəlmanların sayı 700 nəfərə düşdü.

**B. Rəsulullahın (s.ə.s) Döyüş Taktikası**

Peyğəmbər əfəndimiz, ordusunun arxasını Uhud dağına verərək Mədinəyə tərəf mövqe tutdu. Solundakı Ayneyn təpəsinə " Abdullah b. Cübeyr" in əmrində 50 oxçu yerləşdirdi.

*-Qalib də gəlsək, məğlub da olsaq, məndən əmr gəlmədikcə yerinizdən ayılmayacaqsınız. Bu vadidən, düşmən atlıları arxamızca gəlib bizi əhatə edə bilərlər. Oxlarınızla onları buradan keçirməyin, çünki at, ox dəydikdə irəliləyə bilməz,* -dedi.[226] Müsəlmanların qarşısında döyüş vəziyyəti alan müşrik ordusu, say cəhətdən müsəlmanlardan dört qat daha çox idilər. Üstəlik bunlardan 700-ü zirehli, 200-ü isə atlı idi. Müsəlmanların isə 100 zirehi və yalnız 2 atı vardı. Ordunun sağ qoluna Ukkaşə, sol qoluna isə Əbu Məsləmə komandir təyin edilmişdi. Rəsulullah (s.ə.s) isə ortada dayanmışdı.

Əbu Süfyan əmrindəki 3000 nəfərlik müşrik ordusunun sağ tərəfinə Xalid b. Vəlid, sol tərəfinə İkrimə b. Əbu Cəhl, süvarilərə Səfvan b. Ümeyyə, oxçulara isə Abdullah b. Rəbiə nəzarət edirdi.

Qureyşli qadınlar, Bədirdə ölənlər üçün mərsiyələr oxuyur, dəflər çalır və mahnılar söyləyərək döyüşçülər arasında gəzib, onları döyüşə təşviq edirdilər.

Döyüş, o dövrün adətinə görə mübarizə ilə (meydanda təkbə-tək vuruşma ilə) başladı. Qureyşin bayrağını daşıyan Əbdüddar-oğullarından ortaya çıxan 9 müşrik bir-bir müsəlmanlar tərəfindən öldürüldü.

---

226. Buxari, IV, 26 və V, 29; Kamil Miras, *e.a.ə.,* VIII, 457 (Hədis No: 1269); İbnu'l-Əsir, *e.a.ə.,* II, 152.

Rəsulullah (s.ə.s) əlindəki qılıncı göstərərək:

-Haqqını ödəmək şərtilə bu qılıncı kim istəyir? deyə soruşdu. Ənsardan Əbu Dücanə:

- Ya Rəsulullah! Bunun haqqı nədir,? deyə soruşdu. Rəsulullah (s.ə.s):

-Əyilib bükülənə qədər düşmənlə döyüşmək, deyə cavab verdi.

Əbu Dücanə bu şərtlə götürdüyü qılıncla düşmən üzərinə hücum etdi, müşrik cərgələrinin arasına girdi.[227] Həmzə, Əli, Sad b. Əbi Vakkas və Əbu Dücanə kimi qəhrəmanların hücumlarıyla döyüşün ilk anında 20-dən çox itgi verən Qureyş, məğlubiyyətə uğramış, ordunun sağ və sol tərəfi geri çəkilmiş, dəf çalaraq Qureyşliləri döyüşə təşviq edən qadınlar, fəryadlar qopararaq yüksək təpələrə qaçmışdılar. İman qüvvəti qarşısında, say və güc üstünlüyü işə yaramamış, müşriklər qaçmağa başlamışdılar.

Beləcə ilk mərhələdə müsəlmanlar döyüşü qazandılar. Lakin, qaçan düşməni sonuna qədər təqib etmədən, döyüş meydanına qaçaraq, qənimət (düşməndən qalan malları) yığmağa başladılar. Əllərinə keçən fürsəti kifayət qədər qiymətləndirə bilmədilər. Ayneyn təpəsindən vəziyyəti seyr edən oxçular da bir-birlərinə:

-Burada nə gözləyirik, döyüş bitdi, zəfər qazanıldı, biz də gedib qənimət yığaq, dedilər.[228] Abdullah b. Cübeyr:

-Yoldaşlar, Rəsulullahın (s.ə.s) əmrini unutdunuzmu? Ondan əmr almadıqca yerimizdən ayrılmayacağıq... deyə israr etdisə də dinləmədilər.[229] Abdullahın yanında yalnız 8 oxçu qaldı.

Düşmənin sağ tərəf komandiri Xalid b. Vəlid, Rəsulullahın (s.ə.s) oxçularla qoruduğu Ayneyn vadisindən keçərkən müsəlmanları arxadan əhatə etməyi sınamış, oxçular bu keçidi gözlədikləri üçün bacara bilməmişdi. Oxçuların buradan ayrıldığını görüncə, əmrindəki süvarilərlə hücuma keçdi. Abdullah b. Cübeyr ilə 8 sadiq yoldaşını şəhid edib, qənimət yığmaqla məşğul islam ordusunu arxadan mühasirə etdilər. Müşriklər geri dönüb yenidən

227. *Riyazus-Salihin*, I, 128 (Hədis No: 91); İbnu'l-Əsir, *e.a.ə.,* II, 152.
228. Ali-İmran, 3/152.
229. Buxari, IV, 26-27 və V, 29-30; Kamil Miras, *e.a.ə.,* VIII, 457–460 (Hədis No: 1269).

hücuma keçdilər. Təpələrə çəkilən qadınlar da dəf çalaraq aşağıya endilər. Müsəlmanlar öndən və arxadan iki hücumun arasında çaşıb qaldılar. Döyüşü qazanmışkən məğlub olmağa başladılar. Bir-birlərindən ayrılmış və dağılmış bir vəziyyətdə olduqları üçün, canlarını qurtarma sevdasına düşdülər.[230]

### C. Hz. Həmzənin Şəhid Edilməsi

Bədir döyüşündə atası Utbə, qardaşı Vəlid və əmisi Şeybəni itirmiş olan Əbu Süfyanın arvadı Hind, atasını öldürən Həmzədən qisas almaq istəyirdi. Həmzənin qarşısında kimsə dayana bilmədiyi üçün, Cübeyr b. Mutimin köləsi və yaxşı bir nişançı (atıcı) olan Həbəşli Vəhşiyə Həmzəni öldürdüyü təqdirdə, böyük mənfəətlər vəd etmiş, əfəndisi Cübeyr də azad etməyə söz vermişdi.

Vəhşi, Həmzənin qarşısına çıxmağa cəsarət edə bilmədi. Bir daşın arxasına gizlənib, Həmzənin qarşısından keçməsini gözlədi. Həmzə isə döyüş sahəsində dayanmadan sağa sola qaçır, əlində qılınc önünə gələn müşrikləri öldürürdü. O gün tam 8 müşrik öldürmüşdü. Bunlardan Əbdul-Uzza oğlu-Sibahı öldürdüyü zaman, Vəhşinin tam qarşısına çıxdı. Vəhşi fürsəti qaçırmadı. Həbəşlilərin çox yaxşı istifadə etdiyi mızrağını gizləndiyi yerdən atıb, qəhrəman Həmzəni qarın nahiyəsindən vuraraq şəhid etdi.[231] Həmzənin ölümünü eşidən Hind, qaçaraq gəldi. Qarınını yarıb, ciyərini çıxararaq dişlədi, lakin uda bilmədi. Vəhşini mükafatlandırdı və köləlikdən azad etdi.

Döyüşün ən şiddətli anında Hz. Həmzənin şəhid olması, müsəlmanlar üçün böyük itki oldu. Əsasən, qəflətən öndən və arxadan məruz qaldıqları hücum səbəbiylə nə edəcəklərini bilmir, bir çox şəhid verərək, meydana dağılmışdılar. Bu vaxt Rəsulullahın (s.ə.s) ətrafında yalnız, ikisi mühacirlərdən, yeddisi ənsardan olmaqla 9 nəfər qalmış, bunlar da bir-bir şəhid olmuşdular.[232]

230. İbnu'l-Əsir, *e.a.ə.,* II, 154.
231. Buxari, V, 36-37; Kamil Miras, *e.a.ə.,* X, 216–221 (Hədis No: 1585); İbn Hişam, *e.a.ə.,* III, 75.
232. Müslim, III, 1415 (Hədis No: 1789).

### Ç. Rəsulullahın (s.ə.s) Öldüyü Şayiəsi

Abdullah b. Kamiə adlı bir müşrik, Hz. Peyğəmbərə (s.ə.s) bənzədərək, islam ordusunun bayraqdarı Musab b. Umeyri şəhid etmiş və Məhəmmədi (s.ə.s) öldürdüm, deyə elan etmişdi.[233] Bu şayiə üzərinə islam ordusunda çaxnaşma başladı. Rəsulullah (s.ə.s):

-Ey Allahın qulları, mənə gəlin, ətrafımda toplanın, deyə səslənir, lakin kimsə onu eşitmirdi.

Müsəlmanlar bir-birindən xəbərsiz üç yerə ayrılmışdılar.

l. Rəsulullah şəhid oldusa, Allah baqidir. Onun yolunda biz də şəhid olarıq, deyərək döyüşə davam edənlər. Ənəs b. Nadr (Ənəs b. Malikin əmisi) bunlardan idi. Yetmişdən çox yara aldıqdan sonra şəhid olmuşdur.

2. Rəsulullahın (s.ə.s) ətrafını dövrəyə alıb, bədənləriylə ona sipər olan, onu düşmən hücumuna qarşı qoruyanlar. Bunlar təqribən 14 nəfər idi. Hz. Əbu Bəkir, Hz. Ömər, Hz. Əli, Əbdürrəhman b. Avf, Talha, Zübeyr, Sad b. Əbi Vakkas, Əbu Dücanə bunlardandır.

3. Rəsulullah şəhid olduqdan sonra, burada dayanmağın mənası yoxdur deyərək, döyüş meydanından ayrılanlar.[234] Bunlardan bir qismi dağlara çəkilmiş, digərləri isə Mədinəyə dönmüşdülər.

Müsəlmanların bu dağınıq vəziyyətlərindən istifadə edən müşriklər, Rəsulullahın (s.ə.s) yanına qədər irəlilədilər. Atılan bir daşla Peyğəmbər əfəndimizin dodağı yarıldı, dişi qırıldı və İbn Kamiənin qılınc zərbəsiylə yerə yıxıldı. Zirehindən qırılan iki halqa yanağına batdığı üçün üzündən də yaralandı.[235]

Əshabi-kiram, döyüş meydanında Rəsulullahı (s.ə.s) heç cür tapa bilmirdi. Halbuki, Rəsulullah (s. ə.s) olduğu yerdən heç ayrılmamışdı. Nəhayət, Peyğəmbər əfəndimizi Kab b. Malik gördü və:

-Ey möminlər, Rəsulullah (s.ə.s) burada, deyə qışqırdı. Kabın səsini eşidən

233. İbnu'l-Əsir, *e.a.ə.,* II, 155; İbn Hişam, *e.a.ə.,* III, 77.

234. Ali-İmran, 3/144.

235. Buxari, V, 35; Müslim, III, 1416 (Hədis No: 1790); İbn Hişam, III, 84; İbnu'l-Əsir, *e.a.ə.,* II, 154; İbn Qayyim, *e.a.ə.,* II, 234.

müsəlmanlar, dərhal Rəsulullahın (s.ə.s) ətrafında toplanaraq, müşriklərin hücumlarını dayandırdılar.[236]

**D. Əbu Süfyanla Hz. Ömər Arasında Keçən Dialoq**

Müşriklərin hücumları yavaşladıqda, Peyğəmbər əfəndimiz ətrafında toplanmış olan müsəlmanlarla Uhud dağının təpələrindən birinə çıxdı. Müsəlmanların bir təpədə toplandığını görən Əbu Süfyan da, onların qarşısında başqa bir təpəyə yerləşdi. Əbu Süfyan, Peyğəmbərimizin sağ olub olmadığını dəqiq bilmədiyindən maraq içində idi. Bu səbəblə yüksək səslə üç dəfə:

-İçinizdə Məhəmməd (s.ə.s) varmı? Əbu Bəkir varmı? Ömər varmı? deyə səsləndi. Rəsulullah (s.ə.s) cavab verilməməsini əmr etmişdi. Kimsədən səs çıxmadığından müşriklərə dönərək:

-"Görürsünüz, hamısı da ölmüşdür. Artıq iş bitmişdir", deyə qışqırdı. Hz. Ömər dözə bilmədi.

-"Yalan danışırsan ey Allah düşməni, soruşduqlarının hamısı sağ, hamısıda buradadır", deyə cavab verdi. Əbu Süfyan:

-Döyüşdə üstünlük növbə ilədir, bu gün biz Bədirin qisasını aldıq, üstünlük bizdədir... deyə qürurlandı. Ömər:

-Bizdən ölənlər cənnətdə, sizinkilər isə cəhənnəmdədir deyə cavab verdi.

-Ya Ömər, Allah xatirinə həqiqəti söylə. Biz Məhəmmədi (s.ə.s) öldürdükmü?

-Rəsulullah (s.ə.s) sağdır və sənin bu sözlərini də eşidir.

-Ya Ömər, mən sənin sözlərinə İbni Kamiənin sözündən daha çox inanıram. Ölülərinizə edilən pislikləri mən əmr və ya qadağan da etmədim. Gələcək il Bədirdə görüşək, dedi. Hz. Ömər də:

-"İnşallah", deyə cavab verdi.[237] Hz. Ömərlə Əbu Süfyan arasında keçən

---

236. İbnu'l-Əsir, *e.a.ə.,* II, 157; İbn Hişam, *e.a.ə.,* III, 88; İbn Qayyim, *e.a.ə.,* II, 235.
237. Buxari, IV, 26 və V, 30; Kamil Miras, *e.a.ə.,* VIII, 457 (Hədis No: 1269); İbn Qayyim,

bu dialoqdan sonra, müşriklər Uhuddan ayrıldılar. Onlar, Hz. Məhəmmədi (s.ə.s) öldürmək, Mədinəni tutub müsəlmanları məhv etmək, islamı ortadan götürmək üçün Məkkədən gəlmişdilər. Lakin, Allah ürəklərinə qorxu saldı. Üstünlük özlərində olduğu və Rəsulullahın da (s.ə.s) sağ olduğunu öyrəndikləri halda, döyüşə davam etməyə cəsarət edə bilmədilər. Bir əsir belə götürə bilməyərək, geri döndülər.

### E. Uhud Döyüşündə Üç Mərhələ

Uhud Döyüşündə üç mərhələ yaşandı:

İlk mərhələdə müsəlmanlar üstün gəldilər, 20-dən çox düşmən öldürərək, müşrikləri məğlub olmaları.

İkinci mərhələdə, qaçan müşrikləri təqib etməyi buraxıb, qəti nəticə əldə etmədən qənimət toplamağa başlamaları və Rəsulullahın (s.ə.s) yerlərindən ayrılmamalarını əmr etdiyi oxçu birliyinin vəzifələrini tərk etmələri səbəbiylə, müsəlmanların 70 şəhid verərək məğlub vəziyyətə düşməsi.

Üçüncü mərhələdə isə, dağılmış olan müsəlmanlar, Rəsulullahın (s.ə.s) ətrafında toplanıb, əks hücuma keçərək, düşmən hücumunu dayandırdılar.

Müşriklərin Uhuddan ayrılmasından sonra Rəsulullah (s.ə.s) şəhidləri yumadan, qanlı paltarlarıyla, iki-iki üç-üç dəfn etdirdi.[238] Cənazə namazlarını isə, bu tarixdən 8 il sonra qıldılar.[239]

### Ə. Həmraül-Əsəd Qəzvəsi

Müşriklər, əldə etdikləri üstünlükdən faydalanıb müsəlmanları məhv etmədən döyüş meydanından ayrıldıqlarına peşman oldular. Geri dönüb Mədinəyə yenidən hücum etmək istədilər. Rəsulullah (s.ə.s) bu vəziyyətdən xəbərdar olunca, Mədinəyə dönüşündən bir gün sonra, Uhud döyüşünə qatılmış olan səhabələrini yığaraq Mədinədən 16 km. uzaqda "Həmraül-Əsəd"

---

*e.a.ə.,* II, 236-238.

238. İbnu'l-Əsir, *e.a.ə.,* II, 162; İbn Qayyim, *e.a.ə.,* II, 246.

239. Buxari, II, 94; Kamil Miras, *e.a.ə.,* IV, 655 (Hədis No: 661).

deyilən yerə qədər müşrikləri təqib etdi. Gecə düşdükdə, burada 500-ə yaxın atəş yandırtdı. Müşriklər, təqib edildiklərini öyrəndikdə qorxdular, Mədinəyə hücum etmə fikrindən əl çəkərək tələsik Məkkəyə döndülər.[240]

### F. Hicrətin Üçüncü İlində Olan Digər Hadisələr

#### 1. Rəsulullahın (s.ə.s) Hz. Hafsa və Huzeymə Qızı Zeynəblə Evlənməsi

Hz. Ömərin qızı Hafsanın ilk yoldaşı Huneys b. Huzafə, Qureyş liderlərindən və Həbəşistana hicrət edən ilk müsəlmanlardan idi. Sonra Mədinəyə hicrət etmiş, Bədir və Uhud döyüşlərinə qatılmışdı. Uhud döyüşündə aldığı bir yaradan Mədinədə vəfat etdi.

Hz. Ömər, Rəsulullah (s.ə.s) ilə qızı Hafsanın evlənməsini belə izah etmişdir:

-Hafsa dul qalınca, Osmana onunla evlənməsini təklif etdim. Hələ bir düşünüm, deyə cavab verdi. Sonra qaşılaşdığımızda, bu sırada evlənməyi uyğun görmürəm, dedi. Bunun üzərinə Əbu Bəkrə istəsən Hafsanı sənə verim, dedim. Əbu Bəkir susdu. Müsbət və ya mənfi cavab vermədi. Əbu Bəkrin susmasına, Osmanın təklifimi geri çevirməsindən daha çox kədərləndim. Vəziyyəti Rəsulullaha (s.ə.s) ərz edincə: -Kədərlənmə ya Ömər, Hafsanı Osmandan xeyirlisi alacaq. Osman da Hafsadan daha yaxşısı ilə evlənəcək,[241] -buyuraraq, Hafsa ilə evlənmək istədiyini bildirdi. Osmanı da qızı Ümmü Gülsümlə evləndirdi. Sonra Əbu Bəkir mənə rast gəldiyində:

-Zənn edirəm, Hafsanı mənə təklif etdiyində cavab vermədiyimə üzülmüşdün. Mən Hafsanı Rəsulullahın (s.ə.s) alacağını bilirdim. (Mənə bunu söyləmişdi.) Rəsulullahın (s.ə.s) sirrini ifşa etməyi uyğun görmədiyim üçün sənə cavab vermədim. Əgər belə olmasaydı, təklifini qəbul edərdim, dedi.[242]

---

240. İbnu'l-Əsir, *e.a.ə.,* II, 164.
241. İbn Sad, *e.a.ə.,* VIII, 82-83; İbn Həcər əl-Əsqəlani, *əl-İsabə*, IV, 51, Qahirə 1972; İbn Əbdil-Bərr, *əl-İstiab*, IV, 1811, Qahirə 1960.
242. Buxari, VI, 130; Kamil Miras, *e.a.ə.,* X, 166 (Hədis No: 1571) və XI, 338-339 (Hədis No: 1803 sərhi); *Riyazu's-Salihin*, II, 98 (Hədis No: 689).

Rəsulullah (s.ə.s) Hz. Hafsa ilə evlənərək, həm ən yaxın yoldaşlarından Hz.Ömərin üzüntüsünü azaltmış, həm də Hz. Əbu Bəkir kimi Hz. Öməri də qohumluq bağı ilə özünə bağlamış oldu. (Şaban 3 h./Yanvar 625 m.)

Hilaloğullarından Huzeymə qızı Zeynəb, ilk ərindən ayrılmış, Rəsulullahın (s.ə.s) bibisi oğlu olan ikinci əri Abdullah b. Caxş isə, Uhud döyüşündə şəhid edilmişdi. Zeynəb gənc və gözəl deyildi, orta yaşlı və mərhəmətli bir xanım idi. Kasıbları, yoxsulları, kimsəsizləri düşündüyü üçün, özünə "Ümmülməsakin" ünvanı verilmişdi.

Həyat yoldaşının şəhid olmasıyla himayəyə möhtac qalan bu şəfqətli xanımı Rəsulullah (s.ə.s) özünə nikahladı. Lakin Zeynəb çox yaşamadı, evlənməsindən üç ay sonra vəfat etdi.

Rəsulullahın (s.ə.s) nəvəsi Hz. Həsən də bu il Ramazan ayının ortalarında doğulmuşdur.[243]

## 2. Rəsulullahın (s.ə.s) Qızı Ümmü Gülsümün Hz. Osmanla Evlənməsi

Hz. Osman, Rəsulullahın (s.ə.s) ikinci qızı Ruqiyyə ilə evli idi. Ruqiyyə, Bədir döyüşü əsnasında vəfat etmişdi. Bir il sonra, Rəsulullah (s.ə.s) Hz. Osmanı üçüncü qızı Ümmü Gülsümlə evləndirdi. Rəsulullahın (s.ə.s) iki qızı ilə evlənmiş olduğu üçün Hz. Osmana "Zin-nureyn" (iki nur sahibi) deyilmişdir.

## 3. Raci Hadisəsi (Səfər 4 h./İyul 625 m.)

Uhud döyüşündən sonra müşriklərin cəsarətləri artdığı üçün, Mədinədə müsəlmanların təhlükəsizliyi xeyli sarsıldı. Rəsulullah (s.ə.s) bir tərəfdən müdafiə etmə tədbirləri görür, bir tərəfdən də islamı yaymaq üçün hər fürsətdən faydalanmağa çalışırdı. İslamı qəbul edib, dinin hökmlərini və Qurani-Kərimi öyrənmək istəyən qəbilələrə mürşidlər (müəllim) göndərirdi.

243. İbnu'l-Əsir, *e.a.ə.,* II, 166.

Adal və Karə qəbilələrindən bir heyət, Rəsulullaha (s.ə.s) müraciət edərək, qəbilələrinə islamı və Qurani-Kərimi öyrədəcək mürşidlər göndərilməsini istədilər. Rəsulullah (s.ə.s), bunlara Asam b. Sabitin başçılığında, 10 nəfər göndərdi. Yolda, Usfan ilə Məkkə arasında Raci quyusu yaxınlarında Hüzeyl qəbiləsindən 100 nəfərlik düşmən hücumuna məruz qaldılar. Mürşidlərdən 8-i vuruşaraq şəhid oldu, 2-i təslim oldu. Zeyd b. Dəsinə və Hubeyb b. Adiy adlarındakı bu iki şəxsi Hüzeylilər Məkkəyə aparıb satdılar.[244]

Zeydi, Bədir döyüşündə öldürülən atası Ümeyyənin qisasını almaq üçün, Səfvan b. Ümeyyə satın almış, öldürülməsini seyr etmək üçün bütün Məkkə liderlərini dəvət etmişdi. Əbu Süfyan Zeydə yaxınlaşaraq:

-Doğru söylə, həyatının xilas olması üçün, sənin yerinə Məhəmmədin (s.ə.s) öldürülməsini istəməzdinmi? demişdi.

Zeyd heç tərəddüd etmədən: -Əsla, Rəsulullahın (s.ə.s) həyatı yanında, mənim həyatım heçdir. Mənim xilas olmağım üçün nəyinki onun öldürülməsini, hətta Mədinədə ayağına bir tikan batmasını belə istəmərəm, -deyə cavab verdi. Bu qüvvətli imani cavab qarşısında Əbu Süfyan:

-Doğru olan budur ki, heç kimsə yoldaşları tərəfindən Məhəmməd (s.ə.s) qədər sevilməmişdir, deməkdən özünü saxlaya bilmədi.

Hubeyb, Uhud döyüşündə Haris b. Amiri öldürmüşdü. Atasının intiqamını almaq üçün onu da Harisin qızı satın almışdı. Hubeyb öldürüldüyü əsnada heç mətanətini itirmədi. İcazə alaraq 2 rükət namaz qıldı. Ölümdən qorxub uzatdı deməyəsiniz deyə namazı qısa qıldım, -dedi.[245] O zamandan bəri edam ediləsi müsəlmanların, edamdan əvvəl namaz qılmaları adət olmuşdur.[246]

Dinindən dönsən, sərbəst buraxacağıq, dedikləri zaman:

-Mənim üçün, müsəlman olaraq öldürülmək, dinimdən dönməkdən daha xeyirlidir, deyə cavab verdi. Müşriklər tərəfindən asılaraq şəhid edildi.

---

244. Buxari, V, 40; İbnu'l-Əsir, *e.a.ə.,* II, 167.
245. Buxari, V, 41.
246. İbnu'l-Əsir, *e.a.ə.,* II, 168; Geniş məlumat üçün bax: *Riyazu's-Salihin,* III, 97–101 (Hədis No: 1538).

Hadisə Mədinədə eşidilincə, Rəsulullah (s.ə.s) və müsəlmanlar son dərəcə kədərləndilər. Peyğəmbərin (s.ə.s) şairi Hassan, Zeyd və Hubeyb üçün mərsiyələr yazdı. Rəsulullah (s.ə.s) da:

-"Allah layiq olduqları cəzanı versin" deyərək, caniləri Allaha həvalə etdi.

**4. Biri-Maunə Faciəsi (Səfər 4 h./İyul 625 m.)**

Nəcd Şeyxi Əbu Bəra Malikoğlu Amir, Mədinəyə gələrək Rəsulullaha (s.ə.s): -Əgər Nəcd bölgəsinə bir irşad heyəti göndərsəniz, böyük bir qisminin müsəlman olacağını ümid edirəm, dedi. Rəsulullah (s.ə.s): Nəcd xalqına güvənə bilmirəm, deyə cavab verdi. Əbu Bəra, mürşidlərin həyatı üçün qəbiləsi adına qəti təminat verdiyindən, Rəsulullah (s.ə.s) Əbu Bəranın qardaşı oğlu Amir b. Tufeylə bir məktub yazdıraraq, Münzir b. Əmrin başçılığında 70 nəfərlik bir heyəti Nəcd bölgəsinə göndərdi.

Bunların hamısı da Suffə səhabələrindən idi. Qafilə Mədinədən 4 mil uzaqlıqda Maunə Quyusu (Bir-i Maunə) deyilən yerə çatanda, içlərindən Haram b. Milhan ilə Rəsulullahın (s.ə.s) məktubunu Amir b. Tufeylə göndərdilər. Amir məktubu belə oxumadan Haramı şəhid etdi. Heyətin hamısını öldürmək üçün qəbiləsini (Amiroğullarını) təşviq etdisə də onlar "Biz Əbu Bəranın əman və sözünü ayaqlar altına ala bilmərik", deyərək ona tabe olmadılar. Amir b. Tufeyl Süleym qəbiləsinə mənsub Usayyə, Rıl, Zəkvan və Lihyanoğulları ilə Haram b. Milhanın dönməsini gözləməkdə olan mürşidlər üzərinə hücum etdi. Hamısı şəhid edildi. İçlərindən yalnız Kab b. Zeyd yaralı olaraq xilas olmuşdu. O da Xəndək döyüşündə şəhid oldu.

Rəsulullahı (s.ə.s), Cəbrayıl bu faciədən xəbərdar etdi. Səriyyədəki bütün səhabələrin Rəblərinə qovuşdular, Allah onlardan razı oldu... deyə bildirdi. Rəsulullah (s.ə.s) bu faciədən son dərəcə əzab çəkdi. Tam 40 gün səhər namazında Rıl, Zekvan, Usayyə və Lihyanoğulları üçün bəddua etdi.[247]

Əmr b. Ümeyyə isə, hadisə əsnasında dəvələri otarmaqla vəzifəli olduğu üçün əsir düşmüş, sonra xilas olmuşdu. Mədinəyə dönərkən, iki Nəcdliyə rast gəldi. Şəhid edilən yoldaşlarının qisasını almaq üçün bunları yatarkən öldür-

247. Buxari, III, 204 və V, 41-42; Kamil Miras, *e.a.ə.,* VIII, 305 (Hədis No: 1183).

dü. Halbuki bunlar, müsəlmanların himayəsində olan Amir oğullarından idi. Bu səbəblə bunların ailələrinə diyetləri ödəndi.

**5. Nadiroğulları Qəzvəsi (Rəbiüləvvəl 4 h./Avqust 625 m.)**

Bəni Nadir yəhudiləri Mədinəyə iki saatlıq bir məsafədə yerləşirdilər. Aralarındakı razılaşmaya görə müsəlmanların ödədikləri diyetə, yəhudi qəbilələrinin də qatılması lazım idi. Amir oğullarından Əmr b. Ümeyyənin səhvən öldürdüyü iki adamın diyeti ödənəcəkdi. Rəsulullah (s.ə.s) yanına səhabələrindən 10 adam alaraq, diyetdən paylarına düşəni istəmək üçün Nadiroğulları yurduna getdi. Yəhudilər, Rəsulullahın (s.ə.s) təklifini qəbul etmiş kimi göründülər, lakin ayaqlarına qədər gəlişini fürsət sayaraq, Rəsulullaha (s.ə.s) sui-qəsd etməyi planladılar.

Bir evin kölgəsində oturmaqda olan Hz. Peyğəmbərin (s.ə.s) üzərinə, evin damından atacaqları böyük bir daşla onu öldürmək istədilər.[248]

Allah təala, peyğəmbərini yəhudilərin hazırladığı hiylədən xəbərdar etdi. Rəsulullah (s.ə.s) oradan ayrılıb Mədinəyə döndü. Yəhudilərin tələsini səhabələrinə bildirdi. Bu davranışlarıyla Nadiroğulları razılaşmanı pozmuşdular. Rəsulullah (s.ə.s) Məhəmməd b. Məsləməni oraya göndərərək 10 gün içində Mədinəni tərk etmələrini, 10 gündən sonra kim qalsa boynu vurulacağını onlara bildirdi. Yəhudilər yol hazırlığına başladılar. Lakin, münafiqlərin başçısı Abdullah b. Übey: -"Mədinədən çıxmayın, biz sizə kömək edərik, Kurayzaoğulları da kömək edəcək", deyə gizlicə xəbər göndərdi.[249] Bu səbəblə Nadiroğulları yol hazırlığından imtina edib özlərini müdafiə etməyə qərar verdilər.

Rəsulullah (s.ə.s) Raəbiüləvvəl ayında Nadiroğullarını mühasirə etdi. Nadiroğulları bir illik ehtiyat toplamış və qalalarının möhkəmliyinə güvənirdilər.[250] Mühasirə 15-20 gün sürmüş və döyüş küçədən-küçəyə, evdən-evə keçərək davam etmişdi. Rəsulullah (s.ə.s) yəhudilərə sipər olan, döyüşü çətinləşdirən xurma ağaclarını kəsdirdi.[251]

---

248. İbnu'l-Əsir, *e.a.ə.,* II, 173.
249. Həşr, 59/11.
250. Həşr, 59/2.
251. Həşr, 59/5; Buxari, V, 23; Kamil Miras, *e.a.ə.,* X, 175 (Hədis No: 1576).

Nadiroğulları, münafiqlərdən və Kurayzaoğullarından gözlədikləri köməyi görmədilər. Mühasirənin qaldırılması üçün razılaşma istədilər. Yanlarında götürə bildikləri qədər mal ilə Mədinədən çıxmalarına icazə verildi. 600 dəvə yükü əşya ilə Mədinədən ayrıldılar. Bir qismi Şama, bir qismi Fələstinə köç etdi. Salam, Kinanə və Huyey adındakı rəisləri isə Xeybərə sığındılar. Kədərlərini bildirməmək üçün mahnılar söyləyib, dəflər çalaraq Mədinədən ayrıldılar. Bunlar daha sonra Xəndək döyüşünü hazırladılar.

50 zireh, 50 dəbilqə, 340 qılınc və digər bəzi mallar qənimət olaraq müsəlmanlara qaldı. Rəsulullah (s.ə.s) bu qənimətləri mühacirlərə və yoxsullara payladı.[252]

Uhud döyüşündən sonra müsəlmanların etibarı sarsılmışdı. Nadiroğullarının Mədinədən çıxarılmasıyla, Mədinə ətrafındakı müşrik qəbilələri arasında Rəsulullahın (s.ə.s) nüfuzu təkrar qüvvətlənmiş oldu.

### 6. Rəsulullahın (s.ə.s) Hz. Ümmü Sələmə ilə Evlənməsi

Əsl adı Hind olan Ümmü Sələmə, Əbu Ümeyyə əl-Mahzuminin qızıdır. İlk əri Əbu Sələmə Abdullah b. Əbdüləsəd, Əbdülmüttəlibin qızı Bərrənin oğlu olub, Rəsulullahın (s.ə.s)- bibisi oğlu idi. Əri ilə birlikdə Həbəşistana hicrət etmiş, ilk uşağı Sələmə orada doğulmuşdu.

Ümmü Sələmənin ilk yoldaşı Əbu Sələmə, Uhud döyüşündə aldığı yara səbəbiylə vəfat etdi. Rəsulullah (s.ə.s) Əbu Sələməni çox sevirdi. Vəfatından sonra dörd uşağı ilə kimsəsiz və himayəsiz qalan yoldaşı Ümmü Sələməni özünə nikahlayaraq himayəsi altına aldı. Ümmü Sələmə, fəzilət və kamillik cəhətdən Hz. Aişədən sonra "*Əzvac-ı tahiratın"* ən üstünü idi. Əzvac-ı tahirat içində ən son vəfat edən, Ümmü Sələmə olmuşdur. Hicrətin 59-cu ili 84 yaşında vəfat etmiş, Baqi qəbrisitanlığına dəfn edilmişdir.

### 7. İçki və Qumarın Haram Edilməsi

Məkkə dövründə içki və qumar qadağan olunmamışdı. Müsəlmanlardan

252. İbnu'l-Əsir, *e.a.ə.,* II, 174; Mahmud Esad Efendi, *e.a.ə.,* III, 215.

da içki içən və qumar oynayanlar vardı. Rəsulullah (s.ə.s) bunlara səs çıxarmırdı. İçki və qumarın qadağan edilməsi birdən birə deyil, tədricən olmuşdur.

İçki ilə əlaqədar Qurani-Kərimdə 4 ayə vardır. Məkkədə enən ilk ayədə:

**“Siz xurma ağaclarının meyvəsindən və üzümlərdən şərab (yaxud sirkə) və gözəl ruzi (kişmiş, mövüc, bəhməz, quru xurma və s.) düzəldirsiniz. Şübhəsiz ki, bunda da ağılla düşünənlər üçün bir ibrət vardır.”,** (Nəhl, 16/67) buyurulmuş, içki qadağan edilməmişdir. Mədinə dövründə Hz Ömər və Muaz kimi bəzi səhabələr:

-Ey Allahın Rəsulu, içki haqqında bizə yol göstər, çünki şərab ağlı başdan çıxarır, deyə Rəsulullaha (s.ə.s) müraciət etdilər. Hicrətin 4-cü ili Şəvval ayında:

**“(Ey Rəsulum!) Səndən içki və qumar (meysir) haqqında sual edənlərə söylə: “Onlarda həm böyük günah, həm də insanlar üçün mənfəət (dünya mənfəəti) vardır. Lakin günahları mənfəətlərindən daha böyükdür”! (Allah yolunda) nəyi paylamalı olduqlarını soruşanlara isə de: “Ehtiyacınızdan artıq qalanını (möhtaclara paylayın)!” Allah sizə Öz ayələrini bu cür bildirir ki, bəlkə, fikirləşəsiniz.”** (Bəqərə, 2/219) mənasındakı ayə endi. İçkini ilk qadağan edən ayə bu oldu. Lakin bu ayə ilə içki qəti şəkildə qadağan edilmədiyindən, *“günahı var”* deyə tərk edənlər olduğu kimi, *“faydası da var”* deyə içməyə davam edənlər də var idi.

Əbdürrəhman b. Avfın verdiyi bir ziyafətdə qonaqlar içki də içmişdilər. Axşam namazında camata imam olan şəxs *“əl-Kafirun surəsi”*ni sərxoşluq səbəbiylə səhv oxudu. Ayələrin mənaları dəyişdi. Bunun üzərinə: **“Ey iman gətirənlər! Sərxoş ikən nə dediyinizi anlamayana qədər və cunub (murdar) olduğunuz zaman - yol ötən müsafirlər müstəsnadır - qüsl edənədək namaza (namaz qılınan yerə) yaxınlaşmayın. Xəstələndikdə və ya səfərdə olduqda, sizlərdən biri ayaq yolundan gəldikdə, yaxud qadınlara toxunmuş (yaxınlıq etmiş) olduqda (qüsl və dəstəmaz üçün) su tapmadığınız zaman pak bir torpaqla təyəmmüm edin, (ovuclarınızı) üzünüzə və əllərinizə sürtün! Şübhəsiz ki, Allah əfv edəndir, bağışlayandır!”** (Nisa, 4/43) mənasındakı ayə endi.

Bir müddət sonra Ənsardan İtban b. Malikin təşkil etdiyi ziyafətdə qo-

naqlar sərxoş oldular. Sad b. Əbi Vakkas bir şeir oxuyaraq öz soyunu təriflədi, ənsarı isə aşağıladı. Ənsardan bir şəxs də, süfrədə yedikləri dəvənin çənə sümüyünü Sada atıb başını yardı. Sad, Hz. Peyğəmbərə (s.ə.s) o kimsəni şikayət etdi. O zaman:

**"Ey iman gətirənlər! Şərab da (içki də), qumar da, bütlər də, fal oxları da Şeytan əməlindən olan murdar bir şeydir. Bunlardan çəkinin ki, bəlkə, nicat tapasınız!"** (Maidə, 5/90) mənasında enən ayə ilə içki və qumar qəti qadağan edildi. Rəsulullah (s.ə.s) bu qadağanı dərhal elan etdirdi. Bütün müsəlmanlar içkini tərk edərək evlərində, dükanlarında olan bütün içkiləri küçələrə tökdülər.

Rəsulullah (s.ə.s) əfəndimiz içkiylə əlaqədar olaraq:

*"Sərxoş edici bütün içkilər haramdır."* (Müslim, III, 1575-1576)

*"Çoxu sərxoşluq verən içkinin azı da haramdır"* buyurmuşdur.[253]

*"İçki, bütün pisliklərin anasıdır."* Kəşfül Xafa, I, 382 [254] buyurmuşdur.

### G. Bəni Mustalik Qəzvəsi (Müreysi Döyüşü)

### (2 Şaban 5 h./17 Dekabr 626 m.)

Mustalikoğulları Huzaa qəbiləsindəndir. Nəcd bölgəsində, Mədinəyə 9 günlük bir yerdə yerləşmişdilər. Müsəlmanlarla yaxşı dolanırdılar. Lakin, Qureyşlilərin təşviqiylə qəbilə rəisi Haris b.Əbu Dırar ətrafda yaşayan bədəvi qəbilələrlə birləşərək Mədinəyə basqın etmək üçün hazırlığa başladı. Rəsulullah (s.ə.s) vəziyyəti öyrənincə, Mədinədə Zeyd b. Harisəni baş məmur qoyub, 30-u atlı, 1000 nəfərlik bir ordu ilə Bəni Mustalik üzərinə getdi. (2 Şaban 5 h. /17 dekabr 626 m.)

Bədəvilər, müsəlmanların üzərlərinə gəldiyini eşidincə, qorxub dağıldılar. Harisin ətrafında yalnız öz qəbiləsi qaldı.

Bəni Mustalik Müreysi suyu yanında toplanmış, hələ hazırlıqlarını ta-

253. İbn Macə, II, 1124, Hədis No: 3392.

254. İbn Macə, II, 1124, Hədis No: 1225.

mamlaya bilməmişdi. Müsəlman olmaları təklif edildi, qəbul etmədilər. Lakin, müsəlmanların nizamlı hücumlarına qarşı dayana bilməyib bir saat içində dağıldılar.

Döyüş nəticəsində, müsəlmanlardan bir nəfər şəhid oldu, müşriklərdən isə 10 nəfər öldürüldü. Bu döyüşdən müsəlmanlar qənimət olaraq 700 əsir, 5000 qoyun, 2000 dəvə ələ keçirdilər.

### H. Rəsulullahın (s.ə.s) Cüveyriyə ilə Evlənməsi

Əsirlər arasında, qəbilə rəisi Harisin qızı Cüveyriyə də var idi. Əri Müsafi b. Safvan döyüşdə öldürülmüş, özü isə əsir düşmüşdü. Qənimətlərin bölüşdürülməsində Sabit b. Kaysın payına düşmüşdü. Atası Haris, Peyğəmbərə (s.ə.s) müraciət edərək qızının şərəfinin qorunmasını istədi.

Hz. Peyğəmbər (s.ə.s) Cüveyriyənin əvəzini Sabit b. Kaysa ödəyərək onu sərbəst buraxdı. Cüveyriyə qəbiləsinə dönmədi, öz istəyi ilə Rəsulullahla (s.ə.s) evləndi. Bunun üzərinə səhabələr:

-*“Rəsulullahın (s.ə.s) yoldaşının yaxınları əsir saxlanılmaz”* deyərək əllərindəki bütün əsirləri sərbəst buraxdılar. Bu səbəblə Hz. Aişə:

-*Qövmü üçün, Cüveyriyə qədər xeyirli başqa bir qadın tanımıram,* demişdir.[255]

Görüldüyü kimi Peyğəmbər (s.ə.s) əfəndimizin Cüveyriyə ilə evlənməsinin məqsədi siyasi idi. Bu evlilik səbəbiylə, bütün əsirlər fidyə ödəmədən sərbəst buraxıldılar. Mustalikoğulları daha sonra hamısı müsəlman oldu.

### X. Təyəmmümün Məşru Qılınması

Rəsulullah (s.ə.s) hər səfərə çıxışında, aralarında püşk ataraq xanımlarından birini yanında aparardı. Bəni Mustalik qəzvəsində, Hz. Aişəni aparmışdı. Dönüşdə, bir gecə evdən çıxıldığı zaman Hz. Aişənin boyunbağının itdiyi aydın oldu. Rəsulullah (s.ə.s) axtarılmasını əmr etdi, buna görə hərəkət ge-

255. İbn Hişam, *e.a.ə.,* III, 308; İbn Sad, *e.a.ə.,*VIII, 177; İbn Həcər, *e.a.ə.,* VII, 565.

cikdi və səhər namazı vaxtı oldu. Halbuki dəstəmaz üçün yanlarında yetəcək qədər su yox idi. Vaxtında hərəkət edilsəydi, su başına çatacaqlardı. Namaz vaxtı çıxacaq deyə hər kəs təlaş içində idi. Hz. Əbu Bəkir bu hala səbəb olan qızı Aişəni danlamışdır. Bununla əlaqədar **“Ey iman gətirənlər! Sərxoş ikən nə dediyinizi anlamayana qədər və cunub (murdar) olduğunuz zaman - yol ötən müsafirlər müstəsnadır - qüsl edənədək namaza (namaz qılınan yerə) yaxınlaşmayın. Xəstələndikdə və ya səfərdə olduqda, sizlərdən biri ayaq yolundan gəldikdə, yaxud qadınlara toxunmuş (yaxınlıq etmiş) olduqda (qüsl və dəstəmaz üçün) su tapmadığınız zaman pak bir torpaqla təyəmmüm edin, (ovuclarınızı) üzünüzə və əllərinizə sürtün! Şübhəsiz ki, Allah əfv edəndir, bağışlayandır!”** (Nisa, 4/43) və **“Ey iman gətirənlər! Namaza durduğunuz zaman üzünüzü və dirsəklərlə birlikdə (dirsəklərdən və ya dirsəklərə qədər) əllərinizi yuyun. (Yaş əlinizlə) başınızı və hər iki bəndə (oynağa) qədər ayaqlarınızı məsh edin (və ya: başınızı məhs edin, ayaqlarınızı isə hər iki topuğa qədər yuyun). Əgər cünub (murdar) olmusunuzsa, qüsl edin (bədəninizi başdan ayağa qədər yuyub təmizləyin). Xəstələndiyiniz, səfərdə olduğunuz, ayaq yolundan gəldiyiniz və ya qadınlarla yaxınlıq etdiyiniz zaman su tapmasanız, pak torpaqla təyəmmüm edin, ondan üzünüzə və əllərinizə sürtün (paklığı niyyət edib əllərinizi bir dəfə torpağa sürtərək üzünüzü, bir dəfə də torpağa sürtərək əllərinizi məsh edin). Allah sizi çətinliyə salmaq istəməz, lakin O sizi pak, təmiz etmək və sizə olan nemətini tamamlamaq (artırmaq) istər ki, bəlkə, şükür edəsiniz!”** ayələri nazil oldu. Müsəlmanlar son dərəcə sevindilər, dərhal təyəmmüm alaraq namazlarını qıldılar.

Hərəkət ediləcəyi əsnada, boyunbağı tapıldı. Boyunbağı Hz. Aişənin çökmüş olan dəvəsinin altında qalmışdı.[256]

### I. İfq (Böhtan) Hadisəsi[257]

Mureysi döyüşü dönüşündə, bir yerləşmə əsnasında Hz Aişə qəza-i ehtiyac

256. Buxari, I, 86; Kamil Miras, *e.a.ə.,* II, 201-204.
257. Buxari, III, 154; Kamil Miras, *e.a.ə.,*VIII, 85-112 (Hədis No: 1151); İbn Hişam, *e.a.ə.,* III, 309-321; İbnu’l-Əsir, *e.a.ə.,* II, 195-199.

üçün mahfəsindən[258] çıxaraq, qonaq qalma yerindən uzaqlaşmışdı. Bu əsnada Yəmən muncuğundan hazırlanmış boyunbağısı düşmüş, onu axtararkən gecikmişdi. Dönüşündə, karvanı yerində tapa bilmədi. Onu mahfəsində sandıqları üçün, gözləməyib hərəkət etmişdilər.

Hz. Aişə -mahfədə olmadığım aydın olunca- məni axtararlar, deyə olduğu yerdə gözləyərkən, arxadan döyüşçülərin buraxdığı şeyləri yığmaqla vəzifələndirilən Safvan b. Muattal gəldi. Hz. Aişəni görüncə, dəvəsini çökdürdü, Hz. Aişə mindi. Safvan dəvəni qarşısından çəkərək irəlilədi. Günorta istisində başqa bir dayanacaq yerində karvana yetişdilər.

Münafiqlər bu hadisəni fürsət bildilər. Hz. Aişə tamamilə örtülü olduğu və Safvan ilə aralarında danışma belə keçmədiyi halda, Hz. Aişənin iffətinə böhtan atmaqdan çəkinmədilər. Rəsulullah (s.ə.s) son dərəcə kədərləndi. Hz. Aişə kədərindən xəstələndi. Sonunda günahsız olduğu **“Həqiqətən, (Aişə barəsində) yalan xəbər gətirənlər öz içərinizdə olan bir zümrədir (münafiqlərdir). Onu (o xəbəri) pis bir şey zənn etməyin. O, bəlkə də, sizin üçün xeyirlidir. O zümrədən olan hər bir şəxsin qazandığı günahın cəzası vardır. Onlardan günahın böyüyünü öz üstünə götürəni (Abdulah ibn Ubeyyi) isə (qiyamət günü) çox böyük (şiddətli) bir əzab gözləyir! Məgər o yalan sözü eşitdiyiniz zaman mömin kişilər və qadınlar öz ürəklərində (özləri haqqında yaxşı fikirdə olduqları kimi, dostlarının da əhli-əyalı barəsində) yaxşı fikirdə olub: “Bu, açıq-aydın bir böhtandır!” - deməli deyildilərmi? (Aişəyə iftira yaxanlar) nə üçün özlərinin doğru olduqlarını təsdiq edəcək dörd şahid gətirmədilər? Madam ki, şahid gətirmədilər, deməli, onlar Allah yanında əsl yalançıdırlar!”** (Nur 24/11-13) ayələri ilə təsbit olundu. Böhtançılara da *“hədd-i kazf”*(iffətli kəslərə böhtan cəzası) tətbiq olundu. Hər birinə 80 dəyənək vuruldu.[259]

---

258. **Mahfə-**Dəvə və fil kimi heyvanların üzərinə qoyulan, səyahət edənlərin içində oturduqları qəfəsli çadır və ya səbət.
259. Nur, 24/40.

## IV. XƏNDƏK DÖYÜŞÜ (Şəvval 5 h./Fevral 627 m.)

Möminlər, müttəfiq düşmən birliklərini gördüklərində: **"Möminlər (müttəfiqlərin) ordu hissələrini gördükdə dedilər: "Bu, Allahın və Peyğəmbərinin bizə olan (zəfər) vədidir. (Biz bununla imtahana çəkilirik. Əgər bu imtahandan yaxşı çıxsaq, zəfər çalacağıq, çünki Allah və Peyğəmbəri həqiqi möminlərə kafirlər üzərində qalib olmağı vəd etmişlər). Allah və Peyğəmbəri düz buyurmuşlar!" Bu (vəziyyət) onların yalnız (Allaha) imanını və itaətini artırdı."** (Əhzab, 33/22) ayəni xatırladılar.

Bir tərəfdən qarşı tərəfə keçməyə maneə törədən dərin və uzun çuxura *"xəndək"* deyilir. Mədinəni müdafiə etmək üçün, ətrafına xəndək qazılan bu döyüşə, "Xəndək Qəzvəsi" deyildiyi kimi, bir çox müşrik və yəhudi qəbiləsi, müsəlmanlara qarşı birləşdiyi üçün *"Əhzab Hərbi"* də deyilmişdir.

"Əhzab", "hızb" sözünün cəmidir. Hizb, eyni düşüncə, inanc və qənaəti paylaşan insan birliyi deməkdir.

### A. Yəhudilərin Müşriklərlə Əməkdaşlığı

Mədinədən sürgün edilən Bəni Nadir yəhudilərinin rəisləri, Xeybərə sığınmışdılar. Müsəlmanlardan qisas almaq istəyirdilər. Başda Huyey b.Ahtab olmaqla, 20-ə yaxın yəhudi lideri 70 nəfərlik bir heyət ilə Məkkəyə getdilər.

-Müsəlmanlar gün keçdikcə qüvvətlənir. Onlara qarşı birlikdə hərəkət etməliyik. Biz döyüş üçün hazırıq. Mədinədəki Bəni Kurayzalı qardaşlarımız da döyüşdə müsəlmanları arxadan vuracaq... deyə müşriklərə əməkdaşlıq təklif etdilər. Özləri *"əhl-i kitab"* və tək tanrı inancında olduqları halda, bütpərəst müşriklərə xoş görünmək üçün: **-"(Ey Rəsulum!) Kitabdan (Tövratdan və ya yazıb-oxumaqdan) bir pay (az bir şey) verilənləri (yəhudiləri) görmürsənmi? Onlar Cibt və Tağuta (bu adda iki bütə, yaxud Cibt adlı bütə və Tağut deyilən Şeytana) inanır və kafirlər üçün də: "Bunlar möminlərdən daha doğru yoldadırlar", - deyirlər. Onlar Allahın lənət etdiyi kimsələrdir. Allahın lənət etdiyi kimsəyə isə heç bir kömək edən tapa bilməzsən!"** (Nisa, 4/51-52) dedilər. Daha sonra Məkkə xaricindəki Qətəfan, Əsəd, Kinanə, Süleym, Fəzarə, Mürrə, Əşca və Əsləm... kimi bədəvi

ərəb qəbilələriylə görüşdülər. Xeybərin bir illik xurma məhsulunu verməyi vəd edərək, onların da döyüşə qatılmalarını təmin etdilər.

Məkkəlilər 300-ü atlı, 1500-ü dəvəli olmaqla 4000 nəfərlik bir ordu hazırladılar. Məkkə xaricindəki bədəvi qəbilələrin qatılmasıyla ordunun sayı 10 minə çatdı. İndiyə qədər belə bir qüvvə toplanmamışdı. Mədinəni tutub islamı yox edəcəkdilər. Ordunun baş komandiri Əbu Süfyan idi.

**B. Mədinə Ətrafına Xəndək Qazılması**

Rəsulullah (s.ə.s) Məkkədəki hazırlıqları, Qureyş ordusu hələ hərəkət etmədən əvvəl xəbər aldı. Səhabələrini yığaraq, bu qorxunc hücumun qarşısının necə alınması barəsində müşavirə keçirdi. Müzakirə əsnasında, əslən İranlı olan Səlman-ı Farisi:

-Ya Rəsulullah, İranda düşmən hücumundan qorunmaq üçün, şəhərin ətrafına, xəndək qazarlar. Biz də elə edək, dedi.

Əsasən Mədinənin üç tərəfi, evlərin yüksək xarici divarları, yalçın qayalıqlar və sıx xurmalıqlarla əhatələnmişdi. Düşmən hücumuna qarşı, yalnız şimal yönü açıq idi. Bu tərəfə də, düşmənin keçə bilməyəcəyi dərinlikdə bir xəndək qazılsa, müdafiə olunmaq asanlaşardı.

Ərəblər tərəfindən bilinməyən bu müdafiə etmə şəkli uyğun görüldü. Hücuma əlverişli olan şimal tərəfdə xəndək qazılacaq yerlər müəyyənləşdirildi.

Rəsulullah (s.ə.s), səhabələrini 10 nəfərlik qruplara ayırdı. Hər qrupun qazacağı qismi təyin etdi. Mövsüm qış, hava soyuq idi. Əsən külək, xəndəkdə çalışanların əllərini ayaqlarını sanki dondururdu. Mədinədə qıtlıq vardı. Müsəlmanlar üç gün bir şey yemədən ac çalışdılar.[260] Rəsulullah (s.ə.s) belə aclıqdan qarnına daş bağlamışdı.[261] Səhabələrlə birlikdə Hz. Peyğəmbər (s.ə.s) şəxsən xəndək qazır, aclığa, soyuğa, yorğunluğa qarşı əhval yüksəldici sözlər söyləyirdi. Bir ara sərt bir qaya çıxmış, kimsə parçalaya bilməmişdi. Rəsulullah (s.ə.s) xəndəyə endi, ilk vuruşda, qayanın üçdə biri qopdu. Hz. Rəsulullah (s.ə.s):

260. *Riyazus-Salihin,* I, 543–548 (Hədis No: 522).
261. Buxari, V, 45; Kamil Miras, *e.a.ə.,* X, 227 (Hədis No: 1588).

-Allahu Əkbər, mənə Şamın açarları verildi. Bu anda Şamın qırmızı köşklərini görməkdəyəm, dedi. İkinci vuruşda qayanın yarısı daha qopdu. Rəsulullah (s.ə.s):

-Allahu Əkbər, mənə Fars ölkəsinin açarları verildi. Bu anda, Kisranın ağ köşklərini görməkdəyəm, buyurdu. Üçüncü zərbədə qaya, tamamilə parçalandı. Rəsuli-Əkrəm (s.ə.s):

-Allahu Əkbər, mənə Yəmənin açarları verildi. İndi mən Sənanın qapılarını görürəm, buyuraraq bütün bu ölkələrin çox yaxında müsəlmanların olacağını müjdələdi.[262] Münafiqlər, Rəsulullahın (s.ə.s) bu müjdələrini xəyal sayırdılar.

**"O zaman münafiqlər və qəlblərində mərəz (şəkk) olanlar: "Allah və Onun peyğəmbəri bizə yalan vəd etmişdir. (Biz zəfər çala bilməyəcəyik)" - deyirdilər."** (Əhzab, 33/12)

Aclığa, soyuğa və hər cür çətinliyə baxmayaraq, təxminən 5,5 km uzunluqda bir atın qarşıya sıçraya bilməyəcəyi genişlik və dərinlikdə qazılan xəndək, düşmən gəlmədən əvvəl, iki həftə içində tamamlandı.

Müşriklər, Mədinə ətrafında indiyə qədər bənzərini görmədikləri dərin bir xəndəklə qarşılaşınca çaşdılar. Bir hücumda Mədinəni alt-üst edib, müsəlmanları yox edəcəklərini xəyal etmişdilər. Bunun asan olmayacağını gördülər. Xəndək boyunca, aşağı-yuxarı irəlilədilər, keçəcək bir yer tapa bilmədilər. Sonunda, Qureyşlilər xəndəyin qərbində, Bədəvi qəbilələr də şərq hissəsində qərargah qurdular. Beləcə Mədinəni mühasirəyə aldılar. (Şəvval 5 h. /Fevral 627 m.)

### C. Çətin Günlər

10 min müşrik ordusu qarşısında, müsəlmanların sayı 3 minə yaxın idi. Yalnız 36 atları vardı. Önlərində xəndək, arxalarında isə Sel dağı vardı. Ancaq Bəni Kurayza razılaşmanı pozub müşriklərlə əməkdaşlıq etsə, müsəlmanlar çox təhlükəli bir vəziyyətə düşəcəkdilər. Bu təqdirdə, müsəlmanlar Xəndək

262. İbn Hişam, *e.a.ə.,* III, 230; İbnu'l-Əsir, *e.a.ə.,* II, 179; Mahmud Esad Efendi, *e.a.ə.,* III, 258-259.

qarşısında düşmənlə məşğul olarkən, yəhudilərin Mədinəyə basqın edib, qadınları və uşaqları qılıncdan keçirmələri mümkün idi.

Qarşılıqlı ox və daşların atılmasıyla başlayan mühasirə, fasiləsiz 27 gün davam etdi. Müsəlmanlar aclıq və səfalət içində, çətin və sıxıntılı günlər keçirdilər. Döyüşün ən təhlükəli bir anında, Bəni Nadir rəisi Huyey b.Ahtabın təşviqiylə Bəni Kurayza yəhudiləri də razılaşmanı pozub, müşriklərlə əməkdaşlığına başladılar. Rəsulullahın (s.ə.s) nəsihət üçün göndərdiyi Evs qəbiləsinin rəisi Sad b. Muazı dinləmədilər. Düşmənliklərini açıqca bildirdilər.

Müsəlmanlar, xəndək qarşısında 10 min müşrik ordusuna qarşı dayanmağa çalışarkən, bir tərəfdən də, Mədinəni yəhudilərin basqınından qorumaq məcburiyyətində qaldılar. Belə təhlükəli bir anda, münafiqlər də ara qarışdırmağa başladılar. Həm döyüşü buraxdılar, həm də döyüşçülərin mənəviyyatını sarsıdıcı propaqanda etdilər. **(“O zaman onlardan bir tayfa: “Ey Yəsrib (Mədinə) əhli. (Burada) sizin üçün duracaq bir yer yoxdur, (evinizə) qayıdın!” - demişdi. Başqa bir dəstə isə: “Evlərimiz açıqdır (kimsəsizdir, oğru girməsindən qorxuruq)” - deyə (geri qayıtmaq üçün) Peyğəmbərdən izin istəyirdi. Həqiqətdə evləri açıq (kimsəsiz) deyildi. Onlar ancaq (döyüşdən) qaçmaq istəyirdilər.”**( Əhzab, 33/13)

Mühasirənin uzanması müşrikləri də bezdirdi. Əsasən onlar, belə günlərlə uzun müddətli mühasirə üçün deyil, bir neçə saatda nəticəyə çatılacaq bir zəfər üçün gəlmişdilər. İşi bir an əvvəl bitirmək üçün bütün gücləriylə ümumi bir hücuma keçdilər. Bir tərəfdən müsəlmanların üzərinə ox yağışı yağdırarkən içlərindən (Dırar, Cübeyrə, Novfəl, Əmr b. Abdivədd kimi) bir neçəsi də, əlverişli bir yerdən atlarıyla xəndəyi keçdilər. Bunların hər biri, ərəblər arasında min cəngavərə bərabər sayılırdı. Ən məşhurları olan Əmr b. Abdivədd mübarizə nəticəsində Hz. Əli tərəfindən öldürüldü, digərləri isə qaçdılar. Novfəl qaçarkən xəndəyə düşdü və Hz. Əlinin qılınc zərbəsindən sonra can verdi.

Sabahısı gün, döyüşün ən çətin günü oldu. Bir tərəfdən müşriklər, digər tərəfdən Bəni Kurayza yəhudiləri hücuma keçdilər, fasiləsiz axşama qədər ox yağışını davam etdirdilər. Rəsulullah (s.ə.s) və müsəlmanlar, o gün namaz

qılmaq üçün belə fürsət tapa bilmədilər. Günorta, ikindi və axşam namazlarını, şamdan əvvəl, tək azanla qəza etdilər.[263]

### Ç. Hərb Hiylədir

Qətəfan qəbiləsindən Nuaym b. Məsud, döyüş əsnasında müsəlman olmuşdu. Bundan kimsənin xəbəri yox idi. Rəsulullahla (s.ə.s) gizlicə görüşərək, müşriklərlə yəhudilərin arasını vurmaq üçün icazə istədi. Rəsulullah (s.ə.s):

-*Hərb hiylədir*,[264] *əlindən gələni et*, buyurdu. Nuaym əvvəl Bəni Kurayzaya getdi.

-Mənim sizə olan dostluğumu bilirsiniz. Sizin üçün narahat oluram. Məkkəlilər bu işdən bezdi, döyüşü buraxıb gedərlərsə, müsəlmanlar qarşısında tək başına qalacaqsınız. O zaman halınız necə olacaq? Onlardan bir neçə girov istəyin, əks halda kömək etməyin... dedi. Sonra Əbu Süfyanın yanına gəldi:

-Eşitdinmi, Bəni Kurayza razılaşmanı pozduğuna peşman olmuş, sizi buraxıb müsəlmanlarla yenidən razılaşmağa başlamış, sizdən girov götürərək onlara təslim etməyi vəd etmişlər, dedi. Əbu Süfyan əsasən yəhudilərə çox güvənə bilmirdi. Sabahısı gün, sınamaq üçün yəhudilərdən kömək istədi. Yəhudilər dərhal girov istədilər. Əbu Süfyan istəklərini qəbul etməyincə, hər iki tərəf də:

-Nuaym doğru söyləmiş, dedilər. Aralarında güvən qalmadı.[265]

### D. Rəsulullahın (s.ə.s) Duası və Mühasirənin Sona Çatması

Rəsulullah (s.ə.s) o çətin gün:

---

263. Bu döyüşdən başqa, heç bir hadisədə Rəsulullahın (s.ə.s) namazının qəzaya qaldığı nəql edilməmişdir. Burada üç vaxt namazın qəzaya qalması, Xəndək döyüşünün nə dərəcə çətin və məşəqqətli keçdiyinin ən böyük dəlilidir. Buna görə Hz. Peyğəmbər (s.ə.s):- *"Allah onların dünyada evlərini, axirətdə qəbirlərini odla doldursun. Bizə ikindini qılmağa fürsət vermədilər, nəhayət günəş batdı"* deyə qarğış etmişdir. Buxari, V, 48 və III, 233; Kamil Miras, *e.a.ə.,* II, 238 (Hədis No: 353) və VIII, 396 (Hədis No: 1233 və şərhi).
264. Buxari, IV, 24.
265. İbnu'l-Əsir, *e.a.ə.,* II, 182-184.

*-Allahım! Ey Quranı endirən və hesabı tez edən Rəbbim; Bu ərəb qəbilələrini dağıt, birliklərini poz, iradələrini sarsıt* [266] deyə dua etdi. Duası bitincə, Rəsulullahın (s.ə.s) üzündə sevinc izləri göründü. Rəbbimin kömək vədini sizə müjdələyirəm, buyurdu. Elə o axşam, ayeyi-cəlilə və hədisi-şərifdə bildirilən *"səba küləyi"* əsməyə başladı.[267] Fırtına və qasırğa çadırları söküb uçurdu, yemək qazanları aşdı, ocaqlar söndü, dəvələr və atlar bir-birinə qarışdı. Müşriklərin ağızları, burunları, gözləri toz-torpaqla doldu. Qərargahları alt-üst oldu. Ortalığı dəhşət bürüdü. Nəyə məruz qaldıqlarını anlamaya bilmədilər.

Müşriklərin mənəviyyatı yaxşıca pozulmuşdu. Qəlblərinə qorxu düşdü. Uzun sürən və heç bir nəticə alına bilinməyən mühasirədən bezmişdilər. Əbu Süfyan:

-Mən dönürəm, siz də gəlin, deyərək dəvəsinə mindi və Məkkəyə doğru hərəkət etdi. Digərləri də onu izlədilər.

Çaxnaşma çox ani və şüursuzca olmuşdu. Buna görə, müşriklər xeyli çox təchizat, qida maddəsi və əşyanı yığa bilmədən qaçdılar. Səhər olunca, müsəlmanlar düşməndən qalan əşyanı və sağa-sola dağılan dəvələri yığıb qərargahlarına gətirdilər. Əbu Süfyanın yəhudilərdən götürdüyü 20 dəvə yükü xurma da ələ keçən qənimətlər arasında idi. Beləcə, müsəlmanlar həm mühasirədən, həm də aclıq çətinliyindən xilas oldular.

Qurani-Kərimdə bu vəziyyət belə izah edilməkdədir:

**"Ey iman gətirənlər! (Xəndək, yaxud Əhzab vuruşunda Qureyş, Qətəfan və yəhudilərin Bəni-Nəzir qəbilələrindən təşkil olunmuş) ordular sizin üstünüzə gəldiyi zaman Allahın sizə olan nemətini yada salın. O vaxt Biz onların üstünə külək və sizin görmədiyiniz (mələklərdən ibarət) qoşun göndərmişdik. Allah o zaman sizin nə etdiyinizi görürdü."** (Əhzab, 33/9)

**"Allah kafirləri qəzəbli olduqları (məqsədlərinə çatmadıqları) halda geri oturtdu. Onlar heç bir xeyir (qənimət) əldə edə bilmədilər. Döyüşdə (zəfər çalmağa) Allah möminlərə kifayət etdi. Allah yenilməz qüvvət sahibi, qüdrət sahibidir!"** (Əhzab, 33/25)

---

266. Buxari, III, 234 və V, 49; Kamil Miras, *e.a.ə.,* VIII, 395 (Hədis No: 1233).
267. Buxari, V, 47.

Bu döyüşdə, müşriklərdən 4 həfər ölmüş, müsəlmanlar isə 5 şəhid vermişdilər. Döyüşdən sonra Rəsulullah (s.ə.s):

-*"Bundan sonra sıra bizdədir. Müşriklər artıq üzərimizə gələ bilməyəcək. Biz onların üzərinə gedəcəyik."* buyurdu.[268] Həqiqətən də budan sonra baş verən müharibələrdə Rəsulullahın (s.ə.s) dediyi kimi olmuşdur.

## E. Kurayzaoğulları Qəzvəsi (Zilqədə 5 h./Mart 627 m.)

### 1. Döyüşün Səbəbi

Rəsulullah (s.ə.s), Mədinədəki yəhudi qəbilələriylə ayrı-ayrı razılaşmalar imzalamışdı. Bunlardan Kaynuka və Nadiroğullarının, müqavilə şərtlərinə tabe olmadıqları üçün Mədinədən çıxarıldıqlarını daha əvvəl görmüşdük. Kurayzaoğulları isə, Uhud döyüşündən sonra razılaşmanı yenilədikləri üçün yerlərində qalmışdılar.

Xəndək döyüşündə, Bəni Kurayza yəhudiləri əvvəl razılaşmaya tabe qaldılar. Xəndək qazılarkən, qazma, kürək kimi alətlər verərək müsəlmanlara köməkçi oldular. Ancaq, döyüşün ən təhlükəli bir anında, Bəni Nadir rəisi Huyey b. Ahtabın təşviqiylə razılaşmanı pozdular. Müsəlmanlarla birlikdə Mədinəni müdafiə etmələri lazımkən, müşriklərlə birlikdə, müsəlmanlara qarşı döyüşə girdilər.[269] Beləcə vətənə xəyanət günahı işlədilər. Rəsulullahın (s.ə.s) nəsihət üçün göndərdiyi Evs qəbiləsinin rəisi Sad b. Muazın sözlərinə də qulaq asmadılar. Hz. Peyğəmbər (s.ə.s) haqqında çirkin sözlər söyləyərək düşmənliklərini açıqca elan etdilər. Bəni Kurayzadan etdiklərinin hesabı soruşulmalıydı. Bu səbəblə, Xəndək döyüşündən sonra, Bəni Kurayza üzərinə səfər əmri verildi.

Rəsulullah (s.ə.s), Xəndək döyüşündən sonra silahlarını çıxarmış, üzərindəki toz-torpağı təmizləmək üçün, qüsul almaq istəmişdi. Bu əsnada Cəbrayıl (ə.s.) at üstündə olduğu halda toz-torpaq içində gəldi:

-"Silahını çıxardınmı! Vallah biz mələklər çıxarmadıq. Haydı, bunların

268. Buxari, V, 48; Kamil Miras, *e.a.ə.,* X, 230 (Hədis No: 1589); İbnu'l-Əsir, *e.a.ə.,* II, 184.
269. Əhzab, 33/26.

üzərinə gedin", deyə Kurayzaoğullarını işarə etdi.[270] Rəsulullah (s.ə.s) dərhal Bəni Kurayzaya səfər elan etdi. Səhabələrin sürətlə yola çıxmalarını təmin etmək üçün;

-Heç kim ikindi namazını əsla başqa yerdə qılmasın. Ancaq Bəni Kurayza yurdunda qılsın buyurdu.

Səhabələrin bir qismi bu əmrin zahirinə uyaraq, namazlarını Bəni Kurayza yurduna çatdıqda qıldılar. Bir qismi də Peyğəmbərin (s.ə.s) məqsədi, tələsik yığışmağımızı təmin etməkdir deyərək, namaz vaxt çıxmadan yolda qıldılar. Hz. Peyğəmbər (s.ə.s) hər iki qrupun etdiyini xoş qarşıladı.[271]

Müsəlmanların toplanması axşama qədər davam etdi. Sayları 3 minə çatdı. Müsəlmanların üstlərinə gəldiyini görüncə tələm-tələsik qalalarına çəkilən Bəni Kurayzanın sayı 900-ə yaxın idi.

### 2. Bəni Kurayzaya Verilən Cəza

Mühasirə 25 gün davam etdi. Kurayzaoğulları razılaşmanı pozduqlarına peşman oldular. Digər yəhudi qəbilələri kimi Mədinədən çıxıb getmək üçün icazə istədilər. Lakin, Hz. Peyğəmbər (s.ə.s) qeydsiz-şərtsiz təslim olmalarını istədi.Yəhudilər rəisləri Kab b. Əsədin başçılığında toplandılar. Kab:

-Tövratda bildirilən son peyğəmbərin bu olduğu aydın oldu. Müsəlman olub xilas olaq, dedi. Yəhudilər:

-Biz Tövrat üzərinə başqa kitab qəbul etmərik, dedilər, Kab:

-Elə isə, qadınları və uşaqları öldürək. Sonra qaladan çıxıb vuruşaq, bəlkə bacararıq, dedi. Onlar:

-Uşaqlarımız öldükdən sonra, yaşamağın nə əhəmiyyəti var, deyə cavab verdilər. Kab:

-O halda, sabah şənbədir, müsəlmanlar bizdən əmindir. Qəflətən hücum edək, onları qafil ovlayaq, dedi.

---

270. Buxari, V, 49-51; Kamil Miras, *e.a.ə.,* VIII, 325 (Hədis No: 1191).
271. Buxari, V, 50; Müslim, III, 1391 (Hədis No: 1770).

-Biz şənbənin hörmətini poza bilmərik, deyə rədd etdilər. Sonunda qeydsiz-şərtsiz təslim oldular. Ancaq haqlarında Evs qəbiləsi rəisi Sad b. Muazın hökm verməsini istədilər.

Bəni Kurayza, Evs qəbiləsinin himayəsində idi. Buna görə, Sad b. Muazın hakimliyini istəyirdilər. Sad, xəstə idi. Xəndək döyüşündə qolundan oxla yaralandığı üçün müalicə olunurdu. Xəbəri eşidən kimi gəldi.

-Qurani-Kərimə görəmi, yoxsa öz qanunlarına görəmi hökm verməyimi istəyirlər, deyə soruşdu. Yəhudilər, öz qanunlarına görə hökm verilməsini istədilər. Sad da Tövrata görə:[272]

a. Döyüşə biləcək vəziyyətdəki kişilərin öldürülməsinə

b. Qadınların və uşaqların əsir edilməsinə

c. Bütün mallarının da zəbt edilməsinə, hökm verdi.

Rəsuli-Əkrəm (s.ə.s):

*"Ey Sad, Allahın istədiyi kimi hökm verdin"* buyurdu.[273] Yəhudilər də qərarın Tövrata uyğun olduğunu etiraf etdilər.

Bəni Kurayza haqqındakı hökmü Hz. Əli və Hz. Zübeyr icra etdilər. Qazılan böyük bir xəndəyin kənarında 600 qədər yəhudinin bir-bir boyunlarını vurub xəndəyə atdılar. İçlərindən 4 nəfər müsəlman olub həyatlarını qurtardılar. Bəni Nadir rəisi Huyey b. Ahtab ilə Bəni Kurayza rəisi Kab b. Əsəd də öldürülənlər arasında idi.

Bəni Kurayzanın malları mücahidlərə paylaşdırıldı. Ərazisi isə, ənsarın razılığıyla mühacirlərə verildi.

**"Allah kitab əhlindən onlara (kafirlərə) kömək edənlərin ürəklərinə qorxu salıb onları öz qalalarından endirdi. Siz onların bir qismini öldürür, bir qismini də əsir alırdınız. (Allah) sizə onların yerlərinə, yurdlarına və mallarına, üstəlik də ayağınız dəyməyən bir yerə (Xeybərə) varis etdi. Allah hər şeyə qadirdir!".** (Əhzab, 33/26-27)

272. Tövrat, *Təsniyə Kitabı*, Bab: 20, Ayə: 10–14.
273. Buxari, V, 50; Kamil Miras, *e.a.ə.,* X, 245 (Hədis No: 1591).

**Ə. Rəsulullahın (s.ə.s) Zeynəb bint Caxşla Evlənməsi**

Zeynəb, Rəsulullahın (s.ə.s) öz bibisi Ümeymənin qızıdır. Əbdülmüttəlibin nəvəsidir. Hz Peyğəmbər (s.ə.s) Zeynəbi azadlısı Zeyd b. Harisəylə evləndirmişdi. Dindar olmasına baxmayaraq, azadlı bir kölənin yoldaşı olmaq Zeynəbə ağır gəldi. Zadəganlıq və gözəlliyini irəli sürərək, daim Zeydin ürəyini qırdı. Buna görə, Rəsulullahın (s.ə.s):

**-"(Ey Peyğəmbər!) Xatırla ki, bir zaman Allahın (islam dininə yönəltməklə) nemət verdiyi və sənin özünün (köləlikdən azad etməklə) nemət verdiyi şəxsə (Zeyd ibn Harisəyə): "Zövzəni (Zeynəb bint Cəxşi) saxla (boşama), Allahdan qorx!" - deyir, Allahın aşkar etdiyi şeyi (Zeynəbin boşanacağı təqdirdə onu almağın haqda sənə nazil olan vəhyi) ürəyində gizli saxlayır və adamlardan (onların Peyğəmbər oğulluğunun boşadığı övrətlə evlənir, - deyəcəklərindən) qorxurdun. Halbuki əslində sənin qorxmalı olduğuna ən çox layiq Allahdır. Zeyd zövcəsi ilə əlaqəsini kəsdikdə (Zeynəbi boşadıqda) səni onunla evləndirdik ki, oğulluqları övrətlərini boşadıqları zaman onlarla evlənməkdə möminlərə heç bir çətinlik (günah) olmasın! (Bu işdən möminlərə heç bir günah gəlmədiyini bildirmək üçün belə bir övrətlə birinci səni evləndirib bütün müsəlmanlara nümunə etdik). Allahın hökmü mütləq yerinə yetər!"** (Əhzab, 33/37) əmrinə baxmayaraq, sonunda Zeyd onu boşadı.

Əsasən gərək Zeynəb, gərək qardaşı Abdullah bu evliliyi başlanğıcda istəməmişdilər, "bibinizin qızını azadlınızamı layiq görürsünüz?" demişdilər. Lakin:

**-"Allah və Peyğəmbəri bir işi hökm etdiyi zaman heç bir mömin kişiyə və qadına öz işlərində başqa yol seçmək (öz ixtiyarları ilə ayrı cür hərəkət etmək) yaraşmaz. Allaha və Onun Peyğəmbərinə asi olan kəs, şübhəsiz ki, (haqq yoldan) açıq-aydın azmışdır!"** (Əhzab, 33/36) mənasındakı ayə enincə, istəməyərək razılaşmışdılar. Çünki Zeynəb, Qureyşin Haşimi qolundan, soylu bir qadın idi. İslamdan əvvəlki ərəb ənənəsinə görə soylu bir qadın, azadlı da olsa, bir köləylə evlənə bilməzdi. Onlar, Zeynəbin Rəsulullahla (s.ə.s) evlənməsini istəyirdilər. Halbuki islam dini bütün insanları yaradılış baxımından bərabər élan etmişdi.[274]

274. Hucurat, 49/13; *"Ey insanlar Rəbbiniz birdir, atanız birdir. Ərəbin əcəmə (Ərəb*

Hz. Peyğəmbər (s.ə.s) öz bibisinin qızı Zeynəbi azadlısı və övladlığı Zeyd ilə evləndirərək, ərəblərin səhv anlayışını yıxmış oldu.

Digər tərəfdən Rəsulullah (s.ə.s), peyğəmbərliyindən əvvəl Zeydi övladlığa götürmüşdü. Ərəblərin ənənəsinə görə, övladlıq öz uşağı kimi sayılır, övladlıq adamın varisi və məhrəmi olardı. Bu səbəblə, övladlığın boşadığı qadın, övlad əldə edən adamla evlənə bilməzdi. Qurani-Kərim ərəblərin bu ənənəsini doğru görməmiş, övladlıq adətini qaldırmışdır. **("Allah bir adamın sinəsində (daxilində) iki ürək yaratmamışdır. (Eləcə də iki Allah ola bilməz). Allah nə zihar etdiyiniz (arxasını ananızın arxasına oxşadaraq yaxınlıq etmədiyiniz, talağını verdiyiniz) zövcələrinizi sizə doğma ana, nə də oğulluğa götürdüklərinizi sizə doğma oğl etmişdir. (Onlar əslində öz atalarının oğullarıdır). Bunlar sizin dediyiniz boş (mənasız) sözlərdir. Allah doğru deyir və (bəndələrini) doğru yola gətirir!"** (Əhzab, 33/4). Bu səbəblə, övladlığın dul qalan yoldaşıyla, atalığın evlənməsi halaldır.

Rəsulullahın (s.ə.s) ərəblərin bu ənənəsini də yıxması lazım idi. Bu səbəblə Zeyddən boşanan Zeynəbi Allahın əmriylə aldı.[275] Beləcə həm Zeynəbi, həm də yaxınlarını məmnun etmiş oldu.

Göründüyü kimi, Hz. Peyğəmbərin (s.ə.s) bu evliliyi, dini hökmlərin tətbiq olunması ilə əlaqədardır.

## V. HUDEYBİYƏ MÜQAVİLƏSİ (Zilqədə 6 h. /Mart 628 m.)

**"(Ya Peyğəmbər!) Həqiqətən, Biz sənə (müsəlmanların fütuhatının başlanğıcını qoyan, Kəbənin yerləşdiyi Məkkə şəhərinin, habelə bir çox başqa məmləkətlərin fəthinə səbəb olacaq Hüdeybiyyə sülhü ilə) açıq-aşkar bir zəfər bəxş etdik!."** (Fəth, 48/1)

---

*olmayana), ağın qaraya, qaranın ağa və ya kızıldəriliyə üstünlüyü yoxdur. Üstünlük ancaq təqva ilədir."*(Əhməd b. Hənbəl, *e.a.ə.,*V, 411).

275. Əhzab, 33/37.

### A. Müsəlmanların Kəbəni Ziyarət Etmək Arzusu

Peyğəmbərimiz Hz. Məhəmmədin (s.ə.s) Mədinəyə hicrət etdiyi 6 il olmuşdu. Bu müddət içində Məkkə müşrikləriylə, Mədinədə olan müsəlmanlar arasında, sırasıyla Bədir, Uhud və Xəndək döyüşləri oldu. Məkkə müşrikləri Mədinəyə hücum edərək, Hz. Peyğəmbəri (s.ə.s) öldürmək, islamı yox etmək üçün hər yola baş vurdular. Bütün imkan və güclərini ortaya qoydular. Lakin, məqsədlərinə çata bilmədilər. Müsəlmanların gündən-günə güclənmələrinə, saylarının artmasına mane ola bilmədilər.

Ancaq Mədinə xaricindəki qəbilələr, islamın nə olduğunu kifayət qədər bilmirdilər. Kəbənin qonşusu və qoruyucusu olduğu üçün hörmət etdikləri Qureyş qəbiləsi, öz içlərindən çıxdığı halda Hz. Məhəmmədin (s.ə.s) peyğəmbərliyini qəbul etməmiş, hətta onu yurdundan çıxarmışdılar. Buna görə, islamın Mədinə xaricindəki qəbilələrə tanıdılması və geniş ölçüdə yayılmasını təmin etmək üçün, Məkkəlilərlə sülhün əldə edilməsinə ehtiyac vardı. Rəsulullah (s.ə.s) müvəqqəti də olsa Məkkəlilərlə sülh imzalayaraq, digər qəbilələrlə sərbəstcə əlaqələr qurmağı arzu edirdi.

Digər tərəfdən Məkkəli müsəlmanlar, doğulub böyüdükləri və hər şeylərini buraxıb ayrıldıqları yurdları üçün çox darıxmışdılar. Hər namazda yönəldikləri müqəddəs Kəbəni 6 ildən bəri ziyarət edə bilmirdilər. Kəbəni ziyarət, bütün müsəlmanların ən böyük ortaq həsrətləri olmuşdu.

### B. Rəsulullahın (s.ə.s) Yuxusu

Hicrətin 6-cı ili, Rəsulullah (s.ə.s), gördüyü bir yuxu üzərinə[276] birlikdə Kəbəni ziyarət edəcəklərini səhabələrinə müjdələdi.[277] Hazırlıqlar tamamlandı. Döyüş edilməsi qadağan olan aylardan Zilqədənin ilk bazar ertəsi günü (2 Zilqədə 6 h. /14 Mart 628 m.), yerinə Abdullah b. Ümmi Məktumu vəkil (baş məmur) təyin edərək, səhabələrindən 1400 nəfərlə[278] Mədinədən ayrıl-

276. Fəth, 48/27.
277. Mədinə ətrafındakı hələ müsəlman olmayan Muzeynə, Cüheynə, Gıfar, Əsləm kimi qəbilələri də birlikdə Kəbəni ziyarət üçün dəvət etsələrdə, bunlar Qureyşdən çəkindikləri üçün, müsəlmanlara qoşulmadılar. Kamil Miras, *e.a.ə.,* VIII, 177 (Hədis No: 1164 və şərhi).
278. Buxari, V, 62-63; Kamil Miras, *e.a.ə.,* VIII, 264 (Hədis No: 1599).

dı. Xanımlarından Ümmü Sələmə də özüylə bərabər idi. Məqsədi döyüş olmayıb, yalnız Kəbəni ziyarət etmək idi. Məkkəliləri təlaşlandırmamaq üçün, səhabələrinin silah daşımalarına icazə verməmiş, yalnız yolçu silahı olaraq qılınc götürmüşdülər.[279] Həcc üçün Məkkəyə gələcək düşmən qəbilələrlə yolda qarşılaşmamaq üçün, Kəbə ziyarətini həcc günlərindən əvvəl etməyi uyğun görmüşdü. Yanlarındakı 70 qurbanlıq dəvə ilə Zülhuleyfədə "ümrə" niyyətiylə ehrama girdilər.[280] Yol təhlükəsizliyini təmin etmək üçün 20 süvarini kəşfiyyat üçün göndərdilər.

### C. Məkkəlilərin Reaksiyası

Məkkəlilər, Hz. Peyğəmbərin (s.ə.s) Kəbəni ziyarət etmək üçün yola çıxdığını eşidincə təlaşlandılar. Müsəlmanları Məkkəyə buraxmamağa qərar verdilər. Xalid b.Vəlid və İkrimə b. Əbu Cəhli 200 süvari ilə kəşfiyatçı olaraq göndərdilər.

Rəsulullah (s.ə.s) Məkkəlilərin bu qərarını qabaqcadan göndərdiyi gözətçiləri vasitəsiylə öyrəndi. Sağ tərəfə dönüb yolunun istiqamətini dəyişdirərək, Hudeybiyəyə qədər getdilər.[281] Rəsulullahın (s.ə.s) mindiyi "Kəsva" adlı dəvə burada çökdü, bütün səylərə baxmayaraq qalxmadı. Müsəlmanlar:

-Kəsva harınladı çökdü qalxmır, deyə deyinməyə başladılar. Rəsulullah (s.ə.s):

-"Kəsva harınlamaz, onun çökmə xasiyyəti də yoxdur. Lakin, vaxtilə Filin Məkkəyə girməsinə mane olan ilahi qüdrət, indi də Kəsvanı irəlilətmir. Allaha and olsun ki, Qureyş Allah təalanın müqəddəs etdiyi şeylərə hörmət və təzim qəsdiylə məndən hər nə istəsə, nə qədər ağır olursa olsun, istədiklərini qəbul edəcəyəm.." buyurdu.[282]

---

279. O dövrdə, çöldə yırtıcı heyvanlara və soyğunçulara qarşı hər yolçunun üzərində qılınc saxlaması adət və zəruri idi.
280. Ümrə, ehramlı olaraq Kəbəni təvaf və ziyarət etmək, Səfa ilə Mərvə arasında Say etdikdən sonra təraş olaraq ehramdan çıxmaqdan ibarətdir. Ümrə üçün müəyyən bir zaman yoxdur, hər vaxt edilə bilər. Həcc isə müəyyən zamanda (ancaq həcc mövsümündə) edilir.
281. Hudeybiyə, Mədinəyə 9 mil, Məkkəyə isə 1 günlük məsafədə yerləşən kiçik bir kənddir. Adını, buradakı eyni adı daşıyan bir quyudan götürmüşdür. Kamil Miras, *e.a.ə.,* X, 258.
282. Buxari, III, 178; Kamil Miras, *e.a.ə.,* VIII, 178 (Hədis No: 1164); Müsəlmanların endiyi

## Ç. Sülh Müqaviləsinin Müzakirələri

Bu zaman Huzaa qəbiləsi rəisi Büdeyl gəldi. Qureyşin, müsəlmanları Məkkəyə buraxmamaq üçün müşrik qəbilələrlə razılaşaraq, döyüşə hazırlaşdıqlarını xəbər verdi.[283]

Rəsulullah (s.ə.s) döyüş məqsədiylə deyil, yalnız Kəbəni ziyarət üçün gəldiklərini, daha əvvəl edilən döyüşlərdə Qureyşin verdiyi itgiləri izah etdi.

-İstəyərlərsə müəyyən bir müddət onlarla sülh imzalayaq. Mənimlə digər qəbilələrin arasına qarışmasınlar. Əgər mən üstün gəlib ərəblər də islamiyyəti qəbul etsələr, Məkkəlilər də istəyərlərsə bu dinə girə bilərlər. Əgər ərəblər mənə üstün gələrlərsə, Qureyş döyüş xərci çəkmədən istədiyini əldə etmiş olar. Əks halda, Allaha and içirəm ki, Onun yolunda ölənə qədər onlarla döyüşərəm, Allah da köməyini əsirgəməz, dinini üstün edər, buyurdu.[284]

Büdeyl, Rəsulullahdan (s.ə.s) eşitdiklərini Qureyşə çatdırdı. Qureyşin liderləri də döyüş tərəfdarı deyildi. Sakif qəbiləsinin rəisi Taifli Urvə b. Məsudu Hz. Peyğəmbərə (s.ə.s) göndərdilər. Rəsulullah (s.ə.s) Büdeylə söylədiklərini Urvəyə də izah etdi. Urvə həm Rəsuli-Əkrəmlə (s.ə.s) danışır, həm də müsəlmanların vəziyyətini və bütün davranışlarını diqqətlə izləyirdi. Dönüşündə gördüklərini xülasə ilə belə izah etdi:

-Bilirsiniz ki mən bir çox dövlət başçısını ziyarət etdim, Rum Qeysəri, Fars Kisrası, Həbəş Nəcaşisinin iqamətgahında elçi olaraq oldum. And içirəm ki, müsəlmanların Məhəmmədə (s.ə.s) göstərdikləri hörmət, sevgi və bağlılığı bunların heç birisinin sarayında görmədim... Sözlərini diqqətlə dinləyirlər. Bir şey soruşulduğu zaman alçaq səslə cavab verirlər. İstəyini dərhal yerinə yetirirlər. Həyalarından yüzünə diqqətlə baxa bilmirlər. Dəstəmazından artıq qalan suyu belə, -təbərrük üçün-aralarında paylaşırlar. Belə ki, bizə sülh təklif edir, qəbul edək, dedi.

---

yerdəki "Səməd" adlı quyuda çox az su vardı. Hər kəs götürməyə başladıqda, bir anda quyunun suyu qurtardı. Susuzluqdan şikayət etməyə başladılar. Rəsulullah (s.ə.s) ox torbasından çıxardığı bir oxu, quyunun dibinə qoymalarını əmr etdi. Artıq oranı tərk edənə qədər sudan korluq çəkmədilər. Bax: Buxari, III, 178 və V, 62.

283. Huzaa qəbiləsiylə, Haşimoğulları arasında cahiliyyət dövründən dostluq vardı. Huzaalılar bu dostluğu islamdan sonra da davam etdirdilər. Bütün Huzaalılar, Məkkədə olub keçənləri Rəsulullahdan (s.ə.s) gizləməzlər, gizlicə ona bildirərdilər.

284. Buxari, III, 79; Kamil Miras, *e.a.ə.,* VIII, 181 (Hədis No: 1164).

Məkkəlilər, Urvənin sözlərindən xoşlanmadılar. Bir neçə elçi daha gedib gəldi, lakin heç bir nəticəyə gələ bilmədilər.

Rəsulullah (s.ə.s), Qureyşdən gələn elçilərlə nəticəyə gələ bilmədiyini gördü. Qureyşlə görüşmək üçün Hz. Öməri Məkkəyə göndərməyi düşündü. Ömər:

-Ya Rəsulullah, məkkəlilər mənim özlərinə olan düşmənliyimi bilirlər, himayəsinə sığına biləcəyim bir yaxınım da yoxdur. Osmanın Məkkədə qohumları çoxdur. Bundan əlavə Əbu Süfyan ilə əmi uşağıdırlar. Osman bu işi məndən daha yaxşı bacarar, dedi.

Hz. Osman Məkkəyə getdi. Əbu Süfyan və digər Qureyş liderləri ilə görüşdü. Məqsədlərinin yalnız Kəbəni ziyarət etmək olduğunu izah etdi. Məkkəlilər:

-Hamınızı Məkkəyə buraxsaq ərəblər, "Qureyş müsəlmanlardan qorxdu," deyərlər. Lakin, istəsən Kəbəni sən təvaf et, hamınız birdən olmaz, dedilər. Hz. Osman, Kəbəni müsəlmanlardan ayrı olaraq ziyarət etməyi qəbul etmədi.

-Rəsulullah (s.ə.s) təvaf etmədikcə, mən də etmərəm, deyərək təkliflərini rədd etdi. Onun bu davranışı Məkkəliləri hirsləndirdi, göz altına aldılar və geri dönməsinə icazə vermədilər.

**D. Ridvan Beyəti**

**"(Ey Peyğəmbər!) And olsun ki, (Hüdeybiyyədə) ağac altında sənə beyət etdikləri zaman Allah möminlərdən razı oldu. (Allah) onların ürəklərində olanı (sənə sadiq qalacaqlarını, əhdə vəfa edəcəklərini) bildi, onlara (öz dərgahından) arxayınlıq (rahatlıq, səbir, səbat, mənəvi qüvvə) göndərdi və onları yaxın gələcəkdə qazanılacaq bir qələbə (Xeybərin fəthi) ilə mükafatlandırdı. Həm də (Xeybərdə) ələ keçirəcəkləri çoxlu qənimətlərə (nail etdi). Allah yenilməz qüvvət sahibi, hikmət sahibidir!"** (Fəth, 48/18-19)

Hz. Osmanın gecikməsi müsəlmanları təlaşlandırdı. Öldürüləcəyinə dair söz-söhbətlər çıxdı. Belə bir ehtimala qarşı Rəsulullah (s.ə.s) lazım olan

tədbirləri aldı. Müsəlmanları Allah yolunda edəcəkləri döyüşdə, canlarını fəda etməkdən çəkinməyəcəklərinə dair, özünə beyət etməyə çağırdı. "Artıq bunlarla vuruşmadan buradan ayrılmarıq" buyurdu.

İlk beyət edən Əbu Sinan əl-Əsədi oldu. "Rəsulullahın (s.ə.s) könlündəki muradı nə isə, onun reallaşması üçün beyət edirəm." dedi.

Hudeybiyədə alçaq bir ağacın altında,[285] bütün müsəlmanlar sırayla Rəsulullahın (s.ə.s) əllərini tutaraq beyət etdilər. Allah yolunda ölənə qədər döyüşməyə, düşməndən qaçmamağa söz verdilər. Hz. Peyğəmbər (s.ə.s), Hz. Osman adına da bir əlini digəriylə tutdu, onu da beləcə beyətə qatdı. Yalnız Cədd b. Kays adlı münafiq dəvəsinin arxasında gizlənərək beyətə qoşulmadı.

Allah təala Qurani-Kərimdə, Hudeybiyədə Rəsulullaha (s.ə.s) beyət edən möminlərdən razı olduğunu bildirmişdir.[286] Bu səbəblə, islam tarixində bu beyətə "Ridvan Beyəti" adı verilmişdir.

Müsəlmanların səbrini və Rəsulullaha (s.ə.s) bağlılıqlarını göstərən bu beyətin Məkkəlilər üzərindəki təsiri böyük oldu. Dərhal Hz. Osmanı sərbəst buraxdılar və Hz. Peyğəmbərlə (s.ə.s) sülh bağlamaq üçün Süheyl b.Əmrin başçılığında bir heyət göndərdilər. Uzun müzakirələrdən sonra qəbul edilən sülhün şərtləri bunlardır:

1. Müsəlmanlar bu il Kəbəni ziyarət etmədən dönəcəklər, bir il sonra ziyarət edəcəklər.

2. Müsəlmanlar Kəbəni ziyarət üçün gəldiklərində, Məkkədə üç gündən çox qalmayacaqlar və yanlarında qılıncdan başqa silah saxlamayacaqlar.

3. Müsəlmanların Məkkədə olduğu günlərdə, Qureyşlilər Məkkə xaricinə çıxacaqlar, müsəlmanlarla təmas etməyəcəklər.

4. Məkkəlilərdən biri müsəlmanlara sığınsa, müsəlman belə olsa, geri veriləcək. Lakin, müsəlmanlardan Məkkəlilərə sığınan olsa, geri istənilməyəcək.

---

285. Bu ağac, müsəlmanlar arasında zamanla müqəddəs sayıla bilər düşüncəsiylə xəlifəliyi dövründə Hz. Ömərin əmriylə kəsilmişdir.
286. Fəth, 48/18.

5. Qureyş xaricində qalan digər qəbilələr, iki tərəfdən istədiklərinin himayəsinə girməkdə və müqavilə bağlamaqda sərbəst olacaqlar.

6. Bu razılaşma on il etibarlı olacaq, bu müddət içində iki tərəf arasında təcavüz və döyüş olmayacaq.

**E. Sülh Razılaşmasının Yazılması**

Sülhün şərtlərini Rəsulullah (s.ə.s) Hz. Əliyə yazdırdı. “Bismillahir-rahmanir-rahim. Bu razılaşma, Məhəmməd Rəsulullah ilə Qureyş elçisi Süheyl arasında edilmişdir.” deyə yazılmasına Süheyl etiraz etdi.

- “Rəhman” sözünü anlamırıq, ayrıca sənin Rəsulullah olduğunu qəbul etsəydik, bu razılaşmaya gərək yox idi “Bismikallahümmə (Allahım, sənin adınla). Bu razılaşma Abdullahın oğlu Məhəmməd ilə Qureyş elçisi Süheyl arasında edilmişdir.” deyə yazılmasını istədi.[287]

-Rəsulullah (s.ə.s) barışı təmin etmək istəyirdi. Daha işin başında, “Allaha and olsun ki, Qureyş məndən Allah təalanın müqəddəs etdiyi şeylərə hörmət məqsədi ilə hər nə istəsə, nə qədər ağır olursa olsun, istəklərini qəbul edəcəyəm,” buyurmuşdu. Bu səbəblə, bütün bu ağır şərtləri qəbul etdi.

Lakin, müsəlmanlar son dərəcə kədərlənidilər. Böyük bir ümid və həyəcanla gəlmişdilər. Halbuki indi Kəbəni ziyarət edə bilmədən dönəcəkdilər.

Razılaşmanın yazılması hələ bitməmişdi ki, Süheylin oğlu Əbu Cəndəl, ayağındakı zənciri sürüyərək çıxıb gəldi. Atası onu müsəlman olduğu üçün, zəncirə vuraraq həbs etmişdi. Bir təhər xilas olmuş, min bir çətinliklə Məkkədən qaçmış, müsəlmanlara sığınmağa gəlmişdi.

Süheyl oğlunun geri verilməsində israr etdi. Əks halda razılaşmanı imzalamadan dönəcəyini söylədi. Bütün səylərə baxmayaraq, inadından dönmədi. Sülhün təmin edilə bilməsi üçün, Əbu Cəndəlin müşriklərə təslimi lazım idi. Çəkdiyi işgəncələri və kədərli halını izah edərək müşriklərə verilməməsini istəyən Əbu Cəndəli Rəsulullah (s.ə.s):

287. Kamil Miras, *e.a.ə.,* VIII, 136-141 (Hədis No: 1158).

-Ey Əbu Cəndəl, bir az daha səbr et, çox yaxında Uca Rəbbim sənə və sənin kimilərə qurtuluş yolunu açacaq, deyə təsəlli verdi.

**Ə. Səhabələrin Hüznü**

Lakin bu son vəziyyət, artıq müsəlmanların hüznlərini dözülməz hala gətirmişdi. Hamısının əsəbləri gərgin idi. Hz. Ömər dözə bilmədi. Rəsulullahın (s.ə.s) hüzuruna gələrək:

-Sən Allahın Peyğəmbəri deyilsənmi? Bizim dinimiz haqq deyilmi? Niyə bu zilləti qəbul edirik, niyə? deyə soruşdu. Hz. Peyğəmbər (s.ə.s):

-Bəli mən Allahın Peyğəmbəriyəm. Bu etdiyim işlərdə Allaha üsyan etmiş də deyiləm. O, mənim köməkçimdir, deyə cavab verdi. Lakin, Ömərin hüzn və hirsi davam edirdi.

-Sən bizə Kəbəni təvaf edəcəyik, demədinmi? deyə soruşdu. Rəsulullah (s.ə.s):

-Bəli, dedim. Lakin, bu il ziyarət edəcəyimizi söyləmədim, təkrar edirəm, Kəbəni birlikdə təvaf və ziyarət edəcəyik, buyurdu.[288] Razılaşmanın imzalanmasından sonra Rəsulullah (s.ə.s) səhabələrinə:

- Artıq qurbanlarınızı kəsin, sonra təraş olub ehramdan çıxın, əmrini üç dəfə təkrarladığı halda, heç kim yerindən tərpənmədi.[289] Hz Peyğəmbər (s.ə.s), səhabələrinin bu hərəkətinə kədərlənərək, yoldaşı Ümmü Sələmənin yanına getdi. Ümmü Sələmə:

-Ya Rəsulullah, onlar hüznlərindən kədərli görünürlər. Siz kimsəyə heçnə demədən özünüz qurbanınızı kəsin və təraş olun. Onlar sizə tabe olacaqlar, dedi.

Səhabələr, Hz. Peyğəmbərin (s.ə.s) qurbanını kəsib təraş olduğunu

---

288. Hz. Ömər, daha sonra Rəsulullaha (s.ə.s) qarşı hörmətsiz davrandım, deyə bu sözlərindən peşmanlıq hissi keçirmişdir. Buxari, V, 67; Kamil Miras, *e.a.ə.,* X, 267; *Əsr-i Səadət,* I, 427.

289. Rəsulullahın (s.ə.s) əmrini səhabələrin dərhal yerinə yetirməməsi, müxalifət üçün deyildi. Şərtləri ağır olan bu razılaşmanın vəhy ilə qaldırılacağını, beləcə Kəbəni ziyarət edə biləcəklərini ümid edirdilər.

görüncə, dərhal qurbanlarını kəsib, bir-birlərini təraş etməyə başladılar.[290]

**F. Hudeybiyə Müqaviləsinin Bilinməyən Cəhəti**

Hudeybiyə müqaviləsinin bütün şərtləri müsəlmanların əleyhində görünürdü. Lakin, sülhün müsəlmanların faydasına və nəticəsinin lehlərinə olacağını sadəcə Rəsulullah (s.ə.s) bilirdi. Bu səbəblə sülhü təmin etmək üçün, əleyhlərində görünən ən ağır şərtləri qəbul etmişdi.

Rəsulullah (s.ə.s) müqavilənin imzalanmasından üç gün sonra Mədinəyə döndü. Beləcə müsəlmanlar Hudeybiyədə 19-20 gün qalmış oldular.

Dönüşdə yolda "Fəth surəsi" nazil oldu. Cənab- Haqq Hudeybiyə müqaviləsinin müsəlmanlar üçün zillət və məğlubiyyət deyil, əksinə zəfər olduğunu bildirirdi.[291]

Həqiqətən Hudeybiyə müqaviləsi, islamın Mədinə xaricində yayılmasına bir başlanğıc oldu. Məkkəlilər bu müqavilə ilə müsəlmanları bir dövlət olaraq tanımış oldular.

Müqavilədən sonra müsəlmanlarla müşriklər arasında görüşmə və əlaqələr artdı. Hz. Peyğəmbər (s.ə.s), islamı sərbəstcə yaymağa başladı. Hudeybiyə müqaviləsindən Məkkənin fəthinə qədər keçən 21 aylıq dövürdə müsəlman olanların sayı, islamın doğuşundan, Hudeybiyəyə qədər keçən 19 ildə müsəlman olanların sayından qat-qat çox oldu. Xeybərin və Məkkənin fəthi kimi zəfərlər, Hudeybiyədən sonra oldu. Dörd il sonra, Rəsulullahın (s.ə.s) vəfatında islam bütün ərəb yarımadasına yayılmışdı.

Hz. Peyğəmbər (s.ə.s) müqaviləyə bağlı qaldı. Məkkəlilər istəmədikcə, heç bir hökmünü tək tərəfli ortadan qaldırmadı. Qısa bir müddət sonra, Qureyşlə aralarında razılaşma olan Sakif qəbiləsindən Əbu Basar adında biri, Mədinəyə gəlib müsəlmanlara sığındı. Əbu Basar da, Əbu Cəndəl kimi işgəncə görən müsəlmanlardan idi. Məkkəlilər, arxasından dərhal iki adam göndərib Əbu Basarın qaytarılmasını istədilər. Rəsulullah (s.ə.s):

-Ey Əbu Basar, bilirsən ki, biz Qureyşlə bir müqavilə imzaladıq, əhdimizi

290. İslam alimləri bu hadisədən, feli sünnənin, qövlü (şifahi) sünnədən daha qüvvətli olduğu nəticəsinə gəlmişdirlər.
291. Fəth, 48/1.

poza bilmərik. Bir az daha səbr et, Rəbbim yaxında bir qurtuluş yolu açacaq, deyərək Əbu Basarı Qureyşlilərə təslim etdi.

Əbu Basar, Məkkəyə ölümə aparıldığını bilirdi. Bu səbəblə, bu adamların əlindən xilas olması lazım idi. Yolda, Zülhuleyfədə[292] yemək üçün oturdular. Əbu Basar, bunlara saf və səmimi göründü. Bu vaxt:

-Qılıncın nə qədər də gözəldir, baxmağıma icazə verərsənmi? deyərək, birinin əlindən qılıncı götürdü, dərhal üzərinə atılıb onu öldürdü, digəri isə qaçıb xilas oldu.

Əbu Basar, öldürdüyü Qureyşlinin atına mindi, silahına sarıldı, təkrar Mədinəyə döndü. Rəsulullahın (s.ə.s) yanına gedib:

-Ey Allahın Rəsulu, siz sözünüzü yerinə yetirdiniz. Məni onlara təslim etdiniz. Lakin, Allah məni qurtardı, dedi. Hz. Peyğəmbər (s.ə.s) ona razılaşma şərtlərinə görə Mədinədə qalmasının mümkün olmadığını izah etdi. Əbu Basar Mədinədən çıxdı. Məkkəyə dönə bilməzdi. Mədinədə  də qala bilmirdi. Dəniz sahilində, Məkkə-Şam yolu üzərində "İys" deyilən bir yerə yerləşdi. Məkkədə müsəlmanlıqlarını gizləyənlər və işgəncə görənlər, bir-bir qaçıb, Əbu Basarın yanında toplandılar. Əbu Cəndəl də qaçıb bura gəldi. Qısa zamanda sayları 70, daha sonra isə 300-ə çatdı. Məkkəlilərin Şam ticarətini önləyəcək bir qüvvə halına gəldilər.

Əbu Basarın yanında toplananlar, Hudeybiyə razılaşması hökmlərinə bağlı deyildilər. Qureyşin Şam ticarət yolu təhlükəyədəydi və bunun uçün Məkkəlilər təlaşlandılar. Razılaşmanın Mədinəyə sığınan məkkəlilərin geri verilməsiylə əlaqədar maddənin ləğv edilməsindən başqa çarə yox idi. Təzyiq ilə islamın önlənə bilməyəcəyini anladılar. Dərhal, Hz Peyğəmbərə (s.ə.s) Əbu Süfyanı elçi olaraq göndərib, bu maddənin ləğvini və Məkkədən qaçan bütün müsəlmanların Mədinəyə qəbul edilməsini istədilər. Müqavilə bağlanılarkən ən çox israr göstərdikləri bu maddə, yenə onların istəyi  ilə ortadan qaldırılmış oldu.

Peyğəmbər (s.ə.s), Əbu Basar və yoldaşlarını Mədinəyə çağırdı. Bu

292. Zülhuleyfə, Mədinəyə  təxminən 10 km. məsafədə yerləşir. Mədinəlilər və Mədinəyə gedən, həcc və ya ümrə üçün Məkkəyə gedənlər ehrama burada girirlər. İndi bu yerə "Abari-Əli" deyilməkdədir.

əsnada Əbu Basar ölüm yatağında idi. Vəfat edincə orada dəfn etdilər. Yoldaşlarını Əbu Cəndəl yığıb Mədinəyə apardı. Beləliklə, Qureyşin Şam ticarət yolu açıldı. Müsəlmanlar da razılaşmanın ən ağır hökmündən xilas olmuş oldular.

Hudeybiyə müqaviləsi 2 il davam etdi. Razılaşmanı Qureyş pozdu. İki il sonra Məkkə müsəlmanlar tərəfindən fəth edildi. (20 Ramazan 8 h. /11 Yanvar/ 630 m.)

### G. Rəsulullahın (s.ə.s) Ümmü Həbibəylə Evlənməsi

Ümmü Həbibə Əbu Süfyanın qızıdır. Məkkə dövründə müsəlman olmuş və əri Ubeydullah b. Caxşla birlikdə Həbəşistana hicrət edən ikinci qafiləyə qatılmışdı. Hər zaman içki içən əri, Həbəşistanda xristian oldu. Ümmü Həbibə müsəlman qalıb ərindən ayrıldı. Buna görə, yad bir ölkədə kimsəsiz və himayəsiz qaldı. Eyni zamanda müşrik olan atasının yanına da dönə bilməzdi.

Rəsulullah (s.ə.s), hicrətin 6-cı ilində Həbəşistana bir elçi göndərdi. Həbəş Nəcaşisini vəkil edərək Ümmü Həbibəni özünə nikahladı.[293] Nikah mərasimində Cəfəri Tayyar və digər müsəlmanlar da iştirak etdilər. Nikahdan sonra Nəcaşi Ümmü Həbibəni Mədinəyə göndərdi. Bu evlilikdən əvvəl bu ayə enmişdi:

***“ (Ey möminlər!) Ola bilsin ki, Allah sizinlə düşmənçilik etdiyiniz kimsələr (Məkkə müşrikləri) arasında (onları islam dininə gətirməklə) dostluq (məhəbbət) yaratsın. Allah (hər şeyə) qadirdir. Allah bağışlayandır, rəhm edəndir!“*** (Mumtəhinə, 60/7)

Həqiqətən bu evlilikdən sonra Əbu Süfyanın, Hz. Peyğəmbərə (s.ə.s) olan düşmənçiliyində bir yumşalma başlamışdır.

293. İbn Qayyim, *e.a.ə.,* II, 120.

## VI. İSLAMA DƏVƏT ÜÇÜN ELÇİLƏR GÖNDƏRİLMƏSİ

**“(Ey Rəsulum!) De: “Ey insanlar! Mən Allahın sizin hamınıza göndərilmiş peyğəmbəriyəm. (O Allah ki) göylərin və yerin hökmü Onundur, Ondan başqa heç bir tanrı yoxdur. O dirildir və öldürür. Buna görə də Allah, eləcə də Onun Allaha və Allahın sözlərinə (ayələrinə, nazil etdiyi kitablara) inanan və ümmi peyğəmbər olan Rəsuluna iman gətirin və ona tabe olun ki, doğru yolu tapa biləsiniz!”** (Əraf, 7/158)

Hz. Məhəmməd (s.ə.s), daha əvvəlki peyğəmbərlər kimi, yalnız ərəblərin və ya müəyyən bir cəmiyyətin peyğəmbəri deyil, onun peyğəmbərliyi ümumidir. Qiyamətə qədər gələcək bütün insanlara peyğəmbər və aləmlərə rəhmət olmaq üçün göndərilmişdir.[294] Bu səbəblə islamı hər tərəfə yayması, peyğəmbərliyini bütün dünyaya eşitdirməsi lazım idi. Lakin. indiyə qədər Məkkə müşrikləri buna imkan verməmişdilər.

Hudeybiyə müqaviləsi ilə iki tərəf arasında barış və təhlükəsizlik təmin edildi. Artıq islamın yayılması üçün hər kəsə və hər tərəfə eşitdirmə zamanı gəlmişdi. Rəsulullah (s.ə.s) Hudeybiyədən dönüncə bu mövzunu səhabələriylə müzakirə etdi. Böyük və qonşu dövlətlərin hökmdarlarıyla bəzi ərəb qəbilələrinə məktub və elçi göndərilməsi qərarlaşdırıldı. Qaşında “Məhəmməd Rəsulullah” yazılı gümüş bir üzük hazırlandı və məktublar bununla möhürlənildi.[295]

### A. Elçilər və Göndərildikləri Hökmdarlar

Bizans Qeysəri Hirakliyusa Dihyətül-Kəlbi, İran Kisrası Xosrov Pərvizə Abdullah b.Huzafə, Həbəşistan Nəcaşisi Əshaməyə  Əmr b. Ümeyyə, Misir

294. Ənbiya, 21/107; Səbə, 34/28; Əraf, 7/158; *“Məndən əvvəlki peyğəmbərlər yalnız öz millətlərinə göndərilmişdi. Mən isə bütün insanlara, peyğəmbər olaraq göndərildim”*. Buxari, I, 86 və I, 113; Kamil Miras, *e.a.ə.,* II, 204 (Hədis No: 223).
295. Buxari, I, 24; Kamil Miras, *e.a.ə.,* I, 62 (Hədis No: 59) Bu üzük, Rəsulullahın (s.ə.s) vəfatından sonra, xəlifəlikləri dövründə Hz. Əbu Bəkir, Hz. Ömər və Hz. Osman tərəfindən istifadə edildi. Hz. Osmanın barmağından Mədinədə Eris quyusuna düşdü. Quyunun suyu tamamilə boşaldıldığı halda tapılmadı. Bax: Abdurrahman Şərəf, *Zubdetu’l-Kısas*, I, 153, İstanbul 1315.

(İskəndəriyyə) Mukavkısı Cüreycə Xətib b.Əbu Bəldə, Qassan Əmiri Haris b. Əbi Şummerə Şuca b.Vəhb, Yəmamə Əmiri Həvzə b. Əliyə də Salit b. Əmr elçi olaraq məktub apardılar.[296]

**B. Hz. Peyğəmbərin (s.ə.s) Hökmdarlara Yazdırdığı Məktublar**

**1. Bizans Qeysərinə Göndərilən Məktub**

*"Bismillahir-rahmanir-rahim... Allahın qulu və Rəsulu Məhəmməddən (s.ə.s), Rumun böyüyü Herakla : Hidayət yoluna uyanlara salam olsun. Bundan sonra mən səni islama və onu yayma xidmətinə dəvət edirəm. Müsəlman ol ki, salamatlığa çatasan. Allah da sənə əcrini iki qat versin. Əgər qəbul etməzsənsə, xalqının vəbalı sənin boynundadır."*[297]

"**(Ya Rəsulum!) Söylə: "Ey kitab əhli, sizinlə bizim aramızda eyni olan (fərqi olmayan) bir kəlməyə tərəf gəlin! (O kəlmə budur:) "Allahdan başqasına ibadət etməyək. Ona şərik qoşmayaq və Allahı qoyub bir-birimizi (özümüzə) Rəbb qəbul etməyək!" Əgər onlar yenə də üz döndərərlərsə, o zaman (onlara) deyin: "İndi şahid olun ki, biz, həqiqətən, müsəlmanlarıq (Allaha təslim olanlarıq)!"** (Ali-İmran, 3/64)

Dihyə, Rəsulullahın (s.ə.s) məktubunu Herakla apardığı zaman Herakl Qüdsdə olurdu. Elçini yaxşı qarşıladı. Rəsulullah (s.ə.s) haqqında məlumat əldə etmək üçün, bölgədə olan ərəb tacirlərinin hüzuruna gətirilməsini əmr etdi.

Məkkədən bir ticarət karvanı o əsnada bu bölgədə idi. Karvanda Qureyşin rəisi Əbu Süfyan da var idi. Əbu Süfyan və yoldaşları gətirildiyində, Bizansın rəhbər din və dövlət adamları, yepiskoplar, keşişlər İmperator Heraklın ətrafında toplanmışdır. Qeysər tərcüməçi vasitəsiylə:

-Peyğəmbərlik iddiasında olan bu şəxsə, içinizdə soy baxımından ən yaxın olan kimdir? deyə soruşdu. Əbu Süfyan:

---

296. İbn Qayyim, *e.a.ə.,* I, 60–63; (O dövrdə Bizans İmparatorlarına "Qeysər", İran Şahənşahlarına "Kisra", Həbəş krallarına "Nəcaşi", Misir Məliklərinə "Mukavkıs", Türk hökmdarlarına da "Hakan" deyilirdi.).
297. Buxari, I, 6; M. Həmidullah, *əl-Vəsaiku's-Siyasiyyə,* s. 109, Beyrut, 1405/1985 ; Kamil Miras, *e.a.ə.,* I, 16 (Hədis No: 7) və XII, 414; İbn Qayyim, *e.a.ə.,* III, 126.

-Burada nəsəbcə ona ən yaxın mənəm, deyə irəlilədi. Qeysər, Əbu Süfyanı yoldaşlarının önünə oturtdu. Suallarıma doğru cavab verməzsə, siz düzəldin, dedi. Sonra İmperator ilə Əbu Süfyan arasında bu dialoq keçdi:

-İçinizdə Məhəmmədin (s.ə.s) soyu necədir?

-Zadəgan bir soydandır.

-Məmləkətinizdə ondan əvvəl peyğəmbərlik iddiasında olan oldumu?

-Xeyr.

-Sülaləsində hökmdar varmı?

-Xeyr.

-Onun dininə girənlər xalqın əşrafımı, zəiflərimi?

-Əksəriyyətlə kasıb və zəiflərdir.

-Ona tabe olanlar gün keçdikcə çoxalırmı, azalırmı?

-Çoxalır.

-Dininə girdikdən sonra, bəyənməyib ayrılanlar oldumu?

-Olmadı.

-Daha əvvəl yalan danışdığı oldumu?

-Əsla olmadı.

-Heç sözündə durmadığı oldumu?

-Olmadı, ancaq indi biz onunla sülh imzaladıq. Bu müddət içində necə davranacağını bilmirik.

-Onunla heç döyüşdünüzmü?

-Bəli döyüşdük.

-Nəticə nə oldu ?

-Bəzən biz, bəzən O qazandı.

-Sizə nə əmr edir?

-Tək Allaha qulluq edin, ona heç bir şeyi ortaq qoşmayın, babalarınızın

sitayiş etdiyi bütləri buraxın, deyir. Namaz qılmağı, doğru və iffətli olmağı, qohumluq bağını kəsməməyi əmr edir.

Bundan sonra imperator sözlərinə belə davam etdi:

Nəsəbcə zadəgan olduğunu söylədiniz. Peyğəmbərlər daim zadəgan soydan gəlmişdir. İçinizdən daha əvvəl belə bir iddiada olan olmadığını izah etdiniz. O halda köhnə bir iddianın arxasında bir adam sayıla bilməz. Soyunda hökmdar yoxdur, dediniz. Bu vəziyyətdə sərvət və səltənət arxasında olduğu da deyilə bilməz. Daha əvvəl qətiliklə yalan danışmadığına şahidlik edirsiniz. İnsanlara yalan danışmayan Allaha qarşısında da yalan danışmaz. Ona iman edənlərin əksəriyyətlə kasıb və zəiflər olduğunu ifadə etdiniz. Peyğəmbərlərə ilk inananlar daim belə kəslər olmuşdur. Ona inananların gün keçdikcə artdığını söylədiniz. Haqqa uyanlar azalmaz, daim çoxalır. Dininə girdikdən sonra dönən heç yoxdur, dediniz. İman ürəkdə kökləşincə çıxmaz. Sözündə durduğunu, kimsəni aldatmadığını etiraf etdiniz. Peyğəmbərlər kimsəni aldatmaz. Sizi ancaq Allaha qulluq etməyə, ona heç bir şeyi ortaq qoşmamağa dəvət etdiyini açıqladınız. Əgər bu söylədikləriniz doğru isə, ayaqlarımın basdığı bu torpaqlar, yaxında onun olacaq. Mən bir peyğəmbər gələcəyini bilirdim amma, sizdən çıxacağını sanmazdım. Əgər ona çata biləcəyimi bilsəm, hər zəhmətə dözərdim. Yanında olsam, ayaqlarını yuyar, xidmət edərdim. dedi. Sonra məktubu oxutdu.

İmperatorun Əbu Süfyanla etdiyi dialoq, keşişləri hirsləndirmişdi. Məktub oxununca salonda səs-küy çoxaldı. İmperator işin pisə getməsindən qorxdu. Elçinin və ərəb tacirlərin çıxmalarını istədi. Mən sizin dininizə bağlılığınızın dərəcəsini anlamaq istəmişdim, deyərək sözünü dəyişdirdi.[298]

Qeysər Heraklın ürəyində iman qığılcımı meydana çıxmışdı. Dünya ehtirası və səltənətini itirmə qorxusu, bu qığılcımı söndürdü. Lakin, elçiyə hörmətsiz davranmadı, hədiyyələr verərək nəzakətlə geri göndərdi.

### 2. İran Kisrasına Göndərilən Məktub

*"Bismillahir-rahmanir-rahim. Allahın qulu və Peyğəmbəri Məhəmməddən (s.ə.s) Farsın lideri Kisraya: Hidayətə uyanlara, Allah və Rəsuluna iman*

---

298. Buxari, I, 5-7; Kamil Miras, *e.a.ə.,* I, 14-23 (Hədis No: 7).

*edənlərə, Allahdan başqa heç bir ilah olmayıb onun tək olduğuna, ortağı və bənzəri olmadığına, Məhəmmədin (s.ə.s) onun qulu və rəsulu olduğuna şahidlik edənlərə salam olsun. Ey Kisra! Səni Allahın dininə dəvət edirəm. Çünki mən, diriləri (Allahın əzabıyla) xəbərdar etmək, kafirlər üzərinə o söz (əzab) haqq olmaq üçün, bütün insanlığa Peyğəmbər göndərildim. Ey Kisra! Müsəlman ol ki, salamatlıq tapasan. Əgər olmazsansa, atəşpərəstlərin günahı boynuna olsun."*[299]

Rəsulullah (s.ə.s), məktubun Kisraya verilməsi üçün, Bəhreyn əmiri Münzirə təslimini əmr etmişdi. Bəhreyn, o zaman İrana bağlı idi. Münzir məktubu Kisraya apardı. Kisra məktubu oxuyunca cırıb parçaladı. Rəsulullah (s.ə.s) bundan xəbərdar olunca:

-Parça-parça olsunlar, buyurdu.[300]

Çox keçmədən Kisra Xosrov Pərviz, oğlu Şirvəhy tərəfindən qarnı deşilərək öldürüldü. Hz. Ömərin xəlifəliyi əsnasında da Kisranın imperatorluğu parçalandı, Sasani sülaləsi sona çatdı. Bütün İran torpaqları müsəlmanların əlinə keçdi.

### 3. Həbəşistan Nəcaşisinə Göndərilən Məktub

*"Bismillahir-rahmanir-rahim. Allahın Rəsulu Məhəmməddən (s.ə.s) Həbəş məliki Nəcaşiyə: Ey Məlik, müsəlman ol. Mən, özündən başqa ilah olmayan, Məlik, Quddus, Salam, Mömin, Mühəymin (kimi uca sifətlərlə sahib) Allahın sənə olan nemətlərindən ötrü şadam, sənin adına həmd edirəm.*

*Şahidlik edirəm ki, Məryəmin oğlu İsa, Allahın ruhu və sözüdür. Onu heç evlənməmiş, tərtəmiz və çox iffətli bir xanım olan Məryəmə verdi. Beləcə Məryəm İsaya hamilə oldu. Adəmi (anasız-atasız) qüdrətiylə yaratdığı kimi, İsanı da (atasız) olaraq ruhundan və nəfsindən yaratdı.*

*Ey Məlik! Səni ortağı və bənzəri olmayan tək olan Allaha itaətə, mənə*

299. İbn Qayyim, *e.a.ə.,* III, 127; M. Həmidullah, *əl-Vəsaik*, 140; Kamil Miras, *e.a.ə.,* XII, 416; İbnül-Əsir, *e.a.ə.,* II, 213.
300. Buxari, I, 23, III, 225 və V, 136; Kamil Miras, *e.a.ə.,* I, 61-63 (Hədis No: 58) və X, 487 və XII, 417.

*uymağa və mənə Allahdan gələnə imana dəvət edirəm. Çünki mən Allahın Peyğəmbəriyəm. Səni və xidmətində olanları Allahın dininə çağırıram. Mən sizə təbliğ və nəsihət verdim. Nəsihətimi qəbul edin. Salam hidayətə uyanlara olsun"* [301]

Həbəşistana hicrət etmiş olan müsəlmanlardan bir qrup ilə, Hz. Əlinin böyük qardaşı Cəfər Tayyar hələ dönməmişdilər. Rəsulullah (s.ə.s) elçisi vasitəsiylə bunların göndərilməsini və Ümmü Həbibənin də özünə nikahlayaraq, könülünün xoş edilməsini istəmişdi.

Nəcaşi, Ümmü Həbibəni Rəsulullaha (s.ə.s) nikahladı. Həbəşistanda olan müsəlman mühacirləri gəmiyə mindirib göndərdi. Rəsuli-Əkrəmə bir məktub yazaraq müsəlman olduğunu da bildiridi.

Rəsulullaha (s.ə.s) Həbəş Nəcaşisinin Məktubu:

"Bismillahir-rahmanir-rahim, Allahın Rəsulu Məhəmmədə (s.ə.s) Nəcaşi Əshamə tərəfindən: Ey Allahın Peyğəmbəri, özündən başqa ilah olmayan Allahın salamı, rəhmət və bərəkəti üzərinə olsun.

Ey Allahın Rəsulu, Hz. İsa haqqındakı şərhvari məktubunuz mənə çatdı. Göylərin və yerin Rəbbi olan Allaha and içirəm ki, Hz. İsa da, özüylə əlaqədar olaraq, zikr etdiyinizdən artıq bir şey söyləməmişdir. Onun söylədikləri də, sizin buyurduğunuz kimidir. Bizə təbliğ etdiyiniz şeyləri öyrəndik. Əminiz oğlu (Cəfər) və yoldaşlarıyla tanış olduq. Mən şahidlik edirəm ki sən, Allahın keçmiş peyğəmbərlərini təsdiq edən, sözündə sadiq rəsulusan. Sənə beyət etdim, (daha əvvəl) əminiz oğluna beyət edərək, aləmlərin Rəbbi Allah təalaya iman edib müsəlman olmuşdum.[302]

### 4. Misir Məliki Mukavkısa Göndərilən Məktub

*"Bismillahir-rahmanir-rahim. Allahın qulu və rəsulu Məhəmməddən (s.ə.s) Qıbt millətinin böyüyü Mukavkısa: Salam hidayət yoluna uyanlara.*

---

301. İbn Qayyim, *e.a.ə.,* III, 127; M. Həmidullah, *əl-Vəsaik,* 100; Kamil Miras, *e.a.ə.,* XII, 418-419.
302. İbn Qayyim, *e.a.ə.,* III, 128; M. Həmidullah, *əl-Vəsaik*, 104; Kamil Miras, *e.a.ə.,* XII, 420.

*Mən, səni islam dininə dəvət edirəm. Müsəlman ol ki, salamatlığa çatasan, Allah da əcrini iki qat versin. Qəbul etməz, üz çevirsən, Qıbt millətinin günahı boynuna olsun. Məktub, Ali-İmran surəsinin 64-cü*[303] *ayəsiylə sona çatmaqdadır."*[304] Misir Mukavkısı Cüreyc, Rəsulullahın (s.ə.s) elçisinə hörmət göstərdi, lakin müsəlman olmadı. Elçiyə bir məktub verərək, hədiyyələrlə geri göndərdi.

Rəsulullaha (s.ə.s) Misir Mukavkısının məktubu:

"Bismillahirr-rahmanir-rahim. Abdullah oğlu Məhəmmədə (s.ə.s), Qıbtın böyüyü Mukavkısdan: Salam sənə. Məktubunu oxudum. İçindəkiləri və dəvətinizi anladım. Zühuru gözlənilən bir Peyğəmbər olduğunu bilirəm. Lakin, mən onun Şamdan çıxacağını sanırdım. Elçinizə ikram etdim. Sizə Qıbt milləti arasında mövqeyi yüksək iki xidmətçi, bir paltar və minməyiniz üçün də bir minik heyvanı hədiyyə göndərirəm. Salam sənə möhtərəm Peyğəmbər."[305]

Bu xidmətçilərdən Mariyəni Rəsulullah (s.ə.s) özü götürdü. İbrahim adındakı oğlu bundan oldu. Bacısı Şirini isə, şairi Hassan b. Sabitə verdi. Düldül adı verilən ağ əstərə də mindi.

### 5. Yəmamə Əmiri Həvzəyə Göndərilən Məktub

*"Bismillahir-rahmanir-rahim. Allahın Rəsulu Məhəmmədən (s.ə.s) Həvzə b. Əliyə: Salam hidayət yolunda olanlara. Bil ki, Rəbbim mənim dinimi yaxın bir zamanda dünyanın ən uzaq üfüqlərində parladacaq. Ey Həvzə, müsəlman ol ki, salamatlığa çatasan. Mən də idarən altındakı yerləri, sənin idarəndə buraxım."*[306]

---

303. **(Ey Rəsulum!) De: Ey kitab əhli,sizinlə bizim aramızda (mənası) eyni olan bir kəlməyə tərəf gəlin-"Allahdan başqasına ibadət etməyək. Ona şərik qoşmayaq və Allahı qoyub bir-birimizi (özümüzə) Rəbb qəbul etməyək! Əgər onlar yenə də üz döndərərlərsə, o zaman (onlara) deyin. "İndi şahid olun ki, biz, həqiqətən, müsəlmanlarıq. (Allaha təslim olanlarıq)!**

304. İbn Qayyim, *e.a.ə.,* III, 128; M. Həmidullah, *əl-Vəsaik*, 135; Kamil Miras, *e.a.ə.,* XII, 422.

305. İbn Qayyim, *e.a.ə.,* III, 129; M. Həmidullah, *əl-Vəsaik*, 136; Kamil Miras, *e.a.ə.,* XII, 424.

306. İbn Qayyim, *e.a.ə.,* III, 132-133; M. Həmidullah, *əl-Vəsaik*, 156; Kamil Miras, *e.a.ə.,* XII, 425.

Xristian olan Həvzə, müsəlman olmadı. Rəsulullaha (s.ə.s) yazdığı cavabda:

-Məni dəvət etdiyin din çox gözəldir. Ancaq ərəblər mənim yerimə göz qoyublar. Məni vəliəhd etsən, sənə tabe olaram, dedi. Rəsullullaha (s.ə.s) Həvzənin cavabı oxununca: -Bu adam nə söyləyir? Bu şərtlə ona bir qarış yerin idarəsini belə verməräm, buyurdu.[307] Həvzə, Məkkənin fəthindən sonra öldü. Çox keçmədən bu bölgə müsəlman oldu.

### 6. Qassan Əmiri Harisə Göndərilən Məktub

*"Bismillahir-rahmanir-rahim. Allahın Rəsulu Məhəmməddən (s.ə.s) Haris b. Əbu Şəmmərə: Salam hidayətə çatan, mənə iman edib Peyğəmbərliyimi təsdiq edənlər üzərinə olsun. Səni, ortağı və bənzəri olmayan tək bir Allaha iman etməyə dəvət edirəm. Qəbul etdiyin təqdirdə, yerində hökmdar olaraq qalacaqsan."*[308]

Haris, Rəsulullahın (s.ə.s) məktubunu həyasızca yerə atdı. Elçiyə hörmətsiz davrandı. Hətda, Bizans İmperatorundan Mədinə üzərinə ordu göndərilməsini istəmiş, lakin Qeysər rədd etmişdi. Elçi Şuca, Harisin davranışını ərz edincə Rəsuli-Əkrəm (s.ə.s):

-Allah mülkünü əlindən alsın, buyurdu.

Haris, Məkkənin fəthi əsnasında öldü. Ölkəsi Hz. Ömərin xəlifəliyi əsnasında islam sərhədləri içinə daxil edildi.

## C. Xeybərin Fəthi (Məhərrəm 7 h./May 628 m.)

### 1. Döyüşün Səbəbi

Xeybər, Mədinənin şimal-şərqində, Suriya yolu üzərində, Mədinəyə 170 km. məsafədə böyük bir yəhudi şəhəri idi. Yeddi qalası vardı. Xurmalıqlarıyla məşhur, münbit bir sahədə qurulmuşdu.

307. İbn Qayyim, *e.a.ə.,* III, 133; Kamil Miras, *e.a.ə.,* XII, 426.
308. İbn Qayyim, *e.a.ə.,* III, 133–134; M. Həmidullah, *əl-Vəsaik*, 126; Kamil Miras, *e.a.ə.,* XII, 427.

Xeybər, müsəlmanlara qarşı bir fəsad ocağı halına gəlmişdi. Daha əvvəl Mədinədən çıxarılmış olan yəhudilər də oraya yerləşmişdilər. Müsəlmanlara qarşı müşrik bədəvi ərəbləri hərəkətə keçirən, Xəndək döyüşünü hazırlayan bunlar idi. Xəndək döyüşündə, Bəni Kurayza yəhudilərinə düşmənlə əməkdaşlıq etdirənlər də bunlar olmuşdu.

Rəsulullah (s.ə.s), Xeybər əhalisiylə sülh bağlamaq istəyirdi. Hudeybiyədən döndükdən sonra, Abdullah b. Rəvahanı Xeybərə göndərdi. Lakin, yəhudilər barış təklifini qəbul etmədilər. Onlar, qonşuları Qətəfan qəbiləsiylə birlikdə Mədinəyə hücum etmək üçün hazırlanırdılar. Hudeybiyə sülh razılaşmasının, müsəlmanların əleyhinə görünən maddələri, onlara müsəlmanları qüvvətsiz göstərmişdi. Münafiqlər də onları döyüşə təşviq edirdilər.

Qətəfan qəbiləsi müsəlmanlara qarşı yəhudilərlə birlikdə hərəkət etməyi qəbul etmişdi. Düşmən hazırlığını tamamlamadan hərəkətə keçmək lazım idi. Rəsulullah (s.ə.s) səhabələrinə:

-"Cihadı istəyənlər bizimlə gəlsin" deyərək Xeybər üzərinə gediləcəyini elan etdi. Hicrətin 7-ci ili Məhərrəm ayında 2000 atlı və 1600 piyada ilə Mədinədən çıxdılar. Çıxdıqlarını düşmənə bildirmədən, üç gündə Raci Vadisinə çatdılar.[309] Burada ordugahını qurdular. Beləcə Qətəfan qəbiləsindən yəhudilərə gələcək köməyin yolunu kəsmiş oldular.

### 2. Xeybərin Mühasirəsi

Rəsulullah (s.ə.s), düşmən üzərinə gecə vaxtı çatsa belə, dərhal hücüm etməz, səhəri gözləyərdi.[310] Bu səbəblə gecəni Racidə keçirdi. Səhər namazını qıldıqdan sonra Xeybər üzərinə yeridi.

Səhər, külüng və kürəkləriylə işlərinə getmək üçün evlərindən çıxan yəhudilər, qarşılarında islam ordusunu görüncə həyəcanla:

309. Yolda gedərkən, səhabələr yüksək səslə təkbir gətirirdilər. Rəsulullah (s.ə.s): *"Özünüzə zülm etməyin, siz nə kara, nə də qeybə səslənirsiniz, sizi yaxşı eşidən və çox yaxın olan Allaha dua edirsiniz. O hər vaxt sizinlə bərabərdir*" buyurmuşdur. Bax: Buxari, V, 75; Kamil Miras, *e.a.ə.,* X, 285 (Hədis No: 1608).
310. Buxari, V, 73.

-Məhəmməd, vallah Məhəmməd və ordusu... deyə bağrışdılar,[311] geri dönüb qalalarına sığındılar.

Xeybərdə, çox möhkəm 7 qala vardı. Ən qüvvətlisi isə Kamus qalası idi. Hamısında da xeyli miqdarda silah və bol yemək vardı. Yəhudilər döyüş üçün hazırlıqlı idilər. Buna görə Rəsulullahın (s.ə.s) sülh təklifini qəbul etmədilər.

**3. Son Qala və Fəthin Tamamlanması**

İyirmi günə qədər davam edən mühasirə və döyüş nəticəsində, bütün qalalar bir-bir fəth edildi. Yalnız Kamus qalası qaldı. Bu qalanın komandirliyində, ərəblər tərəfindən min cəngavərə əvəz sayılan məşhur yəhudi pəhləvanı Mərhab var idi. Hər gün sıra ilə səhabələrin böyüklərinin əmrində edilən hücumlardan bir nəticə alına bilməmişdi. Nəhayət Rəsulullah (s.ə.s) bir gün:

*-Sabah bayrağı elə bir şəxsə verəcəyəm ki, Allah Xeybərin fəthini onun əliylə müyəssər edəcək. O şəxs Allah və Rəsulunu sevir, Allah və Rəsulu da onu sevir, buyurdu. Bu uca şərəfin kimə nəsib olacağı bilinmədiyindən, hər kəs o gecə ümidlə səhərləmişdi. Hz. Əlinin gözlərində şiddətli bir ağrı var idi. Buna görə heç kimin ağlından o keçmirdi. Səhər olunca Hz. Peyğəmbər (s.ə.s):*

*-Əli haradadır? Mənə onu çağırın, buyurdu.*

*-Ya Rəsulullah, gözləri ağrıyır, dedilər və onu peyğəmbərin yanına gətirdilər.*

*Rəsuli-Əkrəm (s.ə.s) dua edib üflədi. Hz. Əlinin gözləri yaxşılaşdı, sanki heç ağrımamış kimi oldu. Sonra bayrağı ona verdi.*[312]

Hz. Əli, yəhudiləri əvvəl islama dəvət etdi. Qəbul etmədilər. Sülh təklifinə də yanaşmayıb, döyüşə davam etdilər.

Əvvəlcə Mərhab qaladan çıxdı. Qəhrəmanlıq şeirləri söyləyərək meydan oxudu. Qarşısına çıxacaq ər istədi. Ona qarşı şəxsən Hz. Əli çıxdı və müsəlmanlar tərəfindən döyüşərək bu güclü yəhudi pəhləvanını yerə sərdi. Mərhab öldürülüncə, yəhudilər çox müqavimət göstərə bilmədilər. Ümidsizliyə düşüb qalanı təslim etdilər. Beləliklə Xeybər fəth edildi. Hz. Əli

311. Buxari, V, 73; Müslim, II, 1044 (Hədis No: 1428).
312. Buxari, V, 76; Kamil Miras, *e.a.ə.,* X, 302-303 (Hədis No: 1617 və şərhi).

də Xeybər Fatehi oldu. Döyüş əsnasında yəhudilərdən 93 adam öldürülmüş, müsəlmanlar isə 15 şəhid vermişdilər.

### 4. Xeybər Ərazisi

Döyüş nəticəsində Xeybər ərazisi, müsəlmanların əlinə keçdi. Ancaq yəhudilər, bu torpaqlarda işçi olaraq işləmək istədilər. İstəkləri qəbul edildi. Bu səbəblə Rəsulullah (s.ə.s) hər il məhsul zamanı Abdullah b. Rəvahanı Xeybərə göndərərdi. Abdullah da məhsulu iki bərabər hissəyə bölər, yarısını yəhudilərə verər, digər yarısını da Mədinəyə apparardı.

Yəhudilər, Hz. Ömərin xilafəti zamanına qədər yerlərində qaldılar. Hz. Ömərin xilafətində, ərəbistan xaricinə çıxarıldılar.

### 5. Hz. Peyğəmbəri (s.ə.s) Zəhərləmə Təşəbbüsü

Hz. Peyğəmbər (s.ə.s), fəthdən sonra Xeybərdə bir neçə gün qaldı. Yəhudilər gördükləri insani rəftara baxmayaraq, xaincə davranışlarından imtina etmədilər. Rəsulullaha (s.ə.s) sui-qəsd etməyi planladılar.

Yəhudi rəislərindən Zeynəb bint Haris, bir ziyafət hazırladı. Rəsulullahı da (s.ə.s) bəzi yoldaşlarıyla birlikdə yeməyə dəvət etdi. Lakin, süfrəyə qoyulan qoyun əti zəhərli idi.

Hz. Peyğəmbər (s.ə.s) vəziyyəti ilk loxmada anladı, çeynədiyi tikəni ağzından çıxardı və səhabələrinə də yeməmələrini əmr etdi. Lakin, Bişr b.Bəra bir neçə loxma yemişdi. Rəsulullah (s.ə.s) bunu nə üçün etdiklərini yəhudilərə soruşduğunda:

-Əgər yalançı isən, səndən xilas olarıq, əgər Haqq Peyğəmbər isən, sənə zərər verməz düşündük  deyə, guya ağıllıca bir cavab verdilər.[313]

Zeynəb də günahını inkar etmədi.

-Atam, əmim, ərim və qardaşlarım, hamısı döyüşdə öldülər. İntiqam üçün etdim, dedi. Rəsulullah (s.ə.s) şəxsinə qarşı edilən pislikləri bağışlayardı. Bu

313. Buxari, IV,  66; Kamil Miras, *e.a.ə.,* VIII, 531 (Hədis No: 1310).

səbəblə Zeynəbi cəzalandırmadı. Ancaq çox keçmədən zəhərli ətdən yeyən Bişr ölüncə, Zeynəb də qisas qarşılığı olaraq öldürülmüşdür.[314]

### 6. Rəsulullahın (s.ə.s) Hz. Safiyyə ilə Evlənməsi

Xeybər əsirləri arasında, Bəni Nadir rəisi Huyey b. Ahtabın qızı Safiyyə də var idi. Safiyyə Hz. Harunun nəslindən olub, anası da Bəni Kurayza rəisinin qızı idi. Xeybər yəhudilərinin rəisi Kinanə b. Rəbi ilə evlənmişdi. Əri döyüşdə ölmüş, özü isə əsir düşmüşdü. Rəsuli-Əkrəm (s.ə.s) onu Dihyətül-Kəlbiyə vermişdi. Səhabələr bunu uyğun görmədilər:

-Xeybər rəisinin yoldaşı Bəni Kurayza və Bəni Nadirin ən şərəfli xanımının xidmətçi olaraq Dihyəyə verilməsi, yəhudilər üçün son dərəcə təhqiredici olar. Bu səbəblə Safiyyəni ancaq sizin nikahlamanız uyğun olar, dedilər.

Rəsulullah (s.ə.s) Dihyəyə başqa bir xidmətçi verdi. Safiyyəni azad etdi və onunla evləndi.[315] Beləcə onun şərəf və ləyaqətini qorudu.

### Ç. Fədək və Vadil-Kuranın Alınması

Fədək, Mədinəyə iki günlük məsafədə, axar suları və xurmalıqları bol, zəngin bir yəhudi kəndi idi. Rəsulullah (s.ə.s) Xeybərin mühasirəsinə davam edərkən, Fədəkliləri islama dəvət etmək üçün bir elçi göndərdi. Fədəklilər, islamı qəbul etmədilər. Torpaqlarımız sizin olsun, biz burada Xeybərlilər kimi işçi olaraq işləyək dedilər. İstəkləri qəbul edildi.

Vadil-Kura isə, Xeybərlə Mədinə arasında bir çox yəhudi kəndinin olduğu bir vadi idi. Buradakı yəhudilər də ətrafdakı ərəb qəbilələriylə razılaşaraq, müsəlmanlarla döyüş üçün hazırlanırdılar. Rəsulullah (s.ə.s)

Xeybərdən dönərkən bura baş çəkərək onları da islama dəvət etdi. Lakin, qəbul etmədilər, əksinə müsəlmanlara ox yağdıraraq döyüşü başlatdılar. Dörd gün davam edən vuruşma nəticəsində məğlub oldular. Xeybərlilər kimi, əldə edəcəkləri məhsulun yarısı özlərinin olması şərtiylə, yerlərində qaldılar.

---

314. Kamil Miras, *e.a.ə.,* VIII, 534; İbnu'l-Əsir, *e.a.ə.,* II, 219-220.
315. Buxari, I, 98 və II, 1044; Kamil Miras, *e.a.ə.,* II, 248–257 (Hədis No: 241) və X, 272 (Hədis No: 1612 və şərhi). Müslim, II, 1044.

Davamlı müsəlmanlara düşmənlik bəsləyən yəhudilərin işi beləcə tamamlanmış oldu. Müsəlmanlar Səfər ayında Mədinəyə döndülər.

**D. Ələ Keçirilən Ərazi**

Müsəlmanların, düşməndən (kafirlərdən) döyüşərək götürdükləri mallara "qənimət" deyilir. Qənimət mallarının beşdə dördü döyüşə qatılan mücahidlərə paylaşdırılır, beşdə biri isə beytül-mala (dövlət xəzinəsinə) verilirdi. **"(Ey möminlər!) Əgər siz Allaha və haqla batilin ayırd edildiyi gün - iki dəstənin bir-birilə qarşılaşdığı gün (Bədr günü) bəndəmizə (Muhəmmədə) nazil etdiyimizə (ayələrə) iman gətirmisinizsə, bilin ki, ələ keçirdiyiniz hər hansı qənimətin beşdə biri Allahın, Peyğəmbərin, onun qohum-əqrəbasının, yetimlərin, yoxsulların və müsafirlərindir (pulu qurtarıb yolda qalan yolçularındır). Allah hər şeyə qadirdir!"** (Ənfal, 8 41). Düşməndən (kafirlərdən) döyüşmədən sülh və razılaşma yolu ilə əldə edilən mallara isə "fey" adı verilir. Feyin hamısı beytül-mala aiddir. **"(Ey möminlər!) Allahın onların (Bəni Nəzər qəbiləsinin) mallarından Öz Peyğəmbərinə verdiyi qənimət üçün siz onların üstünə nə at, nə də dəvə sürdünüz. Lakin Allah Öz peyğəmbərini istədiyi kimsələr üzərində hakim edər. Allah hər şeyə qadirdir! Allah Öz Peyğəmbərinə (fəth olunmuş) məmləkətlərin əhalisindən (dinc yolla) verdiyi qənimət Allaha, Peyğəmbərə, (Muhəmməd əleyhissəlama yaxın olan) qohum-əqrabaya, yetimlərə, yoxsullara və (pulu qurtarıb yolda qalan) müsafirə (yolçulara) məxsusdur. Bu ona görədir ki, (həmin mal-dövlət) içərinizdəki zənginlər arasında əldən-ələ dolaşan bir sərvət olmasın (ondan yoxsullar da faydalansın). Peyğəmbər sizə nə verirsə, onu götürün; nəyi qadağan edirsə, ondan əl çəkin. Allahdan qorxun. Həqiqətən, Allahın cəzası çox şiddətlidir."** (Həşr, 59/6-7). Rəsulullah (s.ə.s) həyatda ikən, Beytül-mala aid malların nəzarəti ona aid idi.

Bu səbəblə döyüşsüz ələ keçirilən Fədək ərazisinin hamısı ilə Xeybər və Vadil-Kura torpaqlarının beşdə biri Rəsulullahın (s.ə.s) əmrinə verildi. Bəni Nadir ərazisi də, daha əvvəl belə olmuşdu.[316] Xeybər və Vadil-Kuranın qalan ərazisi isə mücahidlərə verildi.

316. Kamil Miras, *e.a.ə.,* X, 306 və XI, 412-413, VIII, 273 (Hədis No: 1173).

### E. Həbəşistana Hicrət Edənlərin Dönüşü

Həbəşistana hicrət etmiş olan müsəlmanlardan 16 nəfərlik son qafilə də, Xeybərin fəthi əsnasında döndü.[317] Başlarında Hz. Əlinin qardaşı Cəfəri Tayyar var idi. Rəsulullah (s.ə.s) son dərəcə məmnun oldu.

-Hansına sevinəcəyimi bilmirəm, Xeybərin fəthinəmi, yoxsa Cəfərin gəlişinəmi? buyurdu.[318] Qənimətlərdən onlara da hissə ayırdı.[319]

### Ə. Kəbəni Ziyarət (Umrətül-Qəza) (Zilqədə 7 h./Mart 629 m.)

**“Allahdan ötrü həcc və ümrə (kiçik həcc) əməllərini tam yerinə yetirin, əgər arada sizə maneçilik olarsa, (sizə) müyəssər olan bir qurbanlıq göndərin, qurbanlıq öz yerinə (Minaya) çatıncaya qədər başınızı qırxdırmayın. Əgər (ihramda ikən, ziyarət zamanı) sizdən xəstələnən və yaxud baş ağrısına tutulub əziyyət çəkən olarsa, belə şəxs (başını qırxdırmağın əvəzində) fidyə olaraq (üç gün) oruc tutmalı və ya sədəqə verməli, yaxud da bir qurban kəsməlidir. (Maneçiliyin aradan qalxmasına) əmin olduqda isə həcc vaxtına qədər ümrə ziyarətindən istifadə edən şəxs müyəssər etdiyi bir heyvan kəsməlidir. Qurbanlıq tapmayanlar bunun əvəzində həcc ziyarəti günlərində üç gün və (vətəninə) qayıdandan sonra yeddi gün oruc tutmalıdırlar ki, bu da tam on gün edir. Bu (ümrə ziyarəti) ailəsi Məscidülhəramda (Məkkədə və ətrafında) sakin olmayanlara aiddir. Allahdan qorxun və bilin ki, Allahın əzabı şiddətlidir.”** (Bəqərə, 2/196)

Hudeybiyə razılaşmasına görə, müsəlmanlar Kəbəni bir il sonra ziyarət edə biləcəkdilər. Razılaşmaya əsasən üç gündən çox Məkkədə qala bilməzdilər. Məkkəlilər də bu əsnada, şəhərin xaricinə çəkiləcəkdilər.

Razılaşmadan bir il sonra Rəsulullah (s.ə.s), Hudeybiyədə toplanan müsəlmanların, bir il əvvəl əda edə bilmədikləri Ümrəni qəza etmək üçün hazırlaşmalarını əmr etdi. Hicrətin 7-ci ili Zilqədə ayında (Mart 629) Mədinədən hərəkət edildi. Hudeybiyədə iştirak etməyənlərdən də qatılanlar olduğu üçün, Kəbəni ziyarətə gedənlərin sayı 2000 nəfəri keçdi.

---

317. Buxari, V, 80; Kamil Miras, *e.a.ə.,* X, 295 (Hədis No: 1615).
318. M. Zihni, *əl-Hakayık,* I, 200; İbn Hişam, IV, 3.
319. Buxari, V, 81; Kamil Miras, *e.a.ə.,* X, 301 (Hədis No: 1617).

Müşriklər, müsəlmanların gəldiyini eşidincə Məkkəni boşaltdılar. Şəhəri əhatə edən yüksək təpələrdə qurduqları çadırlardan, müsəlmanları maraqla izləyirdilər.

Müsəlmanların Məkkəyə girişləri çox həyəcanlı oldu. Hz. Peyğəmbər (s.ə.s) dəvəsi Kəsva üzərində irəliləyir, hamısı birdən yüksək səslə, "Ləbbeyk, Allahümmə ləbbeyk...."[320] deyə təlbiyə söyləyirdilər. Uzaqdan Kəbə görülüncə "Allahu Əkbər, Allahu Əkbər, La ilahə illallahu vallahu əkbər..."[321] deyə təkbir gətirməyə başladılar. İllərdən bəri həsrətini çəkdikləri Kəbə indi qarşılarında idi. Xüsusilə mühacirlər, yeddi illik bir ayrılıqdan sonra doğulub-böyüdükləri müqəddəs diyara girərkən ayrı bir həyəcan keçirirdilər.

Kəbə, üsuluna görə təvaf edildi, ətrafı yeddi dəfə gəzildi.[322] Səfa və Mərvə təpələri arasında say edildi.[323]

Müşriklərin liderləri Darun-Nədvənin qarşısında toplanıb müsəlmanları seyr edirdilər. Aralarında:

-Mədinənin istisi bunları zəif salmış deyə danışırdılar.

Rəsulullah (s.ə.s)

Müsəlmanların zəif və gücsüz olmadıqlarını göstərmək istədi. Sağ qolunu ehramın xaricində tutub çiynini şişirdi. Təvafın ilk üç şavtını qısa addımlarla qaçaraq etdi. Səhabələrinə də belə etmələrini əmr etdi. *"Bu gün özünü onlara qüvvətli göstərənə Allah rəhmət etsin"* [324] buyurdu.

---

320. Rəbbim! Dəvətinə uyaraq sənə təkrar-təkrar gəldim. Əmrinə boyun əydim. Rəbbim əmrinə tabe olmaq boynumun borcudur, sənin bərabərin və ortağın yoxdur. Rəbbim bütün varlığımla sənə yönəldim. Həmd sənin, nemət sənin, mülk də sənindir. Bütün bunlarla bərabərin və ortağın yoxdur.

321. Allah böyükdür, Allah böyükdür. Allahdan başqa qulluq ediləcək heç bir ilah yoxdur. Allah böyükdür, Allah böyükdür. Həmd ona məxsusdur.

322. Hacər-i Əsvədin olduğu küncdən başlayaraq, Kəbənin ətrafını 7 dəfə gəzməyə "Təvaf"deyilir. Hər bir dövrəyə də "şavt" adı verilir.

323. Məscid-i Hərəmin şərqində, Səfa və Mərvə adı verilən iki təpə arasında 4-ü gediş 3-ü dönüş olmaqla, 7 dəfə gedib gəlməyə "say" deyilir.

324. Buxari, V, 86; Kamil Miras, *e.a.ə.,* X, 308. Təvafın ilk üç şavtında, kişilərin qısa addımlarla qaçaraq və çiyinlərini silkələyərək sürətli yerimələrinə, "rəməl" deyilir. Ehramlı ikən, rida deyilən örtünün bir ucunu sağ qoltuğun altından keçirib, sol çiyinin üzərinə ataraq sağ çiyin

Sabahısı gün Peyğəmbər əfəndimiz Kəbəyə girdi. Günorta vaxtına qədər orada qaldı. Kəbə hələ bütlərlə dolu idi. Bilal, Kəbənin ustünə çıxaraq günorta azanını oxudu. Məkkə üfüqləri "Allahu Əkbər" sədalarıyla zingildədi. Rəsulullahın (s.ə.s) arxasında camaatla namazlarını qıldılar.

Daha sonra müsəlmanlar təraş olaraq ehramdan çıxdılar. Bir il əvvəl əda edə bilmədikləri ümrəni qəza etmiş oldular. Rəsulullahın (s.ə.s) yuxusu və səhabələrinə müjdəsi də beləcə reallaşmış oldu. Bu səbəblə hicrətdən sonra, müsəlmanların bu ilk Kəbə ziyarətinə "Umrətul-Qəza" (Qəza Ümrəsi) adı verilmişdir

### 1. Qəza Ümrəsinin Məkkəlilər Üzərindəki Təsirləri

Müsəlmanlar, Hudeybiyə razılaşmasına əsasən üç gün Məkkədə qaldıqdan sonra, Mədinəyə döndülər. Bu əsnada müşriklər, uzaqdan uzağa müsəlmanların bütün hallarını, davranışlarını maraqla və diqqətlə izlədilər. Son dərəcə nəzakətli, dinclik və sakitlik içində qardaşca dolanan insanlar olduqlarını gördülər. Nə içki içib sərxoş olan, nə başqasına hörmətsiz davranan var, hamısı ədəbli, tərtəmiz, üstün əxlaqlı insanlar idi. Topluca ibadət edir və bir-birlərini sevib sayırlar, kimsəyə pislik etmirlər, daim Allaha itaət içində olurlar. Bəli, bunlar nə yaxşı insanlardır.

Müsəlmanların üstün cəhətləri, nümunə davranış və yaşayışları, Məkkəlilər üzərində böyük təsirlər meydana gətirdi. İslam haqqındakı düşüncələri dəyişməyə başladı. İçlərində müsəlman olmaq arzusu meydana gələnlər belə oldu. Qureyşin liderlərindən Xalid b. Vəlid, Amr b. As, Osman b. Talha bunlardan idi.

### F. Rəsulullahın (s.ə.s) Meymunə ilə Evlənməsi

Hz. Meymunə, Peyğəmbər (s.ə.s) əfəndimizin əmisi Abbasın yoldaşı Ümmül-Fadlın bacısıdır. Haris əl-Hilaliyənin qızıdır. Əvvəl Məsud b. Əmr ilə evlənmiş, sonra Əbu Rəhm b. Ədüluzzanın yoldaşı ikən dul qalmışdı.

---

və qolu, örtünün xaricində buraxmağa "İztiba" adı verilir. İztiba və rəməl, ondan sonra say ediləcək olan təvaflar da sünnədir.

Rəsullullahın (s.ə.s) yoldaşları arasında olmaq ən böyük arzusu idi. Buna görə, asan və mehirsiz olaraq Rəsuli-Əkrəmin (s.ə.s) özünü nikahlamasını istəyirdi.[325] Hz. Abbas, dul baldızının istəyini Rəsulullaha (s.ə.s) çatdırdı. Peyğəmbər (s.ə.s) əfəndimiz, şərəf və zadəganlığına hörmət edərək, Hz. Meymunənin təklifini qəbul etdi. Qəza Ümrəsi əsnasında ehramlı ikən nikah kəsib, ehramdan çıxdıqdan sonra evləndi.[326]

Hz. Meymunə, Rəsulullahın (s.ə.s) evləndiyi son yoldaşıdır. Hicrətin 51-ci ili, həcc dönüşündə, Məkkəyə 6 mil məsafədə "Sərif" deyilən yerdə vəfat etmişdir.[327]

### G. Xala Ana Yerindədir

Hz. Həmzənin kiçik qızı, Ümrə zamanı Məkkədə qalmışdı. Qəza Ümrəsindən sonra Mədinəyə dönərkən, "əmi, əmi" deyə Rəsulullahın (s.ə.s) önünə qaçdı. Hz. Əli onu qucaqlayıb:

-Al, əmimizin qızı -deyərək, yoldaşı Hz. Fatiməyə verdi. Mədinəyə çatınca Hz. Əli, Cəfər b. Əbi Talib və Zeyd b. Harisə hamısı da uşağın baxımının özlərinə verilməsini istəmişdilər. Cəfər b. Əbi Talibin yoldaşı Əsma, Ümamənin xalası idi. Rəsulullah (s.ə.s): -*Xala, ana yerindədir,* buyurdu və uşağın baxımını ona verdi.[328]

## VII. MUTƏ DÖYÜŞÜ (Cəmaziələvvəl 8 h./Sentyabr 629 m.)

### A. Döyüşün Səbəbi

Mutə döyüşü, müsəlmanlarla xristianlar (rumlar və xristian ərəblər) arasında edilən ilk döyüşdür. Səbəbi Rəsulullahın (s.ə.s) elçisinin öldürülməsidir.

325. Özünü hədiyyə edən müsəlman xanımları mehirsiz olaraq nikahlaması, Əhzab surəsinin 50-ci ayəsiylə Rəsulullaha (s.ə.s) halal edilmişdir.

326. Buxari, V, 86; Kamil Miras, *e.a.ə.,* X, 309 (Hədis No: 1618).

327. Kamil Miras, *e.a.ə.,* X, 310.

328. Buxari, V, 85; Kamil Miras, *e.a.ə.,* VIII, 136–139 (Hədis No: 1158); *Riyazus-Salihin*, I, 365 (Hədis No: 333); İbn Qayyim, *e.a.ə.,* II, 369.

Rəsulullah (s.ə.s) islama dəvət üçün hökmdarlara elçilərlə məktublar göndərdiyi əsnada, Suriyada Busra (indiki Sinaqoqun) əmiri Şürahbilə də, Haris b. Umeyr ilə bir məktub göndərmişdi. Qassani ərəblərindən Şürahbil, xristian idi. Bizansın himayəsində olurdu.

Haris, Şürahbilə Qüdsün iki mil cənubunda olan Mutə qəsəbəsində rast gəldi. Elçi olduğunu söyləyərək Hz. Peyğəmbərin (s.ə.s) məktubunu ona verdi. Lakin Şürahbil, insanlığa zidd davranaraq Rəsulullahın (s.ə.s) elçisini öldürtdü.

İndiyə qədər Hz. Peyğəmbərin (s.ə.s) elçilərindən heç biri öldürülməmişdi. Bir elçinin öldürülməsi, tarix boyunca bütün cəmiyyətlərdə insanlığa və hüquq qaydalarına zidd bir davranış sayıldığı kimi, göndərənə də ən böyük təhqir və meydan oxuma demək idi. Bu səbəblə Rəsulullah (s.ə.s) üç min nəfərlik bir ordu hazırlayaraq, azadlı köləsi Zeyd b. Harisənin əmrində yola çıxardı.[329] Rəsulullah, elçi Haris b. Umeyr şəhid edildiyi Mutəyə qədər gedilməsini, Şürahbil və əmrindəkilərin islama dəvət edilməsini, qəbul etməzlərsə döyüşülməsini əmr etdi.[330] *“Qadınları, uşaqları, yaşlıları öldürməyin, evləri yıxıb xarab etməyin, ağacları kəsib, təxribat törətməyin!”* -dedi. Ordunu “Səniyyətül-Vida” deyilən ayrılıq təpəsinə qədər yola salan Hz. Peyğəmbər (s.ə.s):

- “*Zeyd şəhid olsa Cəfər, Cəfər də şəhid olsa, Abdullah b. Rəvaha komandir olsun.” buyurdu.”*[331]

### 1. İki Tərəfin Vəziyyəti və Aradakı Bərabərsizlik

İslam ordusunun hərəkətini Şürahbil eşitdi. Dərhal Lahm, Cüzam, Qayın, Bəlkin, Bəhra kimi xristian ərəb qəbilələrindən böyük bir ordu hazırladı. Bundan əlavə vəziyyəti Bizans imperatoruna bildirərək, ondan da kömək istədi. Beləcə Şürahbil, 200 min nəfərlik böyük bir ordu yığdı. Bunun 100 mini

329. Orduda ənsar və mühacirlərin böyükləri də vardı. Azadlı bir kölə hamısına komandir olmuşdu. Bu hadisə islamdakı səlahiyyət və bərabərlik tətbiqinin canlı nümunələrindən biridir.

330. Kamil Miras, *e.a.ə.,* X, 312.

331 Buxari, V, 87; İbnu’l-Əsir, *e.a.ə.,* II, 234; Kamil Miras, *e.a.ə.,* X, 313 (Hədis No: 1619).

Rumlardan, 100 mini də xristian ərəblərdən meydana gəlmişdi.[332] İmperator Herakl da işə əhəmiyyət verərək, Bəlkadakı Məab şəhərinə qədər gəldi.

Müsəlmanlar, ancaq Suriya torpaqlarına girdikdən sonra düşmənin gücü və hazırlıqları haqqında məlumat əldə edə bildilər.

İki tərəf arasında istər ədəd, istərsə də silah və təchizat baxımından böyük bir fərq vardı. Tarixdə, iki tərəf arasında belə böyük bir fərq görülməmişdir. 200 min (bəzi rəvayətlərdə 100 min) nəfərlik bir ordu qarşısında üç min mücahid nə edə bilərdi? Lakin, döyüşmədən geri dönə bilməzdilər. Komandir Zeyd, Maanda mücahidlərin liderləriylə toplanıb vəziyyəti müşavirə etdi. Görəsən, vəziyyəti Rəsulullaha (s.ə.s) bildirib alınacaq cavaba görəmi hərəkət edilməli idi? Lakin, Abdullah b. Rəvaha bütün tərəddüdləri yox etdi.

- Yoldaşlar, çəkindiyimiz şey, ələ keçirmək üçün yola çıxdığımız şeydir, yəni şəhid olmaqdır. Dinimizi ucaltmaq üçün döyüşək. Ya şəhid, ya qazi olacağıq. Bunun ikisi də gözəl deyilmi ? dedi.[333]

Abdullahın çıxışı mücahidlərin döyüş ruhunu yüksəltdi. Hamısı da: - Abdullah doğru söyləyir. Döyüşməliyik, dedilər.

## 2. Komandirlər Növbəylə Şəhidlik Şərbətini İçdilər

İki ordu Mutədə qarşılaşdı. Zeyd, əlində bayraq irəli atıldı. Qəhrəmanca vuruşdu və ölümdən qorxmadığını göstərdi. Lakin, düşmən mızraqlarının arasında şəhid oldu.[334]

Zeyd şəhid olunca, bayrağı dərhal Cəfər aldı. Bənzərsiz qəhrəmanlıqlar göstərdi. Əvvəl sağ əli kəsildi, bayrağı sol əliylə tutdu. Sol əli də kəsilincə, qollarıyla bayrağa sarıldı. Bir çox yara aldığı halda son nəfəsinə qədər bayrağı buraxmadı. Nəhayət o da şəhid oldu.[335]

---

332. Buxari, V, 87; İbnu'l-Əsir *e.a.ə.,* II, 234-235; Kamil Miras, *e.a.ə.,* IV, 541, (Hədis No: 644 və şərhi).
333. İbn Qayyim, *e.a.ə.,* II, 375; İbnu'l-Əsir, *e.a.ə.,* II, 235; İbn Hişam, *e.a.ə.,* IV, 17.
334. Əhzab, 33/37; Zeyd ilk müsəlmanlardandır. Rəsulullah (s.ə.s) onu çox sevərdi. Bədirdən etibarən bütün döyüşlərdə olmuşdur. Səhabələrdən Qurani-Kərimdə adı keçən, yalnız Zeyddir.
335. Cəfər, Rəsulullahın (s.ə.s) çox sevdiyi əmisi Əbu Talibin böyük oğludur. Hz. Əlidən 10 yaş böyükdür. İkinci Həbəşistan hicrətində qafiləyə başçılıq etmiş, Xeybər fəth edildiyi gün

Cəfərdən sonra bayrağı Abdullah b. Rəvaha aldı. O da şeirlər söyləyərək, qəhrəmanca döyüşdü. Bədəni dəlik-deşik oldu. Sonunda o da şəhid oldu.

### 3. Xalid b. Vəlidin Üstün Məharəti

Abdullah da şəhid olduqda, ordu komandirsiz qaldı. Ümumi bir çaxnaşma başladı. Dağılan ordunun qaçışına Xalid b.Vəlid mane oldu. Mücahidlər, Xalidin ətrafında yenidən toplandılar. Xalid bayraq əlində axşama qədər vuruşdu. O gün əlində tam doqquz qılınc parçalandı.[336] Bu, müsəlman olduqdan sonra Xalidin qatıldığı ilk döyüş idi.

Gecə olunca, Xalid ordunu yenidən düzənlədi. Öndəkiləri arxaya, arxadakıları önə, sağdakıları sola, soldakıları sağa keçirdi. Beləcə düşmənə, kömək üçün yeni qüvvələr gəlmiş intibahını verdi. Səhər olunca da qəflətən şiddətli bir hücuma keçərək düşməni məğlubiyyətə uğratdı. Bu fürsətdən faydalanaraq, əsgərini məharətlə geri çəkdi. Böyük bir itkiyə məruz qalmadan Mədinəyə döndü. İslam ordusunu böyük bir fəlakətdən qurtardı.

200 min nəfərlik orduya qarşı edilən bu çətin döyüşdə, müsəlmanlar yalnız 12 şəhid vermişdilər. Bu vəziyyət, komandirlərin döyüşü çox müvəffəqiyyətli idarə etmələri və canlarını fəda etməkdən çəkinməmələrinin bir nəticəsi idi.

### 4. Rəsulullahın (s.ə.s) Mədinədən Döyüşü Seyr Etməsi

Rəsulullah (s.ə.s) döyüşün bütün mərhələlərini, Mədinəyə hələ heç bir xəbər çatmadan səhabələrinə bildirmişdi. Allah təala, zaman, məkan və məsafə anlayışlarını qaldıraraq, sevimli Peyğəmbərinə döyüş meydanını olduğu kimi göstərmişdi. Məscid-i Nəbidə minbərdə oturmuş olan Allah Rəsulu (s.ə.s) gözlərindən yaşlar axaraq: -Bayrağı Zeyd aldı, Zeyd vuruldu, *şəhid* edildi. Sonra Cəfər aldı, O da şəhid oldu. Sonra Abdullah aldı, O da şəhid oldu. Ən sonunda bayrağı, Allahın qılınclarından bir qılınc, Xalid b. Vəlid götürdü. Allah ona fəthi müyəssər etdi, buyurdu.[337]

---

Mədinəyə dönmüşdü. Mutə döyüşündə 90-dan çox yara almışdır. Bunlardan 50-i ön tərəfində idi. Bax: Buxari, V, 86-87; Kamil Miras, *e.a.ə.,* X, 313; (Hədis No: 1619).

336. Buxari, V, 87; Kamil Miras, *e.a.ə.,* IV, 394 və X, 315.

337. Buxari, II, 72 və V, 87; Kamil Miras, *e.a.ə.,* IV, 391 (Hədis No: 623) və X, 315; İbnu'l-

Rəsulullah (s.ə.s), Zeyd, Cəfər və Abdullahın şəhid düşdüklərini xəbər verdikcə, hər biri üçün istiğfar etmiş və cənnətə girdiklərini də müjdələmişdi.[338] Bayrağı Xalid aldıqda isə: -Allahım Xalid sənin qılınclarından bir qılıncdır. Sən ona qalibiyyət ehsan et, deyə dua etmişdi.[339] Bundan sonra Xalidə "Seyfullah" (Allahın qılıncı) deyildi.[340]

Cəfərin şəhidlik xəbərini eşidincə, ailəsi fəryada başladılar. Rəsulullahda (s.ə.s) son dərəcə kədərləndi. Çox sevdiyi, ən qiymətli yoldaşlarını itirmişdi. Cəfərin ailəsini təsəlli etdi. Hüzünlüdürlər, yemək hazırlaya bilməzlər, deyə evinə yemək göndərdi.

-Allah Cəfərə, Mutədə kəsilən iki qoluna əvəz, iki qanad verdi. Onu cənnətdə mələklərlə birlikdə uçarkən gördüm, deyə müjdələdi.[341] Bu səbəblə Cəfər, bundan sonra Cəfəri Təyyar deyə xatırlandı.

**B. Zatüs-Səlasil Döyüşü (Cəmaziəlaxir 8 h./629 m.)**

Kudaa qəbiləsinin Uzrə və Bəli qolları, Mədinədəki heyvanlarını yağmalamaq üçün, Vadil-Kura yaxınlığında toplanmışdılar. Rəsulullah (s.ə.s) vəziyyətdən xəbərdar oluqda, bunların üzərinə Amr b. Asın əmrində 30-u atlı 300 nəfərlik bir səriyyə göndərdi. Bunlar arasında Sad b. Əbi Vakkas, Sad b. Ubadə, Səid b. Zeyd, Amr b. Rəbiə kimi ənsar və mühacirlərdən tanınmış şəxslər də vardı.

Amr b. As. səhabələrin böyüklərindən deyildi. Hələ bir il əvvəl müsəlman olmuşdu. Lakin, babası Vailin anası Bəli qəbiləsindən olduğu üçün Amrın bu qəbilə ilə əlaqəsi vardı. Amr, eyni zamanda döyüş üsulunu yaxşı bilən, son dərəcə ağıllı bir kimsə idi. Bu səbəblə Rəsulullah (s.ə.s), komandirliyə onu seçmişdi.

Amr, Vadil-Kura ətrafında Səlasil suyuna çatınca, düşmənin sayca üstün olduğunu öyrəndi. Burada yerləşərək, bir xəbərçi ilə Rəsulullahdan (s.ə.s) kömək istədi. Bunun üçün Rəsulullah (s.ə.s) Əbu Ubeydə b. Cərrahın əmrində

Əsir, *e.a.ə.,* II, 237.

338. İbnu'l -Əsir, *e.a.ə.,* II, 273; Kamil Miras, *e.a.ə.,* IV, 393.

339. Kamil Miras, *e.a.ə.,* X, 315.

340. İbnu'l-Əsir, *e.a.ə.,* II, 238.

341. İbnu'l-Əsir, *e.a.ə.,* II, 238; Mehmed Zihni Efendi, *əl-Hakayık,* I, 201.

200 nəfərlik əlavə qüvvə göndərdi. Hz. Əbu Bəkir və Hz. Ömər də bunların arasında idi. Rəsuli-Əkrəm (s.ə.s), Əbu Ubeydəni göndərərkən:

- Ayrılığa düşməyin, əməkdaşlıq edin, buyurmuşdu. Amr b. As, Əbu Ubeydənin döyüşçülərə imam olaraq namaz qıldırmasına etiraz etdi.

- Sən mənə köməyə gəldin, komandir mənəm, namazda mən imam olacağam, dedi.

Əbu Ubeydə yumşaq təbiətli bir şəxs olduğu üçün, buna heç etiraz etmədi.

- Ya Amr ! Rəsulullah (s.ə.s) əfəndimiz, ixtilafa düşməməmizi əmr etdi. Sən mənə uymazsansa, mən sənə uyaram, təlaşa ehtiyac yoxdur, deyə cavab verdi. Amr bütün müsəlmanlara səfər müddətində imam olub namaz qıldırdı. Beləliklə, Hz. Ömər və Hz. Əbu Bəkr də Amrın idarəsinə girmiş oldular. Halbuki Rəsulullah (s.ə.s), Amrı ilk 300 döyüşçüyə, Əbu Ubeydəni də 200 döyüşçüyə komandir təyin etmişdi. Əbu Ubeydəni Amrın əmrinə deyil, köməyinə göndərmişdi.[342]

Amr, düşmənə yaxınlaşınca lazımi tədbirləri aldı. Hava çox soyuq və sərt olduğu halda, gecə atəş yandırmağı qadağan etdi. “Kim atəş yandırsa, onu yandırdığı atəşin içinə ataram” deyə hədələdi. Döyüşçülər, soyuqdan Əbu Bəkir və Ömərə müraciət etdilər. Hz. Ömər:

- Bu necə işdi, hər kəsi soyuqdan qıracaqmı? deyə Amra xəbər göndərdi. Amr b. As:

- Ya Ömər, sən mənə itaətə məcbursan, işimə qarışma deyə, cavab verdi.

Hz. Əbu Bəkir də:

Rəsulullah (s.ə.s), onu döyüş üsulunu yaxşı bildiyi üçün komandir etdi. Madam ki, komandir odur, işinə qarışmamaq lazımdır, dedi. Beləcə gecəni soyuqda keçirdilər. Çünki, atəş yandırılsaydı düşmən müsəlmanların azlığını öyrənəcəkdi.

Amr, planını kimsəyə söyləmədi. Səhərə yaxın, alaqaranlıqda qəflətən düşmən üzərinə hücuma keçdi və döyüşdə qalib gəldi. Düşmən xeyli miqdar-

342. İbn Hişam, *e.a.ə.,* IV, 272; İbn Qayyim, *e.a.ə.,* II, 378; İbnu’l-Əsir, *e.a.ə.,* II, 232.

da qənimət buraxaraq qaçdı. Səhabələr, düşməni arxadan təqib etmək istəsələr də Amr buna da icazə vermədi. Bir neçə gün orada qalıb ətrafdakı qənimət olaraq ələ keçən heyvan sürülərini yığdıqdan sonra, Mədinəyə döndü.

Səfər əsnasında Amr b. As cünub olmuş, hava soyuq olduğu üçün qüsul almayaraq təyəmmümlə namaz qıldırmışdı.[343] Dönüşdə səhabələr, Rəsulullaha (s.ə.s), Amr b. Asdan:

1. Hava çox soyuq olduğu halda, gecə atəş yandırtdırmadı,

2. Qalib gəldiyimiz halda düşməni izlətdirmədi,

3. Su tapıldığı halda qüsul almayıb, təyəmmümlə namaz qıldırdı, deyə şikayət etdilər.

Amr bu şikayətlərə qarşı:

1. Sayımızın az olduğunu düşmən anlamasın deyə atəş yandırtdırmadım.

2. Kömək üçün qüvvə göndərə biləcəyi düşüncəsiylə düşməni izlətdirmədim.

3. Soyuqda yuyunmaq təhlükəli olduğu və Allah təala **“Əlinizlə özünüzü təhlükəyə atmayın.”** (Bəqərə, 2/195) və **“Özünüzü öldürməyin. Şübhəsiz Allah sizə qarşı mərhəmətlidir.”** (Nisa, 4/29) buyurduğu üçün qüsul almayıb təyəmmüm etdim, deyə cavab verdi.

Rəsulullah (s.ə.s) Amrın cavablarını təbəssümlə qarşıladı.[344]

Amr b. As, hələ yeni müsəlman olduğu halda, səhabələrin böyüklərinin də olduğu bir orduya komandir təyin edilməsindən ötəri qürurlanmışdı. Dö-

343. Əbu Hənifə və Əbu Yusufa görə dəstəmaz alan şəxslərin təyəmmüm edənə tabe olması caizdir. İmam Məhəmmədə görə dəstəmazlının təyəmmümlüyə uyması caiz deyil. İxtilaf, su və ya torpaq olan bu iki ünsür arasındadırmı? Yoxsa dəstəmaz və təyəmmümdən ibarət iki təmizlik arasındadırmı? məsələsindən yaranmaqdadır. Əbu Hənifə və Əbu Yusufa görə, ixtilaf su ilə torpaq arasındadır. İmam Məhəmmədə görə isə, iki təmizlik (dəstəmaz və təyəmmüm) arasındadır. Dəstəmazlı təyəmmümlüyə uyarsa, qüvvətli zəifə tabe olmuş olur. Halbuki imam muktədidən (ona tabe olandan) halca aşağı olmamalıdır. Dəstəmaz əsl təmizlik, təyəmmüm isə zəruri təmizlikdir. Əsl təharət etmiş olan kimsə, zəruri təharət etmiş olandan halca daha qüvvətlidir. Bax: Mehmet Zihni Efendi, *Kitabu's-Salat,* 210–211, İstanbul 1326.

344. İbn Qayyim, *e.a.ə.,* II, 379; Mahmud Esad Efendi, *e.a.ə.,* III, 406.

yüşü də qazanaraq dönüncə, Rəsulullahın (s.ə.s) yanındakı dərəcə və etibarını öyrənmək istədi. Rəsuli-Əkrəmə (s.ə.s):

- Ən çox kimi sevirsiniz? deyə soruşdu. Rəsulullah (s.ə.s)

Aişəni deyə cavab verdi.

- Sonra kimi?

- Aişənin atasını, Əbu Bəkri.

- Sonra kimi?

- Öməri.

Amr, ən sonraya özünün qalacağından qorxaraq soruşmaqdan imtina etdi.[345]

## VIII. ELÇİLƏR İLİ (Sənətül-Vüfud)

**“(Ya Peyğəmbər!) Allahın köməyi və zəfər (Məkkənin fəthi) gəldiyi zaman; İnsanların dəstə-dəstə Allahın dininə (islama) daxil olduqlarını gördüyün zaman. Rəbbini həmd-səna ilə təqdis et (Onu bütün naqis sifətlərdən uzaq tutub pak bil, “Sübhanəkə Allahümmə və bihəmdikə” kəlməsini de) və Ondan bağışlanmağını dilə. Həqiqətən, O, tövbələri qəbul edəndir!”.** (Nəsr, 110/1-3)

Ərəblərin, Hz. İbrahimin soyundan gəlmələri və Kəbənin gözətçisi olmaları səbəbiylə Qureyşə böyük hörmət və bağlılıqları vardı. Hudeybiyə sülh razılaşmasıyla, Qureyş tərəfindən müsəlmanların siyasi varlığı tanınınca, ərəb qəbilələri Mədinəyə nümayəndə heyətləri göndərməyə başlamışdılar. Hicrətin 8-ci ilində, bütə sitayiş edən müşrik ərəblərin dini mərkəzi olan Məkkə fəth edilmiş, Qureyş qəbiləsi müsəlman olmuşdu. Bunun ərəblər üzərindəki təsiri çox böyük oldu. İslamın qarşısında heç bir qüvvənin dayana bilməyəcəyini anladılar. Artıq ərəbistanın hər tərəfində islam sürətlə yayılırdı. Ərəbistanın müxtəlif bölgələrində yaşayan qəbilələr, müsəlman olmaq və ya müsəlman olduqlarını bildirmək və qəbul etdikləri islam dininin əsaslarını öyrənmək

345. Buxari, V, 113; Mahmud Esad Efendi, *e.a.ə.,* III, 407.

üçün, Hz. Peyğəmbərə heyətlər göndərdilər. Bunların sayı 70-dən artıqdır.

İlk heyət, Həvazin qəbiləsindən hicrətin 8-ci ilində gəlmişdi. Son heyət isə, Yəməndəki Nəha qəbiləsindən, hicrətin 11-ci ili Şəvval ayında gələn heyətdir. Gələn heyətlərin çoxu, hicrətin 9-cu ilində gəlmişdir. Buna görə hicrətin 9-cu ilinə "Sənətül-vüfud" (Elçilər ili) deyilmişdir.

Rəsuli-Əkrəm, özünə gələn bu heyətlərlə şəxsən maraqlanar, onlara ikram edər, hər qəbilənin halına və adətlərinə görə onlarla danışardı. Ayrılarkən də münasib hədiyyələr verər, islamı öyrətmək üçün onlara savadlı müəllimlər, mürşidlər göndərərdi. Rəsulullah (s.ə.s), bu mürşidlərə:

- *Asanlaşdırın, çətinləşdirməyin. Müjdələyin, qorxudub nifrət etdirməyin,*[346] deyə tənbeh də edərdi.

**A. Nəcran Heyəti**

Nəcran, Yəməndən Məkkəyə 7 mil məsafədə, əhalisi xristian olan böyük bir şəhər idi. Rəsulullah (s.ə.s) Nəcran xristianlarına bir məktub göndərib, ya müsəlman olmalarını, yaxud da cizyə vermələrini istəmişdi.[347] Bunun üzərinə əmirləri Əbdülməsih Axıbın rəhbərliyində Mədinəyə 14 nəfərlik bir heyət göndərdilər. Heyətdə, ən böyük alimləri Əbul-Haris ilə qardaşı Kürz b. Alkamə də vardı. Hz. İsa haqqında Rəsulullahla (s.ə.s) müzakirəyə girdilər. Rəsulullah (s.ə.s) onlara:

- *Gəlin, uşaqlarımız, qadınlarımız, hamımız bir yerdə toplanaq, Sonra, "Allahın lənəti yalançıların üzərinə olsun,*" deyə dua və niyaz edək, razısınızmı, dedi.[348] Nəcranlılar qorxdular, bu təklifə yanaşmadılar. Cizyə verməyi qəbul edib ayrıldılar.

Rahib Əbul-Haris, qardaşı Kürz ilə danışarkən:

- And içirəm ki, gözlədiyimiz ümmi peyğəmbər budur.

- O halda niyə bunu açıqca söyləyib ona inanmırsan?

346. Buxari I, 25 və IV, 26; Kamil Miras, *e.a.ə.,* I, 65 (Hədis No: 63).
347. İbn Qayyim, *e.a.ə.,* III, 81.
348. Ali-İmran, 3/61; Kamil Miras, *e.a.ə.,* X, 412-414 (Hədis No: 1650).

- Səbəbi, bizimkilərin etdikləridir. Bizə mövqe, şərəf və sərvət verdilər. Əgər müsəlman olsam bunların hamısını alarlar.[349] Kürz, bu danışığı gizli saxladı, daha sonra müsəlman olunca açıqladı

**B. Şair Kabın İslamı Qəbulu**

Kab, islamdan əvvəl (cahiliyyə dövründə) şeirləri Kəbə divarlarına asılan "Mualləqa" şairlərindən Züheyrin oğludur. Kab da atası kimi güclü bir şair idi. Lakin, davamlı olaraq Hz. Peyğəmbər (s.ə.s) və islamiyyəti tənqid edərdi. Buna görə Rəsulullahın (s.ə.s) *"gördüyünüz yerdə öldürün"* dediyi şəxslər arasında o da vardı.

Məkkə fəth edilincə, Taifə qaçmışdı. Taif xalqı da müsəlman olunca, sığınacaq yer tapa bilmədi. Qardaşı Büceyr daha əvvəl müsəlman olmuşdu. Kobud bir məktub yazdı. Rəsulullahın (s.ə.s), müsəlman olub üzr istəyənləri bağışladığını izah etdi. Mədinəyə gəlib müsəlman olmasını nəsihət etdi. Başqa qurtuluş yolu yox idi.

Kab, Rəsulullahı (s.ə.s) tərifləyən bir şeir hazırlayıb gizlicə Mədinəyə gəldi. Səhər namazında məscidə gedib Rəsulullahla (s.ə.s) birlikdə səhər namazını qıldı. Namazdan sonra Rəsulullahın (s.ə.s) qarşısında diz çökərək oturdu:

- Ya Rəsulullah! Kab keçmişinə tövbə edərək müsəlman oldu. Yanınıza gətirsəm, onu bağışlayarsınızmı? deyə soruşdu.

- Bəli, deyə cavabını alınca özünü tanıtdı.

- Kab bin Züheyr mənəm, dedi. Ənsardan biri üzərinə atılıb dərhal Kabı öldürmək istədi. Lakin, Rəsulullah (s.ə.s) icazə vermədi.

- O, tövbə etdi, müsəlman olaraq gəldi, buyurdu. Bunun üzərinə Kab əvvəldən hazırladığı qəsidəsini oxumağa başladı.[350]

"*Rəsulullah, hər şeyin özüylə işıqlandığı bir nurdur, şəri kəsib atmaq üçün çəkilmiş Allahın qılınclarından biridir.*" mənasındakı beytlər Rəsuli-

349. İbn Qayyim, *e.a.ə.,* III, 80.
350. İbn Hişam, 4/144-158; Mahmud Esad Efendi, *e.a.ə.,* IV, 445.

Əkrəmin (s.ə.s) çox xoşuna gəldi. Dərhal bürdəsini (jiletini) çıxarıb şairə geydirdi. Buna görə bu şeir "Qəsidəyi Bürdə" adıyla şöhrət tapdı.[351]

### C. Hatəm Tainin Qızı

Tay qəbiləsi, müsəlmanlara qarşı düşməncə bir rəftar içində olurdu. Rəsulullah (s.ə.s) 150 nəfərlik bir ordu ilə Hz. Əlini bu qəbilə üzərinə göndərdi. Hz. Əli Tay qəbiləsinə qəflətən hücum etdi. Burada olan bütxananı yıxıb bütləri qırdı. Bir çox əsir və qənimətlə Mədinəyə döndü. Qəbilə rəisi məşhur Hatəm Tainin oğlu Adiy isə Suriyaya qaçdı.

Əsirlər arasında Hatəm Tainin qızı da var idi. Hz. Peyğəmbərə (s.ə.s):

- Ya Rəsulullah, atam öldü, qardaşım qaçdı, fidyə ödəyə biləcək bir şeyim yoxdur. Atam comərd bir insan və qəbiləsinin lideri idi. Əsirləri qurtarar, kasıbları doyurar, fəlakətə məruz qalanlara kömək edərdi. Kimsəni boş qaytarmaz, istəyini rədd etməzdi. Xilas olmağım üçün mən də sənə sığınıram, dedi.

Rəsulullah (s.ə.s), onu sərbəst buraxdı. Paltar və yol xərcliyi də verərək, Suriyaya qardaşının yanına göndərdi.[352] Bacısı Adiyə, Hz. Peyğəmbərin (s.ə.s) fəzilət və alicənablığını izah edincə o da Mədinəyə gəlib müsəlman oldu.

## IX. TƏBÜK QƏZVƏSİ (Rəcəb 9 h. /Sentyabr 630 m.)

**"Əgər o (dəvət olunduqları yürüş), asan əldə edilən mənfəət (dünya malı, yaxud qənimət) və orta (mənzilli) bir səfər olsaydı, onlar mütləq sənin ardınca gedərdilər. Lakin yorucu (məşəqqətli) məsafə (Təbuk səfəri) onlara uzaq gəldi. Bununla belə, onlar: "Əgər gücümüz çatsaydı,**

351. Bu hırka (jilet) Kabın ölümündən sonra mirasçıları tərəfindən 20 min dirhəm (təxminən 60 kq.) gümüş qarşılığında Əməvi dövlətinin qurucusu Müaviyəyə satılmışdır. Əməvilərdən Abbasilərə, Misirin Yavuz Sultan Səlim tərəfindən fəth edilməsiylə də «Müqəddəs əmanətlər» arasında Osmanlılara keçdi. Hələ də Topkapı Saray Muzeyi "Hırkay-i Səadət" dairəsində, III. Murad tərəfindən hazırladılmış olan seyf içində qorunmaqdadır.

352. İbn Hişam, *e.a.ə.,* IV, 226; Mahmud Esad Efendi, *e.a.ə.,* III, 481.

**biz də sizinlə bərabər səfərə çıxardıq",- deyə Allaha and içəcəklər. Onlar (yalandan Allaha and içməklə) özlərini həlak edirlər. Allah isə onların yalançı olduqlarını bilir."**(Tövbə, 9/42)

Təbük, Mədinənin 14 mil şimalında, Mədinə ilə Şamın ortasında bir qəsəbədir. Bura qədər gəldikləri üçün bu səfərə "Təbük Qəzvəsi" deyilmişdir. Rəsulullahın (s.ə.s) şəxsən qatıldığı ən son qəzvədir. Təbük səfərində döyüş olmamış, lakin bir çox çətinliklərə baxmayaraq qüvvətli bir ordu hazırlanmış, böyük Bizans imperatorluğuna meydan oxuyarcasına, hərbi və siyasi böyük uğurlar əldə edilmişdir.

### A. Qəzvənin Səbəbi

Xristianlığın nümayəndəsi olan Bizans İmperatorluğu, ərəbistanı işğal etmək həvəsində idi. Bunun üçün, Suriyada və ərəbistanın şimalında olan xristian ərəbləri, müsəlmanlara qarşı döyüşə hazırlayırdı. İslamın ərəblər arasında sürətlə yayılmağa başlaması, xristianların nifrətini artırırdı.

Bu əsnada Mədinəyə yağ tacirləri gəlmişdi. Bizans İmperatorluğunun Qassan, Lahm, Cüzam... kimi qəbilələrlə əməkdaşlıq edərək, müsəlmanlara qarşı böyük bir hazırlıq içində olduğunu xəbər verdilər. Rəsulullah (s.ə.s) bu bölgədən əmin deyildi. Suriya və Şam tərəfindən ediləcək bir basqından narahat idi. Bu xəbər üzərinə dərhal Bizansa qarşı səfərbərlik elan etdi.

### B. Səfər Hazırlığı

Yol uzun, düşmən güclü idi. Üstəlik, yay fəslinin ən isti günləri idi. Quraqlıq ucbatından qıtlıq var idi. Xurmalar yetişmiş, yığım mövsümü gəlmişdi. Bu mövsümdə xurma kölgələrini buraxıb, ac susuz uzun bir səfəri gözə almaq həqiqətən çətin idi. Necə ki, bu səfərin edildiyi günlərə Qurani-Kərimdə "saatül-usra" (çətinlik zamanı) deyilmişdir.[353] Qurani-Kərimdəki bu deyimdən alınaraq, bu səfərə "Qəzvətül-usra", orduya da "Ceyşül-usra" adı verilmişdir.

---

353. Tövbə, 9/117; İbnu'l-Əsir, *e.a.ə.,* II, 277; Kamil Miras, *e.a.ə.,* X, 445-446.

Rəsulullah (s.ə.s) səfər hazırlığı edərkən, düşmənin xəbər almaması üçün, məqsədini gizləyər və səfərin hara ediləcəyini açıqlamazdı. Bu dəfə, gediləcək yer uzaq, səfər çətin idi. Döyüşçülərin buna görə hazırlanması üçün Rəsulullah (s.ə.s), Bizans üzərinə gediləcəyini açıqca bildirdi. Bütün qəbilələrə və Məkkəyə xəbər göndərib könüllü mücahidlərin Mədinədə toplanmalarını istədi.

Münafiqlər ilk anda boyun qaçırdılar. Ağlayaraq, ağla gəlməyəcək bəhanələr uydurub səfərə qatılmamaq üçün icazə istədilər.[354] Bununla da kifayətlənməyib, səfərə qatılacaq müsəlmanları fikirlərindən döndərməyə çalışdılar.[355] Abdulllah b. Ubey:

- Məhəmməd Bizansı nə sanır. Onun səhabələriylə birlikdə əsir düşəcəyini gözümlə görürəm, deyirdi.[356] Bədəvilərdən bir qismi də bəhanə uydurub icazə istəmişdilər.[357] Xalis müsəlmanlar arasında belə,[358] bu məşəqqətli səfəri gözə almayıb ağır davrananlar və səfərə qatılmayanlar olmuşdu.[359]

Lakin, başda Rəsulullah (s.ə.s) olmaqla səhabələrin əzm və səyi bütün maneələri dəf etdi. Ətrafdakı qəbilələrdən gələn axın-axın mücahidlər, Mədinədə toplanmağa başladı. Qısa zamanda 30 min nəfərlik böyük bir ordu toplandı. Bunun 10 mini atlı, 12 mini dəvəli idi. Qıtlıq səbəbiylə döyüşçülərin bir çoxunun təchizatı tam deyildi. Rəsulullah (s.ə.s) zənginlərin ordu üçün hədiyyə etməsini istədi. Hər kəs əlindən gəldiyi qədər yardım etdi. Qadınlar bilərzik və sırğa kimi zinət əşyalarını verdilər. Hz. Əbu Bəkir, malının hamısını, Hz. Ömər yarısını bağışladı.[360] Ən böyük hədiyyəni isə Hz. Osman etdi. Bütün silah və təchizatıyla birlikdə 300 dəvə ilə min misqal qızıl verdi.[361] Bu böyük hədiyyəsi səbəbiylə Hz. Peyğəmbər əllərini açıb:

---

354. Tövbə, 9/49; Kamil Miras, *e.a.ə.,* X, 446-447.
355. Tövbə, 9/81.
356. Mahmud Esad Efendi, *e.a.ə.,* III, 485.
357. Tövbə, 9/91.
358. Tövbə, 9/38-39.
359. Tövbə, 8/117-118.
360. Mahmud Esad Efendi, *e.a.ə.,* III, 483; İbnu'l Əsir, *e.a.ə.,* II, 227; Kamil Miras, *e.a.ə.,* X, 450.
361. İbn Qayyim, *e.a.ə.,* III, 3; Buxari, III, 198 və IV, 202; Kamil Miras, *e.a.ə.,* VIII, 275 (Hədis No: 1174).

*"Allahım ! Mən Osmandan razıyam, Sən də razı ol,"* deyə dua etmişdi".[362]

Edilən hədiyyələrlə silah və miniyi olmayan kasıb mücahidlər təchiz edildi. Səfərə qatılmaq istədikləri halda, minik və azuqə tapa bilməyənlər də vardı. Bunlardan 7 nəfər Rəsulullaha (s.ə.s) gələrək:

- Ey Allahın Rəsulu, qəzaya getmək istəyirik, lakin yemək azuqəmiz, minəcək dəvəmiz yoxdur, demişdilər. Rəsuli-Əkrəm:

- Sizi mindirəcək dəvə qalmadı, deyincə ağlayaraq ayrılmışdılar[363] Bu səbəblə bunlara **"Bəkkaun"** (yəni ağlayanlar) ünvanı verilmişdi.[364] Daha sonra onlara da minik təmin edildi.[365]

Rəsulullah (s.ə.s) Rəcəb ayında bir cümə axşamı günü Mədinədən çıxdı.[366] Qərargahını, Mədinə xaricində "Səniyyətül-Vida" deyilən ayrılıq təpəsində qurdu. Hz. Əlini Mədinədə baş məmur (vəkil) buraxdı. Hər kəs səfərə çıxarkən Mədinədə oturmaq Hz. Əliyə ağır gəlirdi. Dərhal silahlanıb yola çıxdı. Ordu Səniyyətül-Vidadan ayrılmadan onlara çatdı.

- Məni qadınlar və uşaqlar içindəmi buraxırsan? dedi. Rəsulullah (s.ə.s):

- *Ya Əli, mənə nisbətlə sən, Musaya nisbətlə Harunun yerində olmağa razı deyilsənmi? Bu qədər ki, məndən sonra Peyğəmbər yoxdur,* buyurdu.[367] Hz. Əli də Mədinəyə döndü.

---

362. İbn Hişam, *e.a.ə.,* IV, 161; Kamil Miras, *e.a.ə.,* X, 450.
363. Tövbə, 9/92; Kamil Miras, *e.a.ə.,* X, 451.
364. İbn Hişam, *e.a.ə.,* IV, 161; İbn Qayyim, *e.a.ə.,* III, 3-4; İbnu'l-Əsir, *e.a.ə.,* II, 277.
365. Bu yeddi nəfərdən biri olan Ulbə b. Zeyd, bir gecə təhəccüd namazından sonra göz yaşlarıyla belə niyaz etmişdi: "Allahım! Sən cihadı əmr və bizi ona təşviq etdin. Lakin, peyğəmbərinlə birlikdə qəzaya getmək qüdrətini mənə vərmədiyin kimi, peyğəmbərinin əlində məni mindirəcək minik də buraxmadın. Allahım! Sən bilirsən ki, mən üzərimə düşən mal, can və namus borcunu ödəyən bir qulunam." Səhər namazından sonra Rəsuli-Əkrəm (s.ə.s): Bu gecə mal, can sədəqəsi verən harada? deyə soruşdu. Kimsə cavab vermədi. Peyğəmbər əfəndimiz ikinci dəfə soruşdu. Bunun üzərinə Ulbə qalxdı. Rəsulullah (s.ə.s): Müjdə sənə ey Ulbə, and içirəm ki, sən zəkat və sədəqələri qəbul olunanlar divanına yazıldın, buyurdu.
366. Buxari, IV, 6; *Riyazus-Salihin,* II, 310 (Hədis No: 960).
367. Buxari, V, 129; İbn Hişam, *e.a.ə.,* IV, 163; Kamil Miras, *e.a.ə.,* X, 456 (Hədis No: 1658).

### C. Münafiqlərin Mövqeyi

Ordu, Səniyyətül-Vidadan hərəkət edincə, münafiqlərin bir qismi, rəisləri Abdullah b. Übey ilə geri döndü. Səfərə qatılanlar, səfər əsnasında da mənfi mövgelərini davam etdirdilər. Bir yerləşmə əsnasında Rəsulullahın (s.ə.s) dəvəsi Kəsva itmişdi. Münafiqlərdən Zeyd b. Əbu Salt:

- Qəribə işdir, Məhəmməd peyğəmbərəm deyir, göylərdən xəbər verir, halbuki dəvəsinin harada olduğunu bilmir, demişdi. Bu həyasızca sözləri Rəsulullah (s.ə.s) eşidincə:

- Vallah, mən yalnız Allahın mənə bildirdiklərini bilirəm. Allah mənə indi bildirdi. Kəsva, bu iki dağın arxasındakı vadidə tuklərıı bir ağaca dolanıb qalmışdır. Gedin, oradan gətirin, buyurdu.[368]

Münafiqlərin etdikləri bütün bu hiylələr, səfər əsnasında günü-gününə enən Quran ayələriylə nümayiş edilmişdir.[369] Münafiqlərin iç üzləri və məkirli planları açıq-aşkar ortaya çıxdığı üçün Təbük Səfərinə “Qəzvə-i fadıha” (Rüsvayçılıq qəzvəsi) da deyilmişdir.

Uzun və məşəqqətli bir səfərdən sonra Təbükə çatdılar. Lakin, istər Bizans, istərsə də ərəb qəbilələrindən heç bir hərəkətə rast gəlinmədi. 30 min nəfərlik böyük islam ordusu xristian ərəb qəbilələrini qorxutmuşdu. Mədinəyə gələn xəbərlərin əsassız olduğu aydın oldu. İslam ordusunun qüvvəti və böyüklüyü göstərilmiş, məqsəd hasil olmuşdu. Buna görə daha çox irəliyə getməyə ehtiyac qalmadı. Rəsulullah (s.ə.s) Təbükdə olduğu əsnada o bölgədə olan Cərba, Əzruh, Dumətül-Cəndəl kimi bəzi kiçik xristian qəbilələri ilə razılaşmalar etdi. Bu qəbilələr illik cizyə ödəyərək islam hakimiyyətinə girməyi qəbul etdilər. Müsəlmanlar Təbükdə 20 gün qaldıqdan sonra Ramazanın ilk günlərində Mədinəyə döndülər.

### Ç. Məscid-i Dırarın Sökülməsi

Münafiqlər, Kuba məscidinin yaxınında bir məscid inşa etdirmişdilər.

---

368. İbn Hişam, *e.a.ə.,* IV, 166; İbn Qayyim, *e.a.ə.,* III, 7; Kamil Miras, *e.a.ə.,* X, 457; İbnu’l-Əsir, *e.a.ə.,* II, 279.
369. Tövbə, 9/66-68.

Məqsədləri, Kuba məscidinin camaatını bölmək, müsəlmanlar arasına ayrılıq salmaq idi. Münafiqlərdən bir heyət Təbük səfərindən dönərkən Rəsulullahı (s.ə.s) qarşıladılar. Tikdirdikləri məsciddə namaz qılmasını xahiş etdilər. Ancaq bu əsnada, Tövbə surəsinin 107-108-ci ayələri nazil oldu. İbadət üçün deyil, fitnə və fəsad ocağı olaraq tikilən bu binada Rəsulullahın (s.ə.s) namaz qılmasına icazə verilmədi. **"(Quba məscidinə və müsəlmanlara) zərər vurmar, küfr etmək, möminlər arasına təfriqə salmaq məqsədilə, əvvəllər Allaha və Onun Peyğəmbərinə qarşı müharibə edən kimsədən (gəlib onlara rəhbərlik edəcəyi təqdirdə) göz-qulaq olmaq üçün məscid düzəldən və: "Biz (bununla) yaxşılıqdan başqa bir şey istəmədik",- deyə and içənlərin (münafiqlərin) , həqiqətən, yalançı olmaları barədə Allah Özü şahidlik edəcəkdir! (Ya Rəsulum!) Orada heç vaxt namaz qılma. İlk gündən binası təqva (Allahdan qorxub pis əməllərdən çəkinmək) üzərində qurulmuş məscid namaz qılmağına daha layiqdir. Orada paklanmağı sevən insanlar vardır. Allah pak olanları (özlərini cismən təmizləyənləri, mənəvi qüsurlardan, çirkinliklərdən qorumağa çalışanları) sevər!"** buyuruldu.[370] Rəsulullah (s.ə.s) Mədinəyə dönüncə, Malik b. Dühşəm ilə Maan b. Adiyə dərhal bu məscidi yıxıb yandırmalarını əmr etdi. Onlar da dərhal Rəsulullahın (s.ə.s) əmrini yerinə yetirdilər.[371]

İki ay sonra, münafiqlərin lideri olan Abdullah b.Übey öldü. Müsəlmanlar da onun fitnəsindən xilas olmuş oldular.

Rəsulullahın (s.ə.s) ordusu ilə birlikdə dönməkdə olduğu Mədinədə eşidilincə, bütün xalq, qadınlar və uşaqlar küçələrə töküldü. Şeirlər və qəsidələr söyləyərək, ordunu Səniyətül-Vida da böyük bir mərasimlə qarşıladılar.

### D. Səfərə Qatılmayanların Vəziyyəti

Rəsulullah (s.ə.s) Mədinəyə gəlincə əvvəlcə məscidə gedərək iki rükət namaz qıldı. Səfər dönüşlərində əvvəl məscidə gedib iki rükət namaz qılmaq adəti idi.[372] Sonra məsciddə oturub ziyarət və təbrikləri qəbul etdi. Səfərə qatılmamış olanların hər birisinin bəhanəsini dinlədi, haqqlarında Allahdan

370. Tövbə, 9/107-108.
371. İbn Hişam, *e.a.ə.,* IV, 173-174; İbn Qayyim, *e.a.ə.,* III, 19; Kamil Miras, *e.a.ə.,* V, 377-378.
372. Buxari, IV, 40; Kamil Miras, *e.a.ə.,* VIII, 497 (Hədis No: 1287).

bağışlama dilədi. Üzrləri olmadığı halda, Təbük səfərində iştirak etməyən üç şəxs üçün:

- Allah haqqınızda hökm verənə qədər gözləyin, buyurdu. Müsəlmanların bunlarla danışmalarını qadağan etdi. Tam 50 gün bunlarla kimsə danışmadı, salamlarını belə almadılar. Vaxtlarını hüzn və gözyaşları içində keçirdilər. Nəticədə, tövbələrinin qəbul edildiyi bildirildi.[373]

**“Həmçinin (Təbuk döyüşündən) geri qalmış üç nəfərin də (tövbələrini qəbul etdi). Belə ki, dünya onlara dar olmuş, ürəkləri (qəm-qüssədən) təngə gəlib sıxılmışdı. Onlar Allahdan (Allahın əzabından) yalnız Onun Özünə sığınmağın mümkün olduğunu başa düşdülər. Şübhəsiz ki, Allah tövbələri qəbul edəndir, rəhmlidir!”** (Tövbə, 9/118)

**E. Hz. Əbu Bəkrin Həcc Əmirliyi (Zilhiccə 9 h./Fevral 631 m.)**

Həccin səbəbi olan Kəbə, Hz. İbrahim və oğlu Hz. İsmayıl tərəfindən Məkkədə inşa edilmişdir. İnşaat tamamlandıqdan sonra Cəbrayıl (ə.s.), təvafın və həcc ibadətinin necə ediləcəyini feli olaraq onlara göstərmiş, Hz. İsmayıl da Hicaz xalqına öyrətmişdi. Ancaq, Hz. İbrahimin təbliğ etdiyi dini hökmlər zamanla unudulmuş, Məkkə bütpərəstliyin mərkəzi olmuşdu. Hz. İsmayılın öyrətdiyi həcc üsulu yavaş-yavaş dəyişmiş, yerini bütpərəstlərin həcci tutmuşdu.

İslamdan əvvəl müşrik ərəblər, içində günah işlənilən paltarlarla Kəbə ziyarət edilə bilməz, deyərlərdi. Bu səbəblə Kəbəni çırıl-çılpaq təvaf və ziyarət edərdilər.[374] Hicrətin 9-cu ilində həcc fərz qılındı.[375] Lakin, o il Rəsulullah (s.ə.s) həcc etmədi. Hz. Əbu Bəkri həcc əmiri olaraq Məkkəyə göndərdi.

Hicrətin 8-ci ilində Məkkə fəth edilmiş, Kəbə bütlərdən təmizlənmiş, Məkkə xalqı müsəlman olmuşdu. Ancaq hələ müsəlman olmayan müşrik qəbilələr yenə də Kəbəni çılpaq şəkildə təvaf edirdilər. Digər tərəfdən hicrətin

373. Bu üç kişinin keçirdikləri çox sıxıntılı 50 günün təfsilatı üçün bax:  Buxari, V, 130-135; Kamil Miras, *e.a.ə.,* X, 464-485 (Hədis No: 1659); *Riyazu's-Salihin*, I, 27 (Hədis No: 21).
374. M. Zihni Efendi, *əl-Hakayık,* I, 67, İstanbul, 1311/h; Kamil Miras, *e.a.ə.,* VI, 45 və VI, 156 (Hədis No: 803).
375. Ali-İmran, 3/97.

9-cu ilində həcc, **“nəsi”** tətbiqi ucbatından zamanından öncə ediləcəkdi.

Bilindiyi kimi, oruc, həcc, qurban kimi ibadətlərin vaxtları qəməri aylara görə təsbit edilir. Qəməri il (ay ili), 354 gün, günəş ili isə 365 gündür. Aradakı 11 günlük fərq səbəbiylə, həcc günləri hər il yer dəyişdirir. Bəzən yay, bəzəndə qış mövsümünə gəlir. Həcc mövsümünü çox isti və ya çox soyuq aylara rastlatmamaq, sabit bir mövsümdə (yazda) saxlamaq üçün ərəblər üç ildə bir, ilə bir ay əlavə edərək o ilin aylarını 13-ə çıxardardılar. Buna **“nəsi”** deyilirdi. Beləliklə, həcc mövsümü dəyişməz, lakin, aylar yer dəyişdirərdi. 33 ildə bir, aylar yerinə gəlirdi.[376] Necə ki, hicrətin 10-cu ilində qəməri aylar əsl yerinə gəldilər. Qurani-Kərim, müşrik ərəblərin bu çirkin adətini qadağan etmişdir.[377]

Hz. Peyğəmbər (s.ə.s) həcci əsl günlərində əda etmək istədiyindən o il həccə getmədi. Hz. Əbu Bəkri həcc əmiri təyin etdi. Mədinədən həccə getmək istəyən 300 nəfər də Hz. Əbu Bəkrlə getdilər.

Hz. Əbu Bəkir yola çıxdıqdan sonra, müşriklərlə münasibətləri nizamlayan hökmlər endi.[378] Bunların müşriklərə eşitdirilməsi lazım idi. Rəsulullah (s.ə.s) Hz. Əlini də bu iş üçün göndərdi. Hz. Əli yolda Hz. Əbu Bəkrə yetişdi.

- Həcc əmiri yenə sənsən, mən Tövbə surəsinin yeni enən ilk ayələrindəki hökmləri müşriklərə təbliğ ilə vəzifəliyəm, dedi.

Hz. Əbu Bəkir, Zilhiccənin 8-ci günü Məkkədə bir xütbə oxuyaraq, həccin necə ediləcəyini izah etdi. Müsəlmanlar, Hz. Əbu Bəkrin izah etdiyi şəkildə həcc etdilər. Müşriklər isə yenədə öz bildikləri kimi hərəkət etdilər.

Hz. Əli isə, Zilhiccənin 10-cu günü Minada bir xütbə oxudu. Hz. Peyğəmbər (s.ə.s) tərəfindən göndərildiyini bildirdi. Tövbə surəsinin ilk ayələrini yüksək səslə oxuduqdan sonra:

1. Müsəlmanlardan başqa heç kim cənnətə girə bilməz.

2. Bu ildən sonra heç bir müşrik Kəbəyə yaxınlaşdırılmayacaq.

3. Heç kim Kəbəni çılpaq təvaf etməyəcək.

376. Muhammed Hamdi Yazır, *e.a.ə.,* III, 2532; M. Həmidullah, *İslam Peyğəmbəri*, II, 87-94.
377. Tövbə, 9/37.
378. Tövbə, 9/1-36; Kamil Miras, *e.a.ə.,*II, 245-248 (Hədis No: 240 və şərhi).

4. Kimin Hz. Peyğəmbərlə (s.ə.s) razılaşması varsa, müddəti bitənə qədər ona sadiq qalınacaq, dedi.[379]

Bu elandan sonra çox keçmədi, bütün ərəbistan müsəlman oldu. O ildən sonra da heç bir müşrik Məkkəyə buraxılmadı.

### Ə. Peyğəmbərimizin Oğlu İbrahimin Vəfatı

### (8 Şəvval 10 h./7 Yanvar 632 m.)

İbrahim, Peyğəmbər (s.ə.s) əfəndimizin 7-ci uşağıdır. Digər 6 uşağının hamısı da, ilk yoldaşı Hz. Xədicədən olmuşdu. İbrahim isə misirli Mariyədən doğulmuşdur.

İbrahim, hicrətin 8-ci ili Zilhiccə ayında doğulmuşdu. İki yaşı tamam olmadan öldü. Rəsulullah (s.ə.s) İbrahimi öpər, iyləyərdi. Ölərkən gözləri yaşardı. Bunu görən Əbdürrəhman b. Avf:

- Ey Allahın Rəsulu! Səndəmi ağlayırsan? “Halbuki ölüyə ağlamağı qadağan etmişdin,” dedi. Rəsulullah (s.ə.s):

-*“Mən, qışqırıb-çığırmağı, üst-baş cırmağı qadağan etdim. Bu isə, Allahın qullarının ürəyinə qoyduğu şəfqətdir. Göz ağlar, ürək məhzun olar. Biz, Rəbbimizin razılığına uyğun olmayan söz ifadə etmərik. Ey İbrahim! Səni itirməkdən ötəri hüzn içindəyik”,* buyurdu.[380]

- İbrahim mənim oğlum. O hələ anasını əmərkən öldü. Cənnətdə iki süd anası, onun süd müddətini tamamlayacaqlar, dedi.[381]

İbrahim, Baqi qəbrisitanlığına dəfn edildi. Qəbrinin üstünə Rəsulullah (s.ə.s) bir tuluq su tökdürdü.[382] Faydası da yoxdur, zərəri də, lakin dirini məmnun edər, buyurdu.

İbrahimin öldüyü gün (7 Yanvar 632) günəş tutulmuşdu.[383] Camaat

379. İbn Hişam, *e.a.ə.,* IV, 190-191.
380. Buxari, II, 285; Kamil Miras, *e.a.ə.,* IV, 548 (Hədis No: 646).
381. Müslim, IV, 43; Buxari, II, 104; Kamil Miras, *e.a.ə.,* IV, 748 (Hədis No: 679).
382. Kamil Miras, *e.a.ə.,* IV, 551.
383. *Əsr-i Səadət,* I, 191; Kamil Miras, *e.a.ə.,* II, 245-248 (Hədis No: 240 və şərhi).

- İbrahimin ölümündən ötəri Günəş tutuldu, dedilər. Bunun üzərinə Rəsuli-Əkrəm:

*- Günəş və ay, Allahın qüdrətini göstərən əlamətlərdəndir. Heç kimin ölümündən və ya doğumundan ötəri tutulmazlar. Siz bu hadisə ilə qarşılaşdığınız zaman, namaz qılıb dua edin, buyurdu.*[384]

## X. RƏSULULLAHIN SON GÜNLƏRİ

### A. Vida Həcci (Zilhiccə 10 h./Mart 632 m.)

**"Ölü (kəsilmədən ölüb murdar olmuş) heyvan, qan, donuz əti, Allahdan başqasının adı ilə (bismillah deyilmədən) kəsilmiş, boğlmuş, (küt alət və ya silahla) vurulmuş, (bir yerdən) yıxılaraq ölmüş, (başqa bir heyvanın buynuzu ilə) vurulub gəbərmiş, vəhşi heyvanlar tərəfindən parçalanıb yeyilmiş - canı çıxmamış kəsdiyiniz heyvanlar müstəsnadır - dikinə qoyulmuş daşlar (bütlər və ya Kəbənin ətrafındakı bütpərəst qurbangahlar) üzərində kəsilmiş heyvanlar və fal oxları ilə pay bölmək sizə haram edildi. Bunlar günahdır. Bu gün kafirlər dininizdən (onu məhv edə bilmədikləri üçün) əllərini üzdülər. Onlardan qorxmayın, Məndən qorxun! Bu gün dininizi sizin üçün kamil etdim, sizə olan nemətimi (Məkkənin fəthi, islamın mövqeyinin möhkəmlənməsi, Cahiliyyət dövrünün bir sıra zərərli adətlərinin aradan qaldırılması və i. a.) tamamladım və sizin üçün din olaraq islamı bəyənib seçdim. Kim aclıq üzündən naçar qalarsa (çətinliyə düşərsə), günaha meyl etmək niyyətində olmayaraq (zəruri ehtiyacını ödəyəcək qədər bu haram ətlərdən yeyə bilər). Həqiqətən, Allah bağışlayandır, rəhm edəndir!"**(Maidə, 5/3)

Vida, bir yerdən ayrılan kimsə ilə geridə qalanların bir-birlərinə qarşılıqlı sağlamlıq diləmələri deməkdir. Peyğəmbər əfəndimiz, Ərafatda söylədiyi xütbəsində, dünya həyatından ayrılmasının yaxınlaşdığına işarə edərək, səhabələriylə vidalaşdığı üçün, bu həccinə "Vida Həcci" deyilmişdir. Hələ fərz qılınmadan, hicrətdən əvvəl Rəsulullah (s.ə.s) bir çox dəfə həcc etmişdi. Mədinəyə hicrətindən sonra Vida həcci ilk və son həcci odu. Bu həccindən 81 və ya 82 gün sonra vəfat etdi.

384. Buxari, II, 29-30; Kamil Miras, *e.a.ə.,* III, 428 (Hədis No: 547).

Hicrətin 10-cu ili islam bütün ərəbistana yayılmışdı. Rəsulullah (s.ə.s) Zilqədə ayında həcc vəzifəsini əda etmək üçün Məkkəyə gedəcəyini elan etdi. Onunla birlikdə həcc etmək istəyən müsəlmanlar Mədinədə toplanmağa başladılar.[385]

Rəsuli-Əkrəm (s.ə.s) 25 Zilqədə (22 Fevral 632) şənbə günü günorta namazını qıldıqdan sonra, səhabələriylə birlikdə Mədinədən çıxdı. Qızı Fatimə və bütün arvadları da yanında idi. İkindi namazını səfəri olaraq Zülhuleyfədə qılıb, gecəni də burada keçirdi. Sabahısı gün (26 Zilqədə) qüsul aldı, həcc və ümrə etmək üçün niyyət, təlbiyə gətirərək ehrama girdi. Günorta namazını da burada qıldıqdan sonra yola çıxıldı.[386]

Hz. Peyğəmbərlə (s.ə.s) birlikdə Həcc edə bilmək üçün Mədinədə toplananların sayı 100 minə yaxınlaşmışdı. Yol boyunca qatılanlar və birbaşa Məkkəyə gedənlərlə həcc edəcəklərin sayı 124 minə çatmışdı. Bu böyük izdiham, Rəsulullahın (s.ə.s) ətrafında bir insan seli kimi dalğalana- dalğalana irəliləyir, "Allahu əkbər və Ləbbeyk Allahümmə ləbbeyk" səsləriylə dağ-daş inləyirdi.

Səfər 10 gün davam etdi. Rəsuli-Əkrəm (s.ə.s) 4 Zilhiccə bazar günü Məkkəyə çatdı. Kəbəni üsuluna görə təvaf etdikdən sonra, Səfa və Mərvə arasında say etdi. Bazar ertəsi, çərşənbə axşamı və çərşənbə günlərini də Məkkədə keçirdi, "Yəvm-i tərviyə" deyilən 8 Zilhiccə cümə axşamı səhər namazını Məscid-i Hərəmdə qıldıqdan sonra, dəvəsinə minib bütün hacılarla birlikdə **"Mina"** ya hərəkət etdi. O gün burada qaldı. Günorta, ikindi, axşam, şam və sabahısı günün səhər namazlarını burada qıldı. Ərəfə günü (9 Zilhiccə cümə) səhəri, günəş doğduqdan sonra dəvəsinə minib Ərafata çıxdı. **"Nəmirə"** deyilən yerdə qurulan çadırında bir müddət istirahət etdi. Günorta vaxtı olunca, dəvəsinə minib Ərafat vadisinin ortasına gəldi. Onu dinləmək üçün 124 min müsəlman ətrafında toplanmışdı. Rəsulullah (s.ə.s) burada, onların şəxsində bütün insanlığı "Vida Xütbəsi" deyə məşhur olan insanlıq tarixinin ən təsirli və əhəmiyyətli xütbəsini söylədi.

Cahiliyyət dövründə, ərəbistanda qüvvətli zəifi əzərdi. Can, mal

385. Müslim, II, 887.
386. Buxari, II, 146; Kamil Miras, *e.a.ə.,* VI, 100-101 (Hədis No: 767) və VI, 106 (Hədis No: 769); İbn Qayyim, *e.a.ə.,* I, 369.

təhlükəsizliyi yox idi. Faizçilik üzündən kasıblar, zənginlərin köləsi halına gəlmişdi. Qadınlara insan dəyəri verilməz, kişilərin malı sayılardı. Qan davası üzündən, qarşılıqlı öldürmələrin sonu gəlməz, tapıla bilməyən günahkarın cəzasını, ailəsindən ələ keçən çəkərdi. Rəsulullah (s.ə.s), Vida xütbəsiylə cahiliyyət dövrünün bütün bu pisliklərini qadağan etdi. Bütün insanların bərabər olduğunu, Allah qatında üstünlüyün ancaq təqva ilə olduğunu izah etdi. "Müsəlmanlar qardaşdır." buyurdu. Xütbənin hər tərəfdən eşidilməsi üçün, gur səsli səhabələr tərəfindən cümlə-cümlə təkrar edildi. Xütbədən sonra Rəsulullah (s.ə.s), təqdim edilən bir stəkan südü içdi, oruclu olmadığını səhabələrinə göstərdi.[387] Günorta və ikindi namazlarını birlikdə (cəm-i təqdim ilə) qıldı.[388] İki vaxtın fərzləri arasındakı sünnələri qılmadı. Sonra dəvəsinə minib "Cəbəl-i Rəhmə" deyilən təpəyə irəlilədi. Bu təpənin ətəyində, dəvəsi üstündə qibləyə yönəldi. Günəş batana qədər dua edib vəqfə etdi. Dini hökmlərin tamamlandığını bildirən ayə də bu əsnada endi.[389]

*"Bu gün kafirlər dininizi yox etməkdən ümidlərini kəsdilər. Artıq onlardan qorxmayın, Məndən qorxun. Bu gün, sizin dininizi kamala çatdırdım, üzərindəki nemətimi tamamladım və sizə din olaraq İslamı bəyənib seçidim".*[390]

Günəş batdıqdan sonra Hz. Peyğəmbər (s.ə.s) Ərafatdan ayrıldı. Axşam və yatsı namazlarını Müzdəlifədə birlikdə (cəm-i təxir) qıldı.[391] Gecəni burada keçirdi. Səhər namazından sonra Məşar-ı hərəmdə hava işıqlanana qədər vəqfə etdi. Günəş çıxmadan öncə Minaya doğru hərəkət etdi. Burada Akabə Cəmrəsinə daş atarkən:

"*Ey insanlar, dini məsələlərdə ifratdan çəkinin. Sizdən əvvəlki ümmətlə-*

---

387. Buxari, II, 173; Kamil Miras, *e.a.ə.,* VI, 169 (Hədis No: 811).
388. **Cəm-i təqdim:** İkincisinin vaxtı girmədən, iki vaxt namazı birlikdə qılmaqdır.
389. Buxari, I, 16; Kamil Miras, *e.a.ə.,* I, 45 (Hədis No: 42 və X, 435).
390. Maidə, 5/3; Bu ayə ən son enən əhkam ayəsidir. Bir gün sonra (10 Zilhiccə) Minada enən **"Allaha tərəf qaytarılacağınız gündən qorxun. (O gün) hər kəsə gördüyü əməlin əvəzi veriləcək və (haqsız yerə) zülm olunmayacaqdır!"** (Bəqərə, 2/281) mənasındakı ayə ilə Qurani-kərim tamamlandı. Bundan sonra dini hökmlərdə heç bir dəyişmə (nəsx) olmadı. 81 gün sonra Rəsulullah (s.ə.s) vəfat etdi. Bax: Muhammed Hamdi Yazır, *e.a.ə.,* II, 1569.
391. **Cəm-i təxir:** Birincisinin vaxtı çıxandan sonra, iki vaxtın namazını birliktə qılmaqdır.

*rin həlakına səbəb, dini məsələlərdə həddi aşmaları olmuşdur."* buyurdu.[392]

Rəsuli-Əkrəm (s.ə.s), qurban bayramının 1 və 2-ci günlərində (10 və 11 Zilhiccə) bir xütbə də Minada oxudu. *"Həcc ibadətini, məndən gördüyünüz kimi edin"* buyurdu.[393] Qurban edilmək üçün hazırlanan 100 dəvədən 63-nü şəxsən özü kəsdi. Qalan 37-ində Hz. Əliyə kəsdirdi. Hər birindən bir parça ət alınıb bişirildi. Qalanı da kasıblara paylandı. Sonra Rəsulullah (s.ə.s) təraş olub ehramdan çıxdı. Məkkəyə enib ziyarət təvafını etdikdən sonra təkrar Minaya döndü. Bayram günlərini Minada keçirdi. Həccin digər əməllərini yerinə yetirdi. Bayramın dördüncü günü Məkkəyə gəldi. Vida Təvafını etdikdən sonra 14 Zilhiccə çərşənbə günü Məkkədən ayrılıb Mədinəyə dödü.

**B. Vida Xütbəsi (9 Zilhiccə l0 h. /8 Mart 632 m.)**

Peyğəmbərimiz Hz. Məhəmməd (s.ə.s) Vida həccində, 9 Zilhiccə cümə günü zəvaldan sonra Kəsva adlı dəvəsi üzərində, Ərafat vadisinin ortasında 124 min müsəlmanın şəxsində bütün insanlığa belə xitab etti.

*"Həmd Allaha məxsusdur. Ona həmd edər, ondan kömək istəyərik. Allah kimə hidayət etsə, artıq onu kimsə azdıra bilməz. Yoldan çıxardanı da kimsə hidayətə çatdıra bilməz. Şahidlik edirəm ki : Allahdan başqa ilah yoxdur. Təkdir, bərabəri, ortağı, tayı və bənzəri yoxdur. Yenə şahidlik edirəm ki, Məhəmməd onun qulu və rəsuludur*[394]

*Ey camaat! Sözümü yaxşı dinləyin. Bilmirəm, bəlkə bu ildən sonra sizinlə burada əbədi olaraq bir daha birlikdə ola bilməyəcəyəm.*

*İnsanlar! Bu günləriniz necə müqəddəs bir gün, bu aylarınız necə müqəddəs bir ay, bu şəhəriniz Məkkə necə müqəddəs bir şəhər isə, canlarınız, mallarınız, namus və şərəfiniz də eləcə müqəddəsdir. Hər cür təcavüzdən uzaqdır.*[395]

---

392. İbn Macə, II, 1008 (Hədis No: 3029); İbn Qayyim, *e.a.ə.,* I, 473; Kamil Miras, *e.a.ə.,* X, 436.
393. İbn Qayyim, *e.a.ə.,* I, 475; Kamil Miras, *e.a.ə.,* X, 437; Müslim, II, 943 (Hədis No: 1297).
394. Müslim II, 593 (Hədis No: 868); Əbu Davud, I, 252 (Hədis No: 1097); İbn Macə, I, 610 (Hədis No: 1892–1893).
395. Buxari, I, 24; Kamil Miras, *e.a.ə.,* I, 63 (Hədis No: 61); *Riyazus-Salihin*, I, 253 (Hədis No: 203); Beyhəqi, *əs-Sünənü'l Kübra,* V, 274, Haydarabad, 1352; İbn Hişam, *e.a.ə.,* IV, 250.

*Səhabələrim! Sabah Rəbbinizə qovuşacaqsınız. Bu günki hər hal və hərəkətinizdən şübhəsiz soruşulacaqsınız. Əsla məndən sonra köhnə adətlərə dönüb də bir-birinizin boynunu vurmayın.*[396] *Bu vəsiyyətimi burada olanlar, olmayanlara çatdırsınlar. Ola bilər ki, burada olmayanlar, eşidəndən daha yaxşı anlayaraq əməl etmiş olar.*[397]

*Səhabələrim! Kimin yanında bir əmanət varsa, onu sahibinə versin. Faizin hər növü qaldırılmışdır, ayağımın altındadır. Lakin, aldığımız borcun əslini ödəmək lazımdır. Nə zülm edin, nə də zülmə məruz qalın. Allahın əmriylə bundan belə faizçilik qadağandır. Cahiliyyətdən qalma bu çirkin adətin hər cürü ayağımın altındadır. İlk qaldırdığım faiz də Əbdülmüttəlibin oğlu əmim Abbasın faiz alacağıdır.*[398]

*Səhabələrim! Cahiliyyət dövründə güdülən qan iddiaları da tamamilə qaldırılmışdır. Qaldırdığım ilk qan iddiası, Əbdülmüttəlibin nəvəsi (əmilərimdən Harisin oğlu) Rəbiənın qan iddiasıdır.*[399]

*Ey camaat! Qadınların haqqlarını qorumanızı və bu mövzuda Allahdan qorxmanızı tövsiyə edirəm. Siz qadınları Allahın əmanəti olaraq aldınız. Onların namus və ismətlərini Allah adına söz verərək halal əldə etdiniz. Sizin qadınlar üzərində haqqınız, onların da sizin üzərinizdə haqqları vardır. Sizin qadınlar üzərindəki haqqlarınız, ailə namusu və şərəfinizi kimsəyə tapdalatmamalarıdır. Əgər onlar sizdən icazəsiz razı olmadığınız kəsləri ailəyə çağırssalar,onları yüngülcə döyüb qorxuda bilərsiniz. Qadınların sizin üzərinizdəki haqqları isə, ənənəyə görə hər cür (qanuni ehtiyaclarını), yemək və geyəcəklərini təmin etməyinizdir.*[400]

---

396. Buxari, I, 38; Kamil Miras, *e.a.ə.,* I, 99 (Hədis No: 101); *Riyazüs-Salihin*, II, 111 (Hədis No: 701); İbn Hişam, *e.a.ə.,* IV, 250.
397. Buxari, V, 126-127; Müslim, II, 889 (Hədis No: 1218); Beyhəqi, *Sünən,* V, 140; Kamil Miras, *e.a.ə.,* X, 437 (Hədis No: 1654) *Riyazu's-Salihin*, I, 260-262 (Hədis No: 211).
398. Müslim, II, 889 (Hədis No: 1218); Əbu Davud, I, 442 (Hədis No: 1905); Beyhəqi, V, 275; İbn Hişam, *e.a.ə.,* IV, 251.
399. Əbu Davud, II, 219, (Hədis No: 3334); İbn Hişam, *e.a.ə.,* IV, 251; Rəbiə, oğluna süd anasi tapmaq üçün Sadoğulları qəbiləsinə getdiyi zaman Hüzeyl onu öldürmüşdü. Peyğəmbər (s.ə.s) əfəndimiz, qoyduğu qadağanları əvvəl öz yaxınlarında tətbiq etmişdir.
400. Tirmizi, III, 467, (Hədis No: 1163); Əbu Davud, I, 442 (Hədis No: 1905); İbn Macə, I, 594

*Möminlər! Sizə iki əmanət buraxıram. Onlara sıx sarıldıqca yolunuzu heç azmazsınız. Bu əmanətlər, Allahın kitabı Quran və onun Peyğəmbərinin sünnəsidir.*[401]

*Ey insanlar! Davamlı dönməkdə olan zaman, Allahın göyləri və yeri yaratdığı günki vəziyyətə dönmüşdür. Bir il, l2 aydır, bunlardan 4-ü Zilqədə, Zilhiccə, Məhərrəm və Rəcəb aylarıdır.*[402]

*Səhabələrim! Bu gün şeytan sizin bu torpaqlarınızda yenidən nüfuz və səltənət qurmaq gücünü əbədi olaraq itirmişdir. Lakin, sizə qadağan etdiyim bu şeylər xaricində, kiçik gördüyünüz şeyləri də ona xəbərdar etsəniz, bu da onu sevindirər. Ona cəsarət verər. Dininizi qorumaq üçün bunlardan da uzaq olun.*[403]

*Möminlər! Sözümü yaxşı dinləyin, yaxşı əməl edin. Rəbbiniz birdir, atanız birdir. Hamınız Adəm övladısınız, Adəm də torpaqdan yaradılmışdır. Heç kimin başqaları üzərində soy üstünlüyü yoxdur. Allah qatında üstünlük ancaq təqva ilədir.*[404] *Müsəlman müsəlmanın qardaşıdır. Beləcə bütün müsəlmanlar qardaşdır. Könül xoşluğu ilə özü vermədikcə, başqasının haqqına əl uzatmaq halal deyil.*

*Səhabələrim! Nəfsinizə də zülm etməyin. Nəfsinizin də üzərinizdə haqqı vardır. Bu nəsihətlərimi burada olanlar, olmayanlara təbliğ etsinlər.*[405]

*Ey insanlar! Allah təala Quran da hər haqq sahibinə haqqını vermişdir. Varis üçün ayrıca vəsiyyət etməyə ehtiyac yoxdur.*[406] *Uşaq kimin döşəyində doğlmuşsa, ona aiddir. Zina edən üçün isə məhrumiyyət vardır. Atasından başqasına soy (nəsəb) iddiasına cəhd edən soysuz, yaxud əfəndisindən baş-*

---

(Hədis No: 1851); *Riyazu's-Salihin*, I, 318–319 (Hədis No: 274); İbn Hişam, *e.a.ə.,* IV, 251.

401. Malik b. Ənəs, *əl-Müvəttə*, II, 899, Misir 1371/1951; Müslim, II, 889–890 (Hədis No: 1218); Əbu Davud, I, 442 (Hədis No: 1905); Ət-Tirmizi, V, 662–663 (Hədis No: 3786-3788); İbn Macə, II, 1025 (Hədis No: 3074).

402. Buxari, IV, 126-127; Kamil Miras, *e.a.ə.,* X, 437-330 (Hədis No: 1654); İbn Hişam, *e.a.ə.,* IV, 251.

403. İbn Hişam, *e.a.ə.,* IV, 251.

404. Əhməd b. Hənbəl, *e.a.ə.,* V, 411.

405. Buxari, I, 35.

406. Əbu Davud, II, 103 (Hədis No: 2870).

*qasına boyun əyən nankor, Allahın qəzəbinə, mələklərin lənətinə və bütün müsəlmanların bəd duasına uğrasın. Allah təala belə insanların nə tövbələrini nə də ədalət və şahidliklərini qəbul edər.*[407]

*Səhabələrim! Allahdan qorxun, beş vaxt namazınızı qılın, Ramazan orucunuzu tutun, malınızın zəkatını verin, böyüklərinizə itaət edin. Beləliklə Rəbbinizin Cənnətinə girərsiniz.*[408]

*Ey insanlar! Sabah məni sizdən soruşacaqlar, nə deyərsiniz? Səhabəyi-kiram:*

*-Allahın dinini təbliğ vəzifəni haqqıyla edib, bizə nəsihət və vəsiyyət verdin, deyə şahidlik edərik, dedilər. Rəsulullah (s.ə.s) mübarək şəhadət barmağını göyə doğru qaldırdı və sonra üç dəfə:*

*- Şahid ol Ya Rəbb! Şahid ol Ya Rəbb! Şahid ol Ya Rəbb! buyurdu".*[409]

### C. İslamın Ərəbistanda Yayılması və Dinin Tamamlanması

**"Onu (islamı) bütün dinlərdən üstün etmək (onun bütün dinlərdən üstün olduğunu göstərmək) üçün Öz Peyğəmbərini hidayət və haqq dinlə göndərən Odur. (Ya Rəsulum! Sənin peyğəmbərliyinin həqiqiliyinə) Allahın şahid olması kifayət edər!"** (Fəth, 48/28)

İslam Məkkədə doğuldu, Mədinədə inkişaf etdi. Hudeybiyə sülh müqaviləsindən sonra, Mədinə xaricində yayılmağa başladı. Məkkənin fəthindən sonra, hər tərəfdən ərəb qəbilələri dəstə-dəstə Mədinəyə gəlib islamı  qəbul edirdilər. Qısa zamanda, Allahın köməyi ilə ərəbistan hamısı müsəlman oldu. Sayları çox az yəhudi və xristianlardan başqa yarımadada müsəlman olmayan qəbilə qalmadı. Hər tərəfdə əzan səsi, "Allahu əkbər" sədası yüksəldi. Bu müvəffəqiyyət şübhəsiz Allahın köməyinin bir nəticəsi idi. Qurani-Kərim bunu belə izah edir:

**"(Ya Peyğəmbər!) Allahın köməyi və zəfər (Məkkənin fəthi) gəldiyi**

407. İbn Hişam, *e.a.ə.,* IV, 253.
408. Tirmizi, II, 516 (Hədis No: 616); *Riyazu's-Salihin*, I, 106 (Hədis No: 73).
409. Müslim, II, 890 (Hədis No: 1218); Əbu Davud, I, 442 (Hədis No: 1905); İbn Hişam, *e.a.ə.,* IV, 250-253; Kamil Miras, *e.a.ə.,* X, 431-434.

**zaman; İnsanların dəstə-dəstə Allahın dininə (islama) daxil olduqlarını gördüyün zaman. Rəbbini həmd-səna ilə təqdis et (Onu bütün naqis sifətlərdən uzaq tutub pak bil, "Sübhanəkə Allahümmə və bihəmdikə" kəlməsini de) və Ondan bağışlanmağını dilə. Həqiqətən, O, tövbələri qəbul edəndir!"** (Nəsr, 110/1-3)

İslamın zəfərinin və tamamlanmasının yaxınlaşdığını bildirən bu surə, Qurani-Kərimin tam olaraq enən son surəsidir.[410] Məkkənin fəthindən əvvəl enmişdir.

Dinin tamamlanması, Hz. Peyğəmbərin (s.ə.s) vəzifəsinin bitməsi demək idi. Bu səbəblə Rəsulullah (s.ə.s) bu surə enincə, *"mənə vəfatım xəbər verildi."* buyurmuşdur.[411] Vida həccində Arafə günü Ərafatda, dinin kamala çatdığını bildirən *"son əhkam ayəsi"*[412] vəhy edilmiş, sabahısı gün Minada son ayə enmiş,[413] Qurani-Kərim tamamlanmışdı. Bütün bunlar, Peyğəmbərimiz Hz. Məhəmmədin (s.ə.s) vəfatının yaxınlaşdığını göstərirdi. Necə ki, Vida xütbəsində, *"bəlkə burada sizinlə əbədi olaraq bir daha birlikdə ola bilməyəcəyəm,"*[414] buyuraraq səhabələriylə vidalaşmışdı.

### Ç. Rəsulullahın (s.ə.s) Xəstələnməsi və Vəfatı

**"(Ey Peyğəmbər!) Şübhəsiz ki, sən də öləcəksən, onlar da öləcəklər!".** (Zumər, 39/30)

Vida həccindən döndükdən sonra, Hz. Peyğəmbər (s.ə.s) Uhud şəhidlərini ziyarət edib cənazə namazlarını qıldı. Bunlar, cənazə namazları qılınmadan dəfn edilmişdilər.[415] Xəstələnməsindən bir gün əvvəl də, Mədinənin "Cənnətül-Baqi" deyilən qəbrisitanlığını ziyarət etmiş, burada dəfn edilmiş olan müsəlmanlar üçün dua etmişdi. Sevimli Peyğəmbərimiz (s.ə.s), beləcə ümmətindən həyatda olanlarla vidalaşdığı kimi, sanki ölənləriylə də vidalaşmışdı.

---

410. Müslim, IV, 2318 (Hədis No: 3024).
411. Muhammed Hamdi Yazır, *e.a.ə.,* VIII, 6234.
412. Maidə, 5/3.
413. Bəqərə, 2/281.
414. Buxari, II, 64; Kamil Miras, *e.a.ə.,* IV, 655 (Hədis No: 661); İbn Hişam, *e.a.ə.,* IV, 250.
415. Buxari, II, 93.

Xəstəliyi əsnasında, qızı Hz. Fatiməyə gizli bir şey söyləmiş, Hz. Fatimə ağlamışdı. Daha sonra qulağına təkrar bir şey daha söyləyincə gülmüşdü. Hz. Fatimə bunun səbəbini, Rəsulullahın (s.ə.s) vəfatından sonra belə açıqladı. Rəsuli-Əkrəm(s. ə.s.):

- Qızım, hər il Ramazan ayında Cəbrayıl, Qurani-Kərimi mənimlə bir dəfə oxuyardı. Bu il iki dəfə oxudu. Düşünürəm, əcəlim yaxınlaşdı, buyurdu. Bunu eşidincə ağladım. Sonra, ev xalqı içindən özünə ilk olaraq mənim ona qovuşacağımı söylədi. O zaman da güldüm.[416]

Həqiqətən Hz. Fatimə, Rəsulullahdan (s.ə.s) 6 ay sonra vəfat etdi.[417] Əhl-i Beytindən Rəsulullaha (s.ə.s) ilk qovuşan o oldu.

Rəsulullah (s.ə.s) Baqi qəbrisitanlığından döndüyü gecə (19 Səfər çərşənbə günü) xəstələndi. Xəstəliyi 13 gün davam etdi. 1 Rəbiüləvvəl bazar ertəsi günü günortadan sonra vəfat etdi.

Xəstəliyinin ilk beş gününü xanımlarının yanında keçirdi. Gün geçtikcə ağırlaşır, gücü azalırdı. Buna görə, hər gün ayrı bir yerə getməyib Hz. Aişənin otağında qalmağı arzu edir, lakin yoldaşlarından heç birinin könlünü qırmamaq üçün bu istəyini açıqca söyləmir, bu gün kimin yanındayam, sabah harada olacağam? deyə soruşurdu. Yoldaşları istədiyi yerdə qalmasına icazə verdilər.

Əmisi Abbas ilə Hz. Əlinin qolları arasında Hz. Aişənin otağına gəldi. Gücsüzlükdən ayaqları yerdə süründürülürdü. Xəstəliyinin son səkkiz günü burada keçdi. Rəsulullah (s.ə.s) burada vəfat etdi.[418] Xəstəliyi müddətində əmisi Abbas ilə Hz. Əli və bütün xanımları yanından ayrılmadılar. Lazım olan anlarda ona xidmət edirdilər.

Rəsuli-Əkrəmin (s.ə.s) xəstəliyi qızdırma (humma) idi. Zaman-zaman huşunu itirdiyi olurdu. Qızdırmanın şiddətindən üzündəki örtünü atır, bədəninin hərarətini soyuq su ilə yüngülləşdirirdi.

Vəfatından beş gün əvvəl, cümə səhəri Rəsulullahın (s.ə.s) xəstəliyi ağırlaşdı.

416. Buxari, IV, 183, V, 138, VI, 101; Kamil Miras, *e.a.ə.,* XI, 6 (Hədis No: 1661) və XI, 267 (Hədis No: 1767); *Riyazu's-Salihin*, II, 101 (Hədis No: 690).

417. Buxari, IV, 42.

418. Buxari, II, 106 və V, 139-140; Kamil Miras, *e.a.ə.,* IV, 762 (Hədis No: 683 və XI, 15).

-Mənə yazı yazacaq bir şey gətirin, köhnə adətlərə qayıtmamağınız üçün sizə vəsiyyətimi yazdırım, buyurdu. Yanında olanlardan bir qismi, “bu anda Rəsulullah (s.ə.s) ağır xəstə, yanımızda Allahın kitabı var, O bizə yetər. Sonra yazılsın”; bəziləri isə “xeyr, indi yazılsın.” deyə müzakirəyə başladılar. Bunun üzərinə Rəsuli-Əkrəm (s.ə.s):

*-Heç bir peyğəmbərin yanında müzakirə edilməsi yaraşmaz. Mənim olduğum bu (murakabə) hal, sizin məni məşğul etmək istədiyiniz şeydən xeyirlidir. Məni öz halıma buraxın*, buyurdu. Daha sonra, vəfatı əsnasında üç şeyi vəsiyyət etdi.

1. Müşrikləri ərəbistandan çıxarın.

2. Gələcək elçilərə, mənim etdiyim kimi, ikram edin.

Hadisəsini nəql edən İbn Abbas, “üçüncüsünü unutdum.” demişdir.[419]

**D. Son Xütbəsi**

Eyni gün Rəsulullah (s.ə.s), yeddi tuluq soyuq su gətirilib vucuduna tökülməsini əmr etdi. Bəlkə beləcə yüngülləşər, camaata vəsiyyət edə bilərəm, buyurdu. Bir qabın içində, əliylə “artıq bəsdir” deyənə qədər bədəninə soyuq su tökdülər.[420] Rəsulullah (s.ə.s), Hz. Əli və Abbasın oğlu Fazlın qolları arasında məscidə gedərək minbərdə oturdu. Başında boz rəngli bir sarğı vardı. Allaha həmd və sənə etdikdən sonra:

-Ey insanlar! Hər kimin arxasına bir qamçı vurmuşamsa, bu mənim kürəyim, gəlsin vursun. Kimin məndə alacağı varsa, gəlsin alsın. Mənim yanımda ən sevimliniz, üzərimdə haqqı varsa, onu burada (dünyada) istəyən və ya halal edəndir. Beləliklə, Rəbbimə üz ağıyla qovuşaram, buyurdu. Sonra günorta namazını qıldırdı. Namazdan sonra təkrar minbərdə göründü. Eyni sözləri təkrarladı. Camaatdan biri, üç dirhəm borcu olduğunu söylədi. Bu şəxs, Rəsuli-Əkrəmin (s.ə.s) adına bir kasıba sədəqə vermişdi. Rəsulullah (s.ə.s) borcunu dərhal ödədi. Sonra belə buyurdu:

---

419. Buxari, I, 36-37 və IV, 31 və V, 137; Kamil Miras, *e.a.ə.,* I, 91 (Hədis No: 94) və VIII, 476 (Hədis No: 1275).

420. Buxari, I, 57 və V, 140; Kamil Miras, *e.a.ə.,* I, 138 (Hədis No: 149) və XI, 16.

-Ey insanlar! Kimin üzərində başqasına aid bir haqq varsa, çəkinməsin sahibinə ödəsin. Burada utanmaq, axirətdə xəcalətli olmaqdan xeyirlidir.[421]

Allah bir qulunu, dünya həyatı ilə öz nəznindəki axirət səadətini seçməkdə sərbəst buraxdı. O qul, axirət səadətini seçdi, buyurunca Hz. Əbu Bəkir ağlamaya başladı. Rəsulullah (s.ə.s):

-Ey Əbu Bəkir, ağlama! Səmimi yoldaşlığı və maddi fədakarlığı ilə mənə ən çox kömək edən Əbu Bəkrdir. Əgər ümmətimdən birini dost seçsəydim, şübhəsiz bu Əbu Bəkir olardı. Lakin, islam qardaşlığı, şəxsi dostluqdan üstündür. Əbu Bəkrdən başqa, digər evlərin məscidə açılan qapılarını bağlayın, buyurdu.[422] Sözlərinə davamla: -Səhabələrim! Peyğəmbərinizin vəfat edəcəyini düşünüb təlaşlandığınızı eşitdim. Hansı peyğəmbər, ümməti arasında əbədi qalmışdır? Bilin ki mən də, Rəbbimə qovuşacağam və buna hamınızdan daha çox layiqəm. Yenə bilin ki, siz də mənə qovuşacaqsınız. Görüşəcəyimiz yer, kövsər hovuzunun kənarıdır. Mənimlə orada görüşmək istəyənlər, əllərini, dillərini günahdan çəksinlər.[423]

-Ey insanlar! Üsamə b. Zeydin komandirliyi mövzusunda bəzi şeylər deyildiyini eşitdim. Daha əvvəl, atası Zeyd üçün də belə şeylər deyilmişdi. Allaha and içirəm ki, Zeyd komandirliyə layiq idi, özünü çox sevərdim. Atası kimi Üsamə də komandirliyə layiqdir, onu da çox sevirəm, ona itaət edin, buyurdu.[424] Sonra otağına döndü.

### E. Hz. Əbu Bəkri İmamlığa Vəkil Təyin Etməsi

Xəstəliyinin ilk günlərində, qızdırmasına və iztirabına baxmayaraq, namaz vaxtlarında məsciddə namazı qıldırırdı. Daha sonra xəstəliyi ağırlaşınca

421. İbnu'l-Əsir, *e.a.ə.,* III, 319-320; Mahmud Esad Efendi, *e.a.ə.,* III, 556-557.
422. Buxari, I, 119-120; və IV, 191 və IV, 254; Kamil Miras, *e.a.ə.,* II, 339-343 (Hədis No: 292–293) və XI, 19-20.
423. Kamil Miras, *e.a.ə.,* XI, 18;
424. Buxari, IV, 213 və V, 145; Rəsulullah (s.ə.s), Şam tərəfinə göndərmək üçün bir ordu hazırlamış, xəstələnməsindən bir gün əvvəl komandirliyi Üsamə b.Zeydə vermişdi. Orduda ilk mühacirlər və ənsardan da olanlar vardı. Üsamə isə hələ 20-27 yaşlarında bir gənc idi. Buna görə bəzi dedi-qodu edənlər olmuşdu. Rəsulullahın (s.ə.s) xəstəliyi və vəfatı səbəbiylə ordunun hərəkəti bir neçə gün gecikdi.

məscidə gedə bilmədi. İmamlıq etmək üçün, yerinə Əbu Bəkri vəkil etdi.

Vəfatından əvvəlki cümə axşamı, yatsı vaxtı olmuş, əzan oxunmuşdu. Rəsulullah (s.ə.s), namazın qılınıb qılınmadığını soruşdu. "Sizi gözləyirlər" dedilər. Yüngülləşmək üçün dərhal yuyundu. Lakin, ayağa qalxa bilmədi, huşunu itirdi. Ayılınca yenə soruşdu. Təkrar yuyundu və yenə huşunu itirdi. Beləcə üç dəfə yuyunub hazırlandı. Lakin, hər səfərində huşunu itirdi. Camaat isə məsciddə gözləyirdi, özünə gəlincə:

-*Əbu Bəkrə söyləyin, namazı qıldırsın* buyurdu,

Hz. Aişə, Rəsulullahın (s.ə.s) yerinə kim keçirsə keçsin, xalq tərəfindən sevilməz, uğursuz sayılar, deyə düşünürdü. Bu səbəblə:

-Ey Allahın Rəsulu! Əbu Bəkir kövrək ürəklidir, sizin yerinizə namaz qıldıra bilməz. Ağlamasından ötrü səsini kimsə eşidə bilməz, başqasını vəkil etsəniz... dedi. Lakin Peyğəmbər (s.ə.s) ilk əmrini təkrarladı.

-Əbu Bəkrə söyləyin, namazı o qıldırsın, buyurdu.[425] Beləcə cümə axşamı axşam namazından Rəsulullah (s.ə.s) vəfat edənə qədər 17 vaxt namazı Hz. Əbu Bəkir qıldırdı. Cümə axşamı günü axşam namazı, səhabələrin Rəsululahın (s.ə.s) arxasında qıldığı son namaz oldu.[426]

### Ə. Son Tövsiyələri

Rəsulullahın (s.ə.s) bəzən hərarəti düşür, xəstəliyi yüngülləşirdi. Hz. Əbu Bəkri vəkil qoyduqdan sonra, bir namaz vaxtı özündə rahatlıq hiss etdi. Hz. Əli ilə Abbasın oğlu Fazlın qollarında, ayaqlarını sürüyərək məscidə getdi. Rəsulullahın (s.ə.s) gələcəyi bilinmədiyindən namaza durulmuşdu. Hz. Əbu Bəkir, imamlıqdan çəkilmək istədi. Rəsulullah (s.ə.s), ona yerində dayanmasını işarə etdi. Əbu Bəkrin yanına oturub namazını qıldı.[427] Namazdan sonra, minbərin alt pilləsinə oturdu. Allaha həmd və şükür etdikdən sonra:

425. Buxari, I, 165 və 169; Kamil Miras, *e.a.ə.,* II, 510-536 (Hədis No: 387-394-397).

426. Buxari, V, 137; Kamil Miras, *e.a.ə.,* XI, 14.

427. Buxari, V, 162; Kamil Miras, *e.a.ə.,* II, 510-519 (Hədis No: 387); Bu namazda camaatın Hz. Əbu Bəkirə, Əbu Bəkrin də Rəsulullaha (s.ə.s) uyduğu da rəvayət edilməktədir. Bax. Buxari, I, 162.

Ey Mühacirlər! Sizə ənsar haqqında, yaxşı olmanızı vəsiyyət edirəm. Onlar mənim xas camaatım və ən səmimi dostlarımdır. Vaxtilə onlar sizi evlərində qonaq etdilər. Hər mövzuda sizi özlərinə ortaq seçdilər... Xalq, Mədinədə gündən-günə çoxalır, ənsar isə getdikcə azalır, yeməkdəki duz qədər qalır. Sizdən biri iş başına keçib, başqalarına fayda və zərər verə biləcək səlahiyyətlərə sahib olsa, ənsarın yaxşılıqlarını unutmayıb, qüsurlarını bağışlasın.[428]

Səhabələrim! İlk mühacirlərə də hörmət etmənizi vəsiyyət edirəm. Bütün mühacirlər də bir-birlərinə qarşı hörmətli olsunlar. Hər iş, Allahın iradəsi və ancaq onun icazəsiylə meydana gəlir. Onun iradəsi olmadan heç bir şey olmaz. Allahın iradəsinə etiraz etmək istəyənlər, sonunda məğlub olarlar. Allahı aldadacaqlarını sananlar, özləri aldanarlar, buyurdu.[429] Sonra otağına döndü. Rəsulullahın (s.ə.s) minbərdən son xütbəsi bu oldu.

**F. Vəfatı**

Ölüm gecəsi hərarəti düşmüş, səhərə yaxın rahatlamışdı.[430] Bazar ertəsi səhəri, otağının məscidə açılan qapı pərdəsini açdı. Əshabi-kiram, saf-saf, Hz. Əbu Bəkrin arxasında səhər namazını qılırdı. Onların bu halına sevindi, təbəssüm edərək seyr etdi. Hz. Əbu Bəkir, Rəsulullahın (s.ə.s) namaza gəldiyini sanaraq, ilk safa çəkilmək istədi. Səhabələr, Hz. Peyğəmbəri (s.ə.s) ayağa qalxmış görüncə sevinclərindən namazlarını pozacaqdılar. Rəsuli-Əkrəm (s.ə.s) əfəndimiz mübarək əliylə, namazı tamamlamalarını işarə etdi. Sonra pərdəni bağlayıb otağına çəkildi.[431] Əshabi-kiram, Rəsulullahın (s.ə.s) mübarək üzünü son dəfə gördülər

Bənizi qansız, üzü dümağ idi. Günortaya yaxın təkrar ağırlaşdı. Tez-tez huşunu itirməyə başladı. Sevimli qızı Hz. Fatimə, başında:

428. Buxari, I, 223 və IV, 226-267; Kamil Miras, *e.a.ə.,* III, 116 (Hədis No: 503) və XI, 18; İbn Hişam, *e.a.ə.,* IV, 300.
429. Kamil Miras, *e.a.ə.,* XI, 18.
430. Buxari, V, 141; Kamil Miras, *e.a.ə.,* XI, 22-24 (Hədis No: 1667).
431. Buxari, I, 165-166 və V, 141; Kamil Miras, *e.a.ə.,* II, 528 (Hədis No: 395) və XI, 24.

-Vay atamın iztirabına, deyərək çarəsizlik içində ağlayırdı. Rəsuli-Əkrəm (s.ə.s) əfəndimiz:

*-Kədərlənmə qızım, bu gündən sonra atan, heç izdirab çəkməyəcək, deyə onu təsəlli etdi.*[432] *İzdirabı çox idi, lakin halından şikayət etmirdi. Hərdənbir əllərini yanındakı su qabına batırıb üzünü isladırdı.*

*-La ilahə illəllah. Ölümün də şiddətləri var. Allahım, ölüm çətinliklərinə dözmək üçün mənə kömək et. Məni bağışla. Mənə mərhəmət et!* deyə dua edirdi. Sonra əlini qaldırdı, üç dəfə:

-"Allahım, məni Rafiq-i alaya (ən uca dosta) çatdır." dedi. Başı, yoldaşı Hz. Aişənin qucağında idi. Bu dua ilə, Rəsuli-Əkrəm (s.ə.s) əfəndimizin mübarək əli yerə düşdü.[433] Hz. Aişə Uca Peyğəmbərin (s.ə.s) başını şəfqətlə qaldırıb yastığına qoydu. Bazar ertəsi günü günortadan sonra aləmlərə rəhmət olan Sevimli Peyğəmbərimizin (s.ə.s) əziz ruhu uçmuş, Rəbbinə qovuşmuşdu.[434] (1 Rəbiüləvvəl 11 h./27 May 632 m.)

### 1. Rəsulullahın (s.ə.s) Vəfatının Əshabi-Kiram Üzərindəki Təsiri

Rəsulullahın (s.ə.s) vəfat etdiyi dərhal eşidildi. Bu xəbər, əshabi-kiram üzərində dərin hüzn meydana gətirdi. Daha səhər ayağa qalxmış halda görmüşlər, yaxşılaşır deyə sevinmişdilər. Gözlənilməz acı xəbər, hər kəsi təşvişə saldı. Yola çıxmaq üçün hazırlanan Üsamə ordusu da ordugahdan döndü, komandirlik bayrağı Rəsulullahın (s.ə.s) qapısı önünə sancıldı. Hicrətdə Rəsulullahın (s.ə.s)  Mədinəyə girdiyi gün, ən böyük bayram sevinci yaşanmışdı. Bu gün ən böyük ağrılı bir matəm yaşanırdı. Münafiqlər isə, *"Məhəmməd haqq peyğəmbər olsaydı, ölməz idi..."* kimi həyasızca sözlər söyləmişlər, ortalığı bulandırmışdılar. Bu vəziyyətə əsəbiləşən Hz. Ömər, qılıncını çəkərək:

-Rəsulullah (s.ə.s) ölməmiş, huşunu itirmişdir. Kim Məhəmməd öldü desə, boynunu vuraram, deyirdi. Belə bir həngamədə mətanətini mühafizə ədəbilən

432. Buxari, V, 144; Kamil Miras, *e.a.ə.,* XI, 27 (Hədis No: 1669).
433. Buxari, V, 139-144; Kamil Miras, *e.a.ə.,* XI, 10-30 (Hədis No: 1663-1665-1668).
434. Kamil Miras, *e.a.ə.,* IX, 298 (Hədis No: 1442).

yalnız Hz. Əbu Bəkir oldu.[435] Acı xəbəri öyrənən Hz. Əbu Bəkir, kimsəyə bir şey söyləmədən, birbaşa qızı Hz. Aişənin otağına girdi. Rəsulullahın (s.ə.s) üzündəki örtünü qaldırdı, iki gözünün arasını hörmətlə öpüb ağladı.[436]

-Anam, atam sənə fəda olsun. Allahın sənə təqdir etdiyi ölüm keçidini keçdin. Lakin, Allah sənə ikinci bir ölüm daddırmayacaq, dedi. Sonra, ailəsini təsəlli edib ayrıldı.

Ömər xalqa hələ "Rəsulullah ölmədi, öldü deyənin boynunu uçuraram" deyə xitab edirdi. Hz Əbu Bəkir minbərə çıxdı. Xalq, Hz. Öməri buraxıb, Hz. Əbu Bəkrin ətrafında toplandı. Əbu Bəkir, Allah təalaya həmd və səna etdikdən sonra:

-Sizdən hər kim Məhəmmədə (s.ə.s) inanırsa, yaxşı bilsin ki, Məhəmməd (s.ə.s) öldü. Hər kim Allaha qulluq edirsə, yaxşı bilsin ki, Allah baqidir, əsla ölməz," dedi. Sonra bu mənadakı ayələri oxudu.

**"Məhəmməd ancaq bir peyğəmbərdir. Ondan əvvəl də peyğəmbərlər gəlib-getmişlər. Əgər o, ölsə və ya öldürülsə, siz gerimi dönəcəksiniz? (Dininizdən dönəcək və ya döyüşdən qaçacaqsınız?) Halbuki geri dönən şəxs Allaha heç bir zərər yetirməz. Lakin Allah şükür edənlərə mükafat verər."** (Ali-İmran, 3/144)

**"(Ya Peyğəmbər!) Şübhəsiz ki, sən də öləcəksən, onlar da öləcəklər!"** (Zumər, 39/30)

Səhabələr, o dərəcə qarışıqlıq içində idi ki, bu ayələri sanki əvvəldən heç eşitməmişlər, ilk dəfə Hz. Əbu Bəkrdən eşidirdilər. Hz. Əbu Bəkrin sözlərini və ayələri dinləyincə hər kəs özünə gəldi.[437] Bəli, peyğəmbər də olsa hər kəs öləcəkdi. Beləliklə, iki dünyanın sərvəri, peyğəmbərlərin sonuncusu Hz. Məhəmməd də (s.ə.s) ölmüşdü.

Hz. Əbu Bəkri dinlədikdən sonra, səhabələrin həyəcanı sakinləşdi. Eyni gün Bəni Səidə məhəlləsində toplandılar. Hz. Əbu Bəkri xəlifə seçdilər. (1 Rəbbiuləvvəl 11 h. / 27 May 632 m.)

---

435. İbn Hişam, *e.a.ə.,* IV, 305; Kamil Miras, *e.a.ə.,* XI, 30-31.
436. Mehmet Raif, *Muhtasar Şəmail-i Şərif,* s. 266, İstanbul 1304.
437. Buxari, V, 142-143; Kamil Miras, *e.a.ə.,* XI, 31-32; İbn Hişam, *e.a.ə.,* IV, 306.

**2. Rəsulullahın (s.ə.s) Dəfni**

Rəsulullahın (s.ə.s) cənazəsi, xəlifə seçkisi edildikdən sonra, çərşənbə axşamı yuyulub hazırlandı. Bu vəzifəni ən yaxın qohumu etdi. Son xidmətində ola bilmək istəyən hər kəs, Hz. Aişənin otağı qarşısında toplanmışdı. Buna görə Hz. Əli otağının qapısını bağladı, içəriyə kimsəni almadı. Yalnız ənsar adına Bədir mücahidlərindən Evs b. Havli içəri alındı.

Rəsuli-Əkrəmin (s.ə.s) mübarək bədəni, bir sidr üzərinə qoyuldu. Üst geyimi çıxarıldı. Yuma işini Hz. Əli etdi. Əmisi Abbas ilə oğulları Abdullah, Fazl və Kusəm cəsədin çevrilməsinə köməkçi oldular. Üsamə ilə azadlı köləsi Şükran da su tökdülər. Alt paltarı çıxarılmayıb bədəni üzərindən ovulduğu üçün Hz. Əlinin əli Rəsulullahın (s.ə.s) mübarək bədəninə toxunmamışdır.[438]

Cənazələrdə ümumiyyətlə görülən qoxu və naxoş şeylərdən heç biri onda yox idi. Buna görə Hz. Əli:

-Həyatın kimi, ölümün də gözəldir, deyərək yudu. Sonra üç parça ağ pambıq bezi ilə kəfənləyib otağının qapısı açdı.[439]

Rəsulullahın (s.ə.s) mübarək cəsədi, sidrin üzərinə qoyulmuşdu. Əvvəl kişilər, sonra qadınlar, ən sonra da uşaqlar ayrı-ayrı cənazə namazını qıldılar. Rəsulullah (s.ə.s) həyatında olduğu kimi ölümündən sonra da hər kəsin imamı olduğu üçün, onun cənazə namazında kimsə imam olmadı. Hz Aişənin otağı kiçik idi. Buna görə namaz, gecə yarısına qədər davam etdi.

Rəsulullah (s.ə.s) Əfəndimiz: *"Allah təala, peyğəmbərlərin ruhunu, onların dəfn edilməsini istədiyi yerdə alar,"* buyurmuşdu.[440] Bu səbəblə Rəsulullahın (s.ə.s) qəbri, Hz Aişənin otağında, üzərində son nəfəsini verdiyi döşəyin sərildiyi yerdə, ənsardan Əbu Talha tərəfindən qazıldı. Çərşənbə gününü çərşənbəyə bağlayan gecə yarısı dəfn edildi. (2/3 Rəbbiüləvvəl 11 h.28/29 May 632 m.) Mübarək cəsədini, qəbri səadətə Hz. Əli, Fazl, Üsamə və Əbdürrəhman b. Avf endirdilər. Hz. Aişə:

-Biz Rəsulullahın (s.ə.s) dəfn edildiyini, çərşənbə günü gecə yarısı eşitdiyimiz kürək səslərindən anladıq, demişdir.[441]

---

438. İbn Hişam, *e.a.ə.,* IV, 312-313.
439. Buxari, II, 75; Kamil Miras, *e.a.ə.,* IV, 422 (Hədis No: 627).
440. İbn Hişam, *e.a.ə.,* IV, 314; İbn Kəsir *e.a.ə.*, V, 266.
441. İbn Hişam, *e.a.ə.,* IV, 314.

**3. Rəsulullahın (s.ə.s) Mirası**

Peyğəmbər (s.ə.s) əfəndimiz, həyatı boyunca son dərəcə sadə yaşamışdır. Əlinə keçən hər şeyi dərhal yoxsullara paylamış, gündəlik ehtiyacı xaricində heç bir mal əldə saxlamamışdır.[442] Bu səbəblə, vəfatında mirasçıları tərəfindən paylaşılacaq heç bir şey buraxmamışdır,[443] Rəsuli-Əkrəmin (s.ə.s) xanımlarından Hz. Cüveyriyənin qardaşı Əmr b. Haris:

-Rəsulullah (s.ə.s) vəfatında nə bir dirhəm gümüş, nə bir misqal qızıl , nə bir kölə, nə də başqa bir şey buraxdı. Yalnız (Misir Mukavkısının hədiyyə göndərdiyi) ağ bir əstər ilə silahını və bir də (sağlığında) vəqfetdiyi (Fədək və Xeybərdəki) ərazini buraxdı, demişdir.[444]

Rəsuli-Əkrəm də (s.ə.s):

-*"Vəfatımda varislərim nə misqal, nə də dirhəm paylaşacaq. Buraxdığım (ərazinin) yoldaşlarının mehri və işçinin ödənişindən geri qalan miras vəqfdir"* buyurmuşdur.[445]

Qurani-Kərimdə, kafirlərdən döyüş sonunda əldə edilən qənimət malların beşdə biri ilə, döyüş edilmədən razılaşma yolu ilə alınan "fey" malların istifadəsinin Rəsulullaha (s.ə.s) aid olduğu bəyan edilmişdir.[446] Bu səbəblə, döyüş edilmədən alınan Bəni Nadir və Fədək ərazisinin hamısı ilə döyüş nəticəsində əldə edilən Bəni Kurayza və Xeybər ərazisinin beşdə biri, Rəsuli-Əkrəmin (s.ə.s)- əmrinə verilmişdi.[447]

---

442. Bir səfər dönüşündə, Uhud Dağı qarşıdan görülüncə: *"Uhud Dağı mənim üçün çevrilib tamamilə qızıl olsa, tək bir dinardan artığını üç gündən çox məndə qalmasını istəməzdim, dərhal paylayardım. Bir dinarı da ancaq borcum üçün saxlayardım buyurmuşdur"*. Bax: Buxari, III, 82, VII, 178, VIII, 128; Müslim, II, 687 (Hədis No: 991); Kamil Miras, *e.a.ə.,* VII, 376 (Hədis No: 1075). Yoxsullara payladıqdan sonra, bir neçə qızıl əlində qalmış, bunları Hz. Aişəyə əmanət etmişdi. Xəstələndikdə Hz. Əliyə paylatdırdıqdan sonra: *"İndi içim fərahladı, əgər Rəbbinə bu qızıllar yanında ikən qovuşsaydı, Məhəmmədin halı necə olardı?"* buyurmuşdu. bax: Mahmud Esad Efendi, *e.a.ə.,* III, 560.
443. Satın aldığı arpa borcu üçün vəfat etdiyində Rəsulullahın (s.ə.s) zirehi girovda idi. (Buxari, V, 145).
444. Buxari, III, 186 və 144; Kamil Miras, *e.a.ə.,* VIII, 235 (Hədis No: 1167).
445. Buxari, III, 169; Kamil Miras, *e.a.ə.,* VIII, 273 (Hədis No: 1173).
446. Ənfal, 8/40 və Həşr, 59/6.
447. Kamil Miras, *e.a.ə.,* VIII, 274.

Rəsuli-Əkrəm (s.ə.s) Əfəndimiz:

*"Biz peyğəmbərlər miras buraxmarıq, buraxdığımız hər mal sədəqədir, vəqfdir,"* buyurmuşdu.[448] Bu səbəblə bu torpaqlar, Rəsulullahın (s.ə.s) vəfatından sonra mirasçıları arasında paylaşdırılmadı. Hər birinə, Rəsulullah (s.ə.s) həyatda ikən etdiyi kimi, gəlirlərindən hissə verildi. Rəsulullah (s.ə.s)-ın varisləri qızı Hz. Fatimə ilə əmisi Hz. Abbas və həyatda olan arvadları idi.

### G. Rəsuli-Əkrəmin (s.ə.s) Üstün Əxlaqı

*"Allahım məni əxlaqın ən gözəlinə yönəlt. Pis əxlaqdan uzaqlaşdır".*[449]

Rəsulullah (s.ə.s) əfəndimiz, simaca insanların ən gözəli, əxlaq cəhətdən də insanların ən üstünü idi.[450] *"Sizin ən xeyirliniz, əxlaqca ən üstün olanınızdır."*[451] *"Mən ancaq gözəl əxlaqı tamamlamaq üçün göndərildim".* buyurmuşdu.[452] Necə ki Qurani-Kərimdə **"Şübhəsiz ki, sən böyük bir əxlaq üzərindəsən!"**(Nun, 24/4), buyurulmuşdur.

Rəsulullahın (s.ə.s) yaşayışı, Qurani-Kərimin sanki canlı bir təzahürü idi. Yoldaşı Hz. Aişədən Rəsulullahın (s.ə.s) əxlaqı soruşulunca:

-"Siz Qurani-Kərim oxumursunuzmu? Onun əxlaqı Qurandan ibarət idi" deyə cavab vermişdi.[453] Çünki, onun yaşayışı və bütün davranışları Qurani-Kərimin insanlara göstərdiyi hidayət yolunun tətbiq olunması idi. Necə ki, yalnız sözləriylə deyil, yaşayışı, hərəkət və davranışlarıyla da uyulması lazım olan ən gözəl nümunə olduğunu Uca Kitabımız Qurani-Kərim bəyan etməkdədir: **"Həqiqətən, Allahın Rəsulu Allaha, qiyamət gününə ümid bəsləyənlər (Allahdan, qiyamət günündən qorxanlar) və Allahı çox zikr edənlər üçün gözəl örnəkdir!".** (Əhzab, 33/21)

---

448. Buxari, IV, 42-43, V, 23-25; Kamil Miras, *e.a.ə.,* VIII, 498 və X, 177 (Hədis No: 1288 və 1577).
449. Müslim, I, 535 (Hədis No: 771).
450. Buxari, IV, 1819 (Hədis No: 2337); Kamil Miras, *e.a.ə.,* IX, 311 (Hədis No:1449).
451. Buxari, IV, 166; Müslim IV, 1810 (Hədis No: 2321); Kamil Miras, *e.a.ə.,* IX, 318 (Hədis No:1456).
452. Malik, *e.a.ə.,* II, 904.
453. Müslim, I, 514 (Hədis No: 746).

Rəsuli-Əkrəm (s.ə.s) gülər üzlü, nazik təbiətli, incə və həssas ruhlu idi. Daş ürəkli, sərt və incidici deyildi. Ağzından sərt və kobud heç bir söz çıxmazdı. Qurani-Kərimdə bu mövzuda: **"(Ya Rəsulum!) Allahın mərhəməti səbəbinə sən onlarla (döyüşdən qaçıb sonra yanına qayıdanlarla) yumşaq rəftar etdin. Əgər qaba, sərt ürəkli olsaydın, əlbəttə, onlar sənin ətrafından dağılıb gedərdilər. Artıq sən onları əfv et, onlar üçün (Allahdan) bağışlanmaq dilə, işdə onlarla məsləhətləş, qəti qərara gəldikdə isə Allaha təvəkkül et! Həqiqətən Allah (Ona) təvəkkül edənləri sevər!"**(Ali-İmran, 3/159) buyurulmaqdadır.

Rəsulullah (s.ə.s) başqalarını tənqid etməz, kimsənin ayıbını üzünə vurmazdı.[454] Səhv və xoşlanmadığı bir davranış görsə, "içinizdən bəzi kəslər, belə belə edirlər..." şəklində, bu davranışları edənlərin kim olduqlarını bildirmədən və heç kimi üzmədən səhvlərini düzəldərdi.[455] Kimsənin sözünü kəsməz, danışması bitənə qədər dinləyərdi. Mübahisəni sevməz, sözü gərəyindən çox uzatmazdı. Özünü maraqlandırmayan şeylərlə məşğul olmaz və kimsənin gizli hallarını araşdırmazdı. Allaha hörmətsizlik olmadıqca, şəxsinə edilən pislikləri nə qədər böyük olursa olsun bağışlayar, əlinə imkan düşüncə qisas almağı düşünməzdi. Ancaq, Allahın qadağanlarını tapdalayanlara layiq olduqları cəzanı verərdi.[456] Necə ki, Məkkənin fəth edildiyi gün, daha əvvəl özünə hər cür pisliyi və təhqiri rəva görən Məkkə müşriklərinə:

**-"(Yusif) dedi: "Bu gün sizə (etdiklərinizə görə) heç bir məzəmmət yoxdur. Allah sizi bağışlasın! Çünki O, rəhm edələrin ən rəhmlisidir! (Mən Allahdan sizin bağışlanmanızı diləyərəm. O da sizi bağışlayar!)"** (Yusif,12/92) sərbəstsiniz deyərək hamısını bağışlamışdı.[457]

*"Həya imandandır"*[458]*, "Həya ancaq xeyr gətirər"* buyurmuşdur.[459] Bir şeydən xoşlanmadığı zaman açıqca söyləməz, bu vəziyyət üzündən aydın

---

454. Buxari, IV, 167; Kamil Miras, *e.a.ə.,* IV, 321 (Hədis No: 1460).
455. Əbu Davud, II, 550.
456. Buxari, IV, 166; Müslim, IV, 1813 (Hədis No: 2327); Əbu Davud, I, 550; Kamil Miras, *e.a.ə.,* IX, 319 (Hədis No: 1457).
457. İbn Hişam, *e.a.ə.,* IV, 54; İbnu'l Əsir, *e.a.ə.,* II, 252; İbn Qayyim, *e.a.ə.,* II, 394; Kamil Miras, *e.a.ə.,* X, 340-341.
458. Buxari, I, 11; Kamil Miras, *e.a.ə.,* I, 32 (Hədis No: 23).
459. Buxari VII, 100; Kamil Miras, *e.a.ə.,* XII, 163 (Hədis No: 2001).

olardı.[460] Heç bir yeməyi bəyənməzlik etməz, arzu etməsə yeməzdi.[461] Əlini yumadan və "Bəsmələ" çəkmədən yeməyə başlamaz və Allaha həmd etmədən də süfrədən qalxmazdı.

Bütün insanları bərabər yaşamaq, zəngin-kasıb, əfəndi-kölə, böyük-kiçik ayrı-seçkiliyi etməzdi. Məkkənin fəthi əsnasında Fatimə adlı bir qadın oğurluq etmiş, soylu bir ailədən olduğu üçün bu qadına cəza verilməməsi istənilmişdi. Bu hadisə ilə əlaqədar xütbəsində Rəsuli-Əkrəm:

*"Sizdən əvvəlki ümmətlərin həlak edilmələri ancaq bu səbəblədir: Onlar, içlərindən zəngin və soylu bir kimsə oğurluq etdiyi zaman onu buraxarlar, kasıb və zəif bir kimsə oğurladığında isə ona cəza verərdilər. Allaha and içirəm ki, Məhəmmədin (s.ə.s) qızı Fatimə də oğurlamış olsaydı, şübhəsiz əlini kəsər, cəzasız buraxmazdım"* buyurdu.[462]

Hər baxımdan etibarlı idi. Verdiyi sözü mütləq zamanında yerinə yetirərdi. Dürüstlükdən ayrıldığı, zarafat belə olsa yalan danışdığı heç görülməmişdir. Buna görə ona hələ Peyğəmbər olmadan *"Məhəmmədul-əmin"* deyilmişdi. Necə ki, Peyğəmbərliyini elan etdiyi zaman, iman etməyənlər belə ona *"yalançı, yalan danışır"*, deyə bilməmişdir.[463] Ən yaxın qohumlarını Səfa təpəsinə yığıb onları islama dəvət üçün, "Sizə bu dağın arxasında düşmən atlılarının olduğunu söyləsəm, mənə inanarsınızmı?" dediyi zaman: "Hamımız inanarıq, çünki Sən yalan danışmazsan" deyə cavab vermişdilər.[464] Özü belə olduğu kimi, hər kəsin dürüst olmasını istəyərdi. *"Düzgünlükdən ayrılmayın, çünki düzgünlük, yaxşılıq və xeyirə aparar. Yaxşılıq və xeyr də, adamı cənnətə çatdırar. Adam doğru söyləyib doğruluğu axtardıqca, Allah qatında sıddıqlar zümrəsinə yazılar. Yalan sözdən və yalançılıqdan çəkinin. Çünki yalan insanı pisliyə sövqedər. Pislik də adamı cəhənnəmə aparar. İnsan yalan danışmağa və yalanı axtarmağa davam edə-edə, Allah qatında nəhayət yalançı yazılar"*, buyurmuşdur.[465]

---

460. Buxari IV, 167; Kamil Miras, *e.a.ə.,* IX, 321 (Hədis No: 1460).
461. Buxari IV, 167; Kamil Miras, *e.a.ə.,* IX, 321 (Hədis No: 1461).
462. Buxari, V, 97 və VIII, 16.
463. Ənam, 6/33.
464. Kamil Miras, *e.a.ə.,* IX, 285.
465. Buxari, VII, 95; Müslim, IV, 2013 (Hədis No: 2607); Əbu Davud, II, 593; Tirmizi IV, 347 (Hədis No: 1971).

Rəsulullah (s.ə.s) insanların ən cömərdi və ən kərimi idi.[466] Əlinə keçən hər şeyi möhtaclara paylayar, kimsəni əli boş geri çevirməzdi.[467] *"Mən ancaq paylayıcıyam, verən Allahdır"*, deyər,[468] ehtiyacından çox bir şeyin özündə və ya evində olmasını istəməzdi. *"Uhud dağı qızıla çevrilib də mənim olsa, borcum üçün ayıracaqlarım müstəsna, ondan tək bir dinarın belə üç gecədən çox yanımda qalmasını istəməzdim"* buyurmuşdur.[469]

Son dərəcə alicənab və təvazökar idi. Bir məclisə gəldiyində, onun üçün ayağa qalxılmasını istəməz, haranı boş tapsa, oraya oturardı. Yoldaşları arasında oturarkən ayaqlarını uzatmazdı. Yoldaşları hər işini etməyi özləri üçün şərəf bildikləri halda, bütün işlərini öz görər, ev işlərində xanımlarına kömək edərdi.[470] Mədh edilməsini və həddindən artıq hörmət göstərilməsini istəməz, *"Xristianların Məryəm oğlu İsaya etdikləri kimi etməyin. Mən yalnız Allahın elçisi və quluyam"* deyərdi.[471] Kasıb şəxslərlə oturub-durmaqdan, yoxsulların, dulların, kimsəsizlərin işlərini görməkdən zövq alardı. Tapdığını yeyər və geyər, heç bir şeyə bəyənməməzlik etməzdi.[472] Yeməyə bir şey tapa bilməyib ac yatdığı belə olardı.

Bütün işlərini tam bir nizam və intizam içində edərdi. Namaz və ibadət vaxtları, yuxu və istirahət üçün ayırdığı saatlar, qonaq və ziyarətçilərini qəbul edəcəyi vaxtlar həmişə müəyyən idi. Vaxtını boş keçirməz, hər anını faydalı bir işlə qiymətləndirərdi. *"İnsanların çoxu iki nemətin qiymətini bilməkdə aldanmışdırlar: Səhhət və boş vaxt"*, buyurmuşdur.[473]

İnsanı ən yaxından tanıyan, onun iç üzünü və bütün gizli hallarını ən yaxşı bilən, şübhə yoxdur ki, yoldaşıdır. Rəsuli-Əkrəm (s.ə.s), ilk vəhydən sonra gördüklərini izah etdiyi zaman yoldaşı Hz. Xədicə tərəfindən:

---

466. Buxari, IV, 167; Müslim, IV, 1802 (Hədis No: 2307).
467. Müslim, IV, 1805 (Hədis No: 2311).
468. Buxari, I, 26; Müslim, II, 719 (Hədis No: 1037).
469. Buxari, III, 82; Kamil Miras, *e.a.ə.,* VII, 376 (Hədis No: 1075); *Riyazü's-Salihin*, I, 501-503 (Hədis No: 467-468).
470. Buxari, I, 64–193; Tirmizi, IV, 654 (Hədis No: 2489).
471. Buxari, IV, 142; Kamil Miras, *e.a.ə.,* IX, 213 (Hədis No: 1405).
472. Buxari, IV, 167.
473. Buxari, V, 170; Tirmizi, IV, 550 (Hədis No: 2304).

-“Allaha and içirəm ki, Allah təala heç bir vaxt səni utandırmaz. Çünki, sən qohumu qoruyur, işini görməkdən aciz şəxslərin işlərinə kömək edir, kasıba verir, kimsənin qazandıra bilməyəcəyini qazandırırsan. Qonağı qarşılayır, Haqq yolunda hər kəsə kömək edirsən...” deyərək[474] onun Peyğəmbərliyini dərhal qəbul etmiş, ən kiçik tərəddüd belə göstərməmişdir.

Uşaqlığından etibarən 10 il xidmətində olan Hz. Ənəs:

-Rəsulullaha (s.ə.s) 10 il xidmət etdim. Bir dəfə belə canı sıxılıb, nə üçün bunu belə etdin, niyə bunu belə etmədin, deyə məni danlamadı”, demişdir.[475]

474. Buxari, I, 3; Kamil Miras, *e.a.ə.,* I, 3-10 (Hədis No :3).
475. Buxari, VII, 82; Müslim, IV, 1084 (Hədis No: 2309); Kamil Miras, *e.a.ə.,* XII, 148 (Hədis No: 1987).

## İSTİFADƏ OLUNMUŞ ƏDƏBİYYAT


**Abdurrahman Şərəf,** *Zübdetül-Kısas*, İstanbul 1315.

**Acluni,** *Kəşfül-Xafa*, Beyrut 1351, I-V.

**Ayni,** *Umdətül-Qari*, I-VIII.

**Buxari,** Əbu Abdullah Məhəmməd b. İsmayıl (v. 256/870), *əl-Camius-səhih*, İstanbul 1315 h, I-III.

**Beyhəqi,** *əs-Sünənül Kübra,* Haydarabad 1352.

**Əbu Davud,** Süleyman b. Əşas əs-Sicistani, (v. 275/888), *əs-Sünən,* Misir, 1371/1952, I-XII.

**Əhməd b. Hənbəl,** *Müsnəd,* Misir 1313, I-V.

**İbn Xaldun,** *Müqəddimə,* tərc., Zakir Kadiri Ugan, İstanbul 1991, I-II.

**İmam Zəhəbi,** Tarixul-İslam, Cantaş Yayınları.

**İbnu'l-Əsir,** Əli b. Məhəmməd əş-Şeybani (v. 630/1232), *əl-Kamil fit-tarix*, Beyrut, 1385/1965, I-XII.

**İbn Sad,** Əbu Abdullah Məhəmməd (v.230/844), *ət-Tabakatül-Kübra*, Beyrut, 1398/1978, I-VIII.

**İbn Hişam,** Əbdülməlik (v. 218/834), *əs-Siyrətün Nəbəviyyə*, Beyrut 1391/1971, I-IV.

**İbn Kəsir,** Ebul-Fida İsmayıl b. Ömər, (v. 774/1373), *el-Bidayə vən-Nihayə*, Beyrut, 1966, I-XIV.

**İbn Həcər əl-Əsqəlani,** *el-İsabe fî temyizis-sahabe*, Qahirə 1972, I-IV.

**İbn Əbdil-Bərr,** *əl-İstiab*, Qahirə 1960.

**İmam Nəvəvi,** *Riyazüs-salihin*, Beyrut, 1990.

**İbn Qayyim,** Məhəmməd b. Əbu Bəkir, (v. 751/1350), *Zadül-məad,* Qahirə, 1373/1953, I-IV.

**Jon Davenport,** *Hz. Muhammed ve Kuran-ı Kerim*, tərc., Ömer Rıza Doğrul, İstanbul 1345/1926.

**Kamil Miras,** *Təcrid-i Sərih Tərcüməsi*, (ilk üç cildi Ahmet Naim tərəfindən hazırlanmışdır.) İstanbul, 1928–1948, I-XII.

**Mahmud Esad Efendi,** (v.1336/1917), *Tarih-i Din-i İslam,* , İstanbul 1319–1329, I-III.

**Müslim,** Əbul-Hüseyin Müslim b. el-Haccac b. Müslim el-Quşeyri, (v.

261/875), *əl-Camius-səhih*, Qahirə, 1374-1375/1954-1955 m., I-V.
**Mansur Ali Nasıf,** *et-Tacul-Cami-ili-Usul fi Əhadisur-Rusul*, Qahirə, 1382/1962, I-IV.
**Məhəmməd Həmidullah,** *İslam Peyğəmbəri*, (tərc., Said Mutlu ve Salih Tuğ), İstanbul 1385-1388/1966-1969, I-II.
**Mehmed Zihni Efendi,** *Kitabüs-Salat*, İstanbul 1326, I-II.
**Muhammed Hamdi Yazır,** (Elmalı Hamdi Efendi, v. 1358/1942), *Hak Dini Kuran Dili*, İstanbul 1935–1939, I-IX.
**Malik b. Ənəs,** *əl-Müvəttə*, Misir 1371/1951, I-VII.
**Mehmet Raif,** *Muhtasar Şəmail-i Şərif*, İstanbul 1304.
**Şibli,** Mevlana və Süleyman Nedvi, *Əsr-i Səadət,* (tərc., Ömer Rıza Doğrul) İstanbul, 1346-1353 h./1928-1935 m., I-X.
**____,** *əl-Vəsaikus-Siyasiyyə*, Beyrut 1405/1985.
Şerafettin Yaltkaya, *Hatiplik ve Hutbeler,* İstanbul 1946.
**_______________,** *əl-Hakayik mimma fil-Camiis-sagir vəl-məşarik*, İstanbul 1311, I-II.
**Tirmizi,** Məhəmməd b. İsa Sərvər (v. 279/892), *es-Sünən,* Qahirə, 1385/1965, I-III.
**Wensinck A.J.,**“Nəcaşi”, İslam Ensklopediyası, IX, 153, İstanbul, 1993.